DOI: https://www.doi.org/10.36719/2663-4619/65/6-11

**Ələsgər Məhərrəm oğlu Əliyev**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
Professor
alesker.meherrem@gmail.com
**Emil Naib oğlu Tahirzadə**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
magistrant
emiltahirzade@gmail.com

# KLASSİK QAZMA BUCURQADLARININ ƏYLƏC SİSTEMLƏRİNİN TƏHLİLİ

***Açar sözlər***: *lentli-kündəli əyləc, hidrodinamiki əyləc, elektromaqnit əyləc, elektromaqnitli ferro-tozlu əyləclər*

## Analysis of braking systems of classic drilling

**Summary**

The lowering and lifting of the drill strings during drilling is carried out using winches. One of the main elements of the winches is the braking system. The braking system of the drawworks is designed for: keeping the drill string suspended; power absorption during the descent of the string to the length of one candle with the highest permissible speed and complete braking at the end of the descent; smooth feed of the drill string as the well deepens while drilling. Braking devices used in drilling machines and mechanisms are divided into main and auxiliary ones according to their purpose.The main ones are designed to stop machines and mechanisms and are activated at the end of the movement with long interruptions in work, while auxiliary ones are for long-term braking in order to reduce the speed of movement. The brakes of classic drill bits consist of a main working belt-molded brake, as well as an auxiliary brake consisting of electromagnetic or hydrodynamic brakes.

***Key words:*** *belt-molded brake, hydrodynamic brake, electromagnetic brake, electromagnetic ferro-dust brakes*

## Giriş

Qazma bucurqadının təyinatı qazma borularının qaldırılıb-endirilməsi, asılı halda saxlanılması, qazma davam etdikcə boruların bir-bir əlavə olunması, qoruyucu kəmərlərin endirilməsi, qazma zamanı qazma baltasının əllə və ya avtomatik verişinin tənzimlənməsi üçün qaldırma-endirmə işlərinin həyata keçirilməsi və digər köməkçi işlərin həyata keçirilməsindən ibarətdir.

Hal-hazırda qazma bucurqadlarının iki fərqli əsas konstruksiyası mövcuddur:

- Baş işçi iki lentli-kündəli əyləclə təchiz olunmuş klassik qazma bucurqadları;
- Elektrodinamiki əyləcli və pnevmatik intiqallı baş işçi diskli əyləcli qazma bucurqadları. Klassik icralı qazma bucurqadlarının əyləc sistemləri baş işçi lentli-kündəli əyləc, eləcə də elektromaqnitli, yaxud da hidrodinamiki əyləcdən ibarət köməkçi əyləctormo. (1) **Əsas işçi əyləclar: lentli-kündəli əyləclər.** Şəkil 1-də klassik icralı qazma bucurqadının lentli-kündəli əyləcinin prinsipial sxemi göstərilmişdir. Retinaksdan hazırlanmış 2 əyləc kündələri ilə təchiz edilmiş iki ədəd 7 əyləc lentləri bucurqadın barabanının əyləc qasnaqlarını əhatə edir. Lentlərin tərpənməz ucları 8 dartqıları vasitəsilə barabanın önündə bucurqadın çərçivəsinə bərkidilmiş 10 tirində quraşdırılmış 9 balansirinə bağlanır, digər hərəkətli ucları isə ling sistemləri vasitəsilə 3 əyləc valına birləşdirilib.




Şəkil 1. Lentli-kündəli əyləcin sxemi:
*1 – əyləc lingi; 2 – əyləc kündələri; 3 – əyləc valı; 4 – pnevmatik silindr; 5 – ştok; 6 – dirsəkli val; 7 – əyləc lentləri; 8 – dartqı; 9 – balansir; 10 – dayaq*

Qazmaçı tərəfindən yaradılan əyləmə qüvvəsinin artırılması üçün əyləc valına 4 pnevmatik silindri birləşdirilir. Əyləc linginin döndərilməsi zamanı "Kazantsev əyləc sistemi" maşinist kranın tənzimləmə vinti fırlanır və lingin dönmə bucağına uyğun olan təzyiqlə hava krandan pnevmatik silindrə daxil olur. Pnevmatik silindrin pistonu hərəkətə gələrək əyləc kündələrini bucurqadın əyləc qasnaqlarına sıxaraq 6 dirsəkli valına birləşdirilmiş 5 ştoku vasitəsilə onu döndərir. Bəzi bucurqadlarda (məsələn, ЛБУ-1200К) əyləmə qüvvəsi linglər sistemi və dişli sektor ötürməsi ilə artırılır. (1)

Əgər barabanı dayandırmaq və ya onun fırlanma sürətini azaltmaq lazım gələrsə qazmaçı 1 əyləc lingini qazma platformasına doğru hərəkətə gətirir. Bu zaman liglər sistemi ilə 3 əyləc valının boyuncuqlarına birləşdirilmiş lentlərin hərəkətli ucları dartılır və onların daxili səthlərinə bərkidilmiş kündələr barabanın qasnaqlarını əhatə edərək onu əyləyir.

Əyləmə prosesi kündələrin əyləc qasnağına sürtünməsi hesabına baş verdiyinə görə böyük istilik ayrılır, bu səbəbdən də kündələr və əyləc qasnaqları əyləmə zamanı yeyilməyə və 800 $^0$C temperatura qədər qızmaya məruz qalır. Buna görə də bucurqadın bu detallarına yüksək texniki tələblər qoyulur. Əyləc qasnaqları yüksək legirlənmiş termiki emal edilmiş poladlardan hazırlanır. Qəza hallarından yayınmaq üçün əyləc qasnaqlarının işləməsini diqqətlə izləmək lazımdır: qasnaqların səthində eni 0,2...0,5 mm, uzunluğu isə 50 mm-dən artıq olan çatların yaranması zamanı onları mütləq şəkildə dəyişmək lazımdır. Qasnaqların səthindəki çatların qaynaq edilməsi yol verilməzdir. (3)

**Köməkçi tənzimləyici əyləclər: hidrodinamiki əyləclər.** Tənzimləyici əyləc qurğuları kimi daha çox hidrodinamiki və qapalı mayeli soyutma sisteminə malik elektromaqnitli əyləclərdən istifadə edilir. Onlar bucurqadın qaldırıcı valına yumrucuqlu ilişmə muftaları və ya həlqəvi-pnevmatik muftalar vasitəsilə biləşdirilir. Elektromaqnitli əyləclərin birləşdirilməsi üçün stasionar hərəkətli muftalardan istifadə edilə bilər.

Tənzimləyici əyləclərin təyinatı quyunun dərinliyinin və qazma borularının çəkisinin artması ilə əlaqədar olaraq qaldırma-endirmə əməliyyatları zamanı qazmaçının lentli-kündəli əyləcin linginə daha böyük qüvvə tətbiq etməsini tələb etdiyindən, onun əməyini yüngülləşdirmək üçün nəzərdə tutulmuşdur. Tənzimləyici əyləclər qazma və qoruyucu boruların endirilməsi sürətini avtomatik olaraq tənzimləyir və məhdudlaşdırır. Bu zaman ayrılan enerjinin bir hissəsi istiliyə çevrilir.

**Hidrodinamiki əyləc.** Şəkil 2-də hidrodinamiki əyləcin hidro-kinematik sxemi göstərilmişdir.




Şəkil 2. Hidrodinamiki əyləcun hidro-kinematik sxemi:
*1 – əyləcin statoru; 2 – statorun qabırğası; 4 – qaldırıcı val; 4 – yumrucuqlu və ya həlqəvi-pnevmatik mufta; 6 – rotorun qabırğası; 7 – soyuducu; 8 – kran*

Boru kəmərinin endirilməsi zamanı əyləcin statorunda və rotorunda mayenin dövranı baş verir. Bucurqadın barabanında yaradılan qüvvənin bir hissəsi rotorun pərləri ilə əyləcin daxilində dövranın yaradılması üçün hidravlik əyləc tərəfindən udulur. Bu zaman işçi maye qismində istifadə edilən suyun temperaturu artır.

Ağır boru kəmərinin uzunmüddətli endirilməsi prosesi və ətraf mühitin yüksək temperaturunda soyuducu qurğu kifayət qədər istilik mübadiləsini təmin etməyə bilər, bu da soyutma sistemində suyun temperaturunun yol verilməz həddə qədər qızması ilə nəticələnir. Hidravlik əyləcdə suyun temperaturu 100 $^{0}$C-ə çatdıqda isə yaranan buxar işçi mühitdən suyu sıxışdırıb çıxarar və bu da əyləcləmə momentini kəskin azaldır. Suyun qızmasının qarşısını almaq üçün əyləcdə ventil sistemindən soyuq su ilə qidalanan ikinci dövran sistemi də nəzərdə tutulur. Bu zaman soyuducudaki izafi maye axıdıcı borular vasitəsilə kənarlaşdırılacaq.

Hidrodinamiki əyləclər bir və iki sıralı olmaqla hazırlanır və aşağıdakı çatışmamazlıqlara malik olur:

1) Rotorun fırlanma tezliyinin azalması zamanı əyləmə momentinin kəskin aşağı düşməsi;
2) İşlək vəziyyətdə olduqda əyləmə momentinin tənzimlənməsinin mümkün olmaması.

**Köməkçi tənzimləyici əyləclər: elektromaqnitli əyləclər.** Köməkçi tənzimləyici elektromaqnitli əyləclərın yalnız stator və rotor arasındakı araboşluğundakı işçi mühitlərinə görə fərqlənən elektromaqnitli və elektromaqnit ferro-tozlu əyləclər kimi iki növü var. (2)

Elektromaqnitli əyləc dinamiki əyləmə rejimində işləyən elektrik maşınıdır. Elektromaqnitli əyləc qurğusu aşağıdakı hissələrdən ibarət olur:

- sabit cərəyan generatoru;
- idarəetmə məntəqəsi;
- əyləmə müqavimətləri;
- komandokontroller;
- idarəetmə düyməsi.

Şəkil 3-də həyəcanlanma sarğıları olan iki ədəd 1 statorlarında fırlanan yüngül 3 T-şəkilli rotordan ibarət elektromaqnitli əyləcin en kəsiyi göstərilmişdir.

Əyləmə momenti həyəcanlanma dolaqlarında sabit cərəyanın dəyişdirilməsi yolu ilə maqnit selinin sıxlığının idarəedilməsi vasitəsilə tənzimlənir. Fərqli idarəetmə sxemləri müxtəlif əyləmə rejimlərini, məsələn, böyük yaxud kiçik fırlanma tezliklərində maksimal burucu moment əldə etməyə imkan verir.

Ayrılan istilik statorun bütün boşluğunu dolduran və rotordan keçən su ilə kifayət qədər yaxşı şəkildə soyudulur. Statorun boşluğuna su A və Б boruları ilə gəlir və buradan B borusu vasitəsilə axıdılaraq kənarlaşdırılır.




Şəkil 3. Tənzimləyici elektromaqnitli əyləc:
*1 – maqnitli stator; 2 – gövdə; 3 – rotor; 4 – həyəcanlanma dolağı; 5 – yastıq; 6 – val.*

Bu əyləclər boş elevatorun qaldırılması zamanı bucurqadın valından ayrılması tələb olunmayan kiçik ətalət momentli rotora malik olur. Buna görə də elektrodinamiki əyləcin rotorunun bucurqadın valı ilə birləşdirilməsi üçün adətən stasionar hərəkətli dişli muftalardan istifadə edilir. (4)

Elektromaqnitli ferro-tozlu əyləclər elektromaqnitli əyləclərdən rotor və elektromaqnitin silindrik səthləri arasındakı boşluğun hissəciklərinin ölçüsü 40...200 mkm-ə qədər olan ferro-tozla doldurulması ilə fərqlənir.

Ferromaqnitli toz rotor və stator arasındakı boşluğun maqnit keçiriciliyini artırmağa imkan verir, bunun da nəticəsində demək olar ki, fırlanma tezliyindən asılı olamayan, yalnız stator makarasında həyəcanlanma cərəyanından asılı olan və səlis formada sıfırdan maksimuma qədər dəyişdirilə bilən böyük əyləmə qüvvəsi yaranır.

Şəkil 4-də ТЭП markalı tənzimləyici elektromaqnitli ferro-tozlu əyləc göstərilmişdir. (3)

Belə əyləcdə böyük əyləmə momenti hesabına bucurqadın barabanı tam dayanana qədər əylənə bilər. Bu isə ТЭП markalı tənzimləyici elektromaqnitli ferro-tozlu əyləcun böyük üstünlüyü sayılır. Elə bu üstünlüyünə görə də «ВЗБТ» QSC şirkəti ТЭП markalı əyləcləri bəzi qazma qurğularında qazma baltasının verişinin tənzimləməsinin icraedici mexanizmi qismində tətbiq etmişdir. Müqayisə üçün bildirək ki, elektromaqnitli əyləclərdə bucurqad barabanın tam dayandırılması mümkün deyil.




Şəkil 4. ТЭП markalı tənzimləyici elektromaqnitli ferro-tozlu əyləc
*1 – val; 2 – yan qapaq; 3 – maqnitli kipləşdiricilər; 4 – soyutma kanalları; 5 – elektromaqnit; 6 – tıxac; 7 – həyəcanlanma dolağı; 8 – rotor.*

Elektromaqnitli ferro-tozlu əyləclərin əsas çatışmamazlıqları aşağıdakılardır:

- tozun yeyilməsi, yanması və onun xüsusi maqnit kipgəcləri vasitəsilə kipləşdirilməsi zərurəti;
- bu əyləclərdə istiliyin kənarlaşdırılması səthi sahəsi istilik mübadiləsini tam olaraq aparmağa imkan verməyən borularla dövran edən su vasitəsilə həyata keçirilir, bu da sistemin qızmasına səbəb ola bilər.

Elektrodinamiki əyləcli qazma bucurqadları diskli və elektrodinamiki olmaqla iki işçi əyləcə, eləcə də xüsusi stoporlama mexanizminə malik dayanma əyləcinə malik olur. Bucurqadın fərdi intiqalının sabit cərəyan mühərriki elektrodinamiki əyləc rolunu oynayır. Belə bucurqadlarda köməkçi və tənzimləyici əyləclər nəzərdə tutulmur, çünki bu funksiyaları da elə elektrodinamiki əyləc icra edir.

Şəkil 5-də elektrodinamik əyləcli ЛБУ-1100ЭТ-3 markalı bir mühərrikli qazma bucurqadı göstərilmişdir.




Şəkil 5. Elektrodinamik əyləcli ЛБУ-1100ЭТ-3 markalı qazma bucurqadının kinematik sxemi.

Bu bucurqadda fırlanma hərəkəti sabit cərəyan mühərrikindən yumrucuqlu mufta vasitəsilə bucurqadın çərçivəsində yerləşən iki sürətli ötürmələr qutusuna verilir. Fırlanma hərəkəti aparan valın dişli çarxlarından ötürmələr qutusunun aralıq valında diyirlənmə yastıqlarının üzərində sərbəst fırlanan iki ədəd aparılan dişli çarxa ötürülür. Dişli çarxlardan hər hansı birinin aralıq valla sərt ilişməyə daxil olması sürətlər qutusunda yerləşən və ikitəsirli pnevmatik silindr intiqallı məsafədən idarə edilən ilişmə muftası ilə həyata keçirilir. Ardınca hərəkət aralıq valdan qaldırıcı vala ötürülür. Dişli mufta vasitəsilə sürətlər qutusunda ötürmə ədədinin və qaldırıcı valın fırlanma tezliyinin dəyişdirilməsi aparılır. İşçi əyləmə prosesi bucurqadın intiqalının mühərriki və iki təsirli iki ədəd pnevmatik silindrli pnevmomexaniki diskli əyləclə icra edilir. Qəza əyləmə prosesi bucurqadın işçi rejimində olduğu zaman sabit hava təzyiqi ilə yayları sıxılı vəziyyətdə olan birtərəfli təsirli pnevmatik silindrli pnevmomexaniki diskli əyləcun normal qapanması ilə həyata keçirilir. Uzun müddətli dayanmalar, təmir işlərinin aparılması zamanı qaldırıcı valın tərpənməz vəziyyətdə saxlanılması üçün kilidləyici qurğu vardır. Qazma baltasının verişini tənzimləmək üçün bucurqad ayrıca sabit cərəyan mühərrikli intiqala malik tənzimləyici ilə təchiz edilmişdir. Bu bucurqadın qazma baltasının verişinin avtomatik tənzimlənilməsi əsas mühərrik vasitəsi ilə də aparıla bilər.

## Nəticə

Ədəbiyyat analizi ilə müəyyən olunmuşdur ki, lentli-kündəli əyləclər konstruksiyasının sadə, istifadəsinin asan olmasına rəğmən istismar zamanı yüksək etibarlığı təmin etmir və əyləmə prosesində böyük istiliyin ayrılması ilə müşayət edilir.

Hidrodinamiki əyləclərin aşağıdakı çatışmamazlıqlarını göstərmək olar: rotorun fırlanma tezliyinin azalması zamanı əyləmə momentinin kəskin aşağı düşməsi; işlək vəziyyətdə olduqda əyləmə momentini tənzimləmək olmur.

Elektromaqnitli ferro-tozlu əyləclərə xas olan əsas çatışmamazlıqlara: tozun yeyilməsi, yanması və onun xüsusi maqnit kipgəcləri vasitəsilə kipləşdirilməsi zərurətinin olması; istilik mübadiləsini tam olaraq həyata keçirməyə imkan verməyən dövran edən suyun qızması aid oluna bilər.

## Ədəbiyyat

1. Janahmedov A.Kh. Valiyev N.A., Aliyev AM Dynamics and robustness of oil equipment. Baku: “APOSTROFF”, 2016. - 424 p.
2. Abubakirov V.F., Gnoevykh A.N., Burimov Y.G., Mezhdumov A.O. Drilling, anti-vibration and surface equipment. Reference guide in two volumes. M., IRC Gazprom, 2007.
3. Schmidt A.P. Electromagnetic brakes. Textbook. RSU of oil and gas named after I.M. Gubkina, 1997.
4. Efendiev T.Kh. Hydrodynamic vane brakes for drawworks. M., Nedra, 1980

Göndərilib: 13.04.2021 Qəbul edilib: 19.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/12-16

**Rafail Ayvaz oğlu Əhmədli**
AMEA Fəlsəfə və Sosiologiya İnstitutu
fəlsəfə elmləri doktoru, professor
ehmedli.rafail@mail.ru
**Elxan Musa oğlu Quliyev**
AMEA Fəlsəfə və Sosiologiya İnstitutu
kiçik elmi işçi
elxan.guliev.1952@mail.ru

# NƏRİMAN NƏRİMANOVUN FƏALİYYƏTİNİN ƏSAS İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *XX əsrin əvvəlləri, siyasi-ideoloji cərəyanlar, bolşeviklər, N.Nərimanovun ictimai və ədəbi dünyagörüşü, siyasi – ideoligi, inqilabi fəaliyyət*

**Main activities of Nariman Narimanov**
**Summary**

The article examines the aggravation of the struggle between political and ideological trends in Azerbaijan at the beginning of the twentieth century, the separation of the liberal national bourgeoisie, representing the ideology of the Azerbaijan Democratic Republic from the radical Marxist-Bolsheviks in relation to private property and the state system, and the subsequent processes associated with the development of events. At the same time, the article highlights the social and literary worldview of N.Narimanov, analyzes his political and ideological, revolutionary activities, and draws a general picture of the period of real power of N.Narimanov.
***Key words:*** *The beginning of the twentieth century, political and ideological trends, the Bolsheviks, the social and literary worldview of N. Narimanov, political and ideological, revolutionary activities*

XX əsrin əvvəllərində Azərbaycan fəlsəfi və ictimai-siyasi fikri mürəkkəb və keşməkeşli bir təkamül yolu keçmiş, ziddiyyətli siyasi-ideoloji və sosial proseslər milli ziyalıların dünyagörüşünü dəyişdirmiş, zaman keçdikcə xüsusi mülkiyyətə münasibət məsələsində ideoloji-fəlsəfi və siyasi cərəyanlar arasında mübarizə kəskinləşmiş, onlardan hər birinin Azərbaycan dövlət quruculuğu haqqında öz mövqeləri olmuşdu. Belə ki, xüsusi mülkiyyətə və dövlət quruluşuna münasibət Azərbaycan Xalq Cümhuriyyətinin ideologiyasını təmsil edən liberal milli burjuaziya təmayüllü demokratik mütəfəkkirlərin dünyagörüşünü sosial-siyasi və fəlsəfi baxışlarını radikal marksist-bolşevik təmayülündən ayırmış və zaman keçdikcə onlar arasındakı qarşıdurmanı kəskinləşdirmişdi. Ölkədə ideoloji-siyasi mübarizənin müəyyən mərhələsində Nəriman Nərimanov başda olmaqla bəzi liberal siyasi maarifçilərin marksizm cəbhəsinə keçməsi onları liberal milli cərəyanın nümayəndələrindən və digər milli ziyalılardan ayırmışdı.

Azərbaycan xalqının ictimai-siyasi, ideoloji və fəlsəfi fikir tarixində görkəmli ədib və dramaturq olan Nəriman Nərimanova (1870-1925) "XX əsrin hər tarixi mərhələsində münasibət fərqli olmuşdur" (1, 21).

Nəriman Nərimanovun ictimai-siyasi fəaliyyətinə, fəlsəfi dünyagörüşünə haqq qazandıranlar göstərirlər ki, "Nərimanov bütün həyatı və yaradıcılığı boyu vahid və ardıcıl bir əqidə nümayiş etdirmiş, bütün amalı öz xalqına, millətinə sədaqətlə qulluq etmək, xalqını maarifləndirmək, onun sosial vəziyyətini yaxşılaşdırmaq, fərdi və ictimai miqyasda sağlam mühit yaratmaq və bunun sayəsində milli intellektual potensialı buxovlardan xilas edərək onun özünü ifadəsi üçün şərait yaratmaqdan ibarət olmuşdur. İstər əbədi-bədii, istər maarifçilik və istərsə də ictimai-siyasi fəaliyyətində, iqtidarda olduğu dövr də daxil olmaqla, o, həmişə bu amala xidmət etmişdir" (8).

Nəriman Nərimanovun həyat və fəaliyyətini tədqiq edən tədqiqatçıların fikrincə, onun dünyagörüşü, əqidəsi yalnız kommunist ideologiyasının, xüsusilə bolşevizmin təsiri ilə formalaşmamış, o, Lenin məktəbinin yetirməsi olmamışdır. O, böyük bir millətçi və vətənpərvər olmuş, hansısa bir qrupun, partiyanın maraqlarından deyil, ilk növbədə milli maraqlardan çıxış etmiş, milli dövlətçilik idealını təmsil edən böyük bir türkçü olmuş, öz milli maraqlarını sosial-siyasi görüşləri ilə uzlaşdırmağa və ictimai-siyasi fəaliyyətini də məhz bu kontekstdə qurmağa çalışmışdır. Nərimanovun müəyyən bir vaxtda, tarixin müəyyən bir kəsiyində, müəyyən bir coğrafi-siyasi şəraitdə zamanın müəyyən bir gerçəkliyi olan sosial-demokratik hərəkatın və daha sonra kommunist ideologiyasının təsir sferasında və bu hərəkatın sosial-energetik potensialından bəhrələnərək öz şəxsi əqidəsini və milli ideallarını həyata keçirməyə çalışmışdı (8).

Tarixdən bəllidir ki, çar Rusiyası devrildikdən sonra siyasi-ideoloji təşkilatlar Rusiyanın idarə şəklinin necə təşkil olunması haqqında fikir ayrılıqları yaranmış, Rusiya bolşevik partiyası ilə həmfikir olan Azərbaycandakı bolşevik "Hümmət" və Rusiya sosial-demokrat menşevik partiyasının tərəfdarı olan menşevik "Hümmət"çilər "Vahid Rusiya", milli müqəddəratda fəal rol oynayan "Müsavat" partiyasının rəhbərləri isə öncə "Federetiv Rusiya" sonra Rusiyadan ayrı "Federativ Zaqafqaziya", daha sonra isə "Müstəqil Azərbaycan" ideyasını irəli sürmüş, bir müddət Rusiyadan ayrı "Federativ Zaqafqaziya", sonra isə "Müstəqil Azərbaycan Xalq Cümhuriyyəti" yaratmağa nail olmuşdular.

1906-cı ilə qədər "Konstitusiyalı monarxiya", sonra "Demokratik Respublika", 1917-ci il fevral inqilabından sonra "Sovet hakimiyyəti" formasında "Proletariat diktaturası" tərəfdarı olan Nəriman Nərimanov məhz yuxarıda adı çəkilən bolşevik "Hümmət"çilərin başçısı olmuşdur. 1917-ci il oktyabr çevrilişindən sonra Nərimanov bütün dünyanın yalnız sinfi mübarizə yolu ilə azadlığa çıxacağına inanmış və bu yolda çalışmışdır.

Ümumiyyətlə, Nəriman Nərimanovun uşaqlıq və gənclik dövrünü nəzərə almasaq, onun ictimai-siyasi fəaliyyətini 3 dövrə bölmək olar:

1) Maarifçilik dövrü;
2) İnqilabi-siyasi fəaliyyət dövrü;
3) Formal hakimiyyət dövrü.

Nəriman Nərimanov ictimai və ədəbi fəaliyyət dövründə əsasən maarifçiliklə məşğul olmuş, 1890-cı ildə Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra bir müddət müəllimlik etmiş, jurnalistliklə məşğul olmuş, 1894-cü ildə "Nadanlıq", 1895-ci ildə "Şamdan bəy", 1899-cu ildə "Nadir Şah", 1908-ci ildə "Bahadır və Sona" kimi ədəbi əsərlər yazmış, Azərbaycan türkcəsi və rus dilini öyrənənlər üçün dərsliklər tərtib etmiş, rus yazıçısı N.V.Qoqolun "Müfəttiş" komediyasını Azərbaycan türkcəsinə tərcümə etmiş, Bakıda ilk xalq qiraətxana-kitabxanası təçkil etmişdi. O, fəaliyyətinin maarifçilik dövründə bədii əsərləri ilə yanaşı dövrün bir sıra qəzet və jurnallarında gerilik, cəhalət və fanatizmi kəskin tənqid etmiş, xalqın maariflənməsində əlindən gələni əsirgəməmişdir.

Nəriman Nərimanovum fəaliyyətinin ikinci dövrü (1905-1920) onun siyasi-inqilabi fəaliyyət dövrüdür. 1905-ci ildə sosial-demokrat "Hümmət" təşkilatının üzvü olan Nərimanov Rusiya Sosial-Demokrat Fəhlə Partiyasının (RSDFP) proqramını Azərbaycan türkcəsinə tərcümə etmiş, dövrünün bir sıra qəzet və jurnallarında üsyankar inqilabi məqalələrlə çıxış edərək çar istibdadını kəskim tənqid etmiş, xalqın azadlığı yolunda ardıcıl mübarizə aparmışdır.

Nərimanov 1908-ci ildə Odessadakı Novorosiysk İmperator Universitetinin tibb fakültəsini bitirib diplomunu aldıqdan sonra Bakıya gələrək şəhər xəstəxanasında işləməyə başlamış, lakin siyasi məsələlərlə məşğul olduğu üçün 1909-cu ilin sentyabrında Həştərxana sürgün edilmiş, 1913-cü ilə qədər Həştərxanda qalan Nərimanov yenidən Bakıya qayıdaraq burada ictimai-siyasi fəaliyyətlə və maarifçiliklə məşğul olmuş, fəhlələr arasında təbliğat aparmış, 1917-ci ildə bolşevik "Hümmət" təşkilatının sədri, Bakı şəhəri üzrə RSDF(b)P-nin üzvü, "Hümmət" qəzetinin redaktoru 1918-ci il aprelin 25-də bolşevik-daşnak Stepan Şaumyanın rəhbərliyi altında yaradılan Bakı Xalq Komissarları Sovetində Şəhər təsərrüfatı üzrə xalq komissarı olmuş, 1918-ci il Bakı mart qırğınını Şaumyanın rəhbərliyi ilə ermənilərin törətdiyi faciəni görəndən sonra ağır xəstəliklə əlaqədar olaraq Bakını tərk edərək 1918-ci ilin iyun ayında Həştərxana müalicəyə göndərilmiş, sağaldıqdan sonra Həştərxanda bir sıra partiya orqanlarında çalışmış, 1919-cu ildə Moskvaya çağırılaraq RSFSR Xalq Xarici İşlər Komissarlığında Şərq məsələləri üzrə Xalq Komissiyasının müavini vəzifəsinə təyin edilmişdi.

Biz Nəriman Nərimanovun fəaliyyətinin maarifçilik dövrünü yüksək qiymətləndirməklə yanaşı, heç bir polimika açmadan onun Azərbaycan Xalq Cümhuriyyəti və onun yaradıcılarına qarşı düşmən münasibət bəsləməsini, həmçinin Türküstanda da Sovet hakimiyyətinin qurulmasını istəməsi və oralarda da marksist ideologiyasının yayılmasına çalışmasını qəbul etmirik. Belə ki, o, Azərbaycan Xalq Cümhuriyyətinin baş naziri Nəsib bəy Yusifbəyliyə 16 iyul 1919-cu ildə Həştərxandan yazdığı müraciətində bildirirdi ki, nə qədər ki siz "millət" və "din" sözlərini tez-tez təkrar etməklə məşğul idiniz. Mən öz nöqteyi-nəzərimdən sizə geridə qalan adamlara baxan kimi baxıram... Mərd-mərdanə deyin: biz Rusiya inqilabının xarakterini anlamamışıq. Biz dağıdıcı imperialist müharibəsinin bütün nəticələrini nəzərə ala bilməmişik, bu meydandan çəkilirik, qoy Azərbaycanda Sovet hakimiyyəti olsun. Bununla siz rus proletariatı qarşısında təqsirinizi yüngülləşdirmiş olarsınız (11, 215-219).

Nərimanov Türküstanla bağlı da yazırdı: "Biz Türküstana ciddi diqqət yetirməliyik, çünki Şərqdəki gələcək işimizdə Türküstan mərkəzi bir yol tutur. Biz heç də istila siyasəti ilə məşğul olmaq fikrində deyilik. Çünki biz Şərqə azadlığı silah ilə deyil, öz ideyalarımızı yaymaq yolu ilə aparırıq" (11, 231).

Nəriman Nərimanovun fəaliyyətinin formal hakimiyyəti dövrü (1920-1925) Bakının XI Qırmızı Ordu tərəfindən işğalı və Azərbaycan Xalq Cümhuriyyətinin süquta uğradıldığından sonrakı beş ili əhatə edir. Azərbaycan Xalq Cümhuriyyəti süquta uğradıldıqdan və Azərbaycan Sovet Sosialist Respublikası elan edildikdən sonra qiyabi olaraq Azərbaycan SSR Müvəqqəti İnqilab Komitəsinin sədri və Xalq Komissarları Sədri (Baş naziri) vəzifəsinə təyin edilərək Bakıya göndərilən Nəriman Nərimanov 16 may 1920-ci ildə Bakıya gələrək gözləmədiyi bir vəziyyətlə qarşılaşmalı olmuşdu. Tədqiqatçılar göstərirlər ki, "əslində mərkəzin (Moskva bolşevik hakimiyyəti nəzərdə tutulur – R.Ə.) bu təyinatı Nəriman Nərimanovun siyasi intiharının başlanğıcı olmuş, onun öncə qazandığı xalq sevgisini tarixə gömmüş oldu" (3, 14).

Mərkəz tərəfindən Nərimanov Azərbaycan hökuməti başçısı təyin olunsa da, Azərbaycanın ilk əvvəllər zahirən Komissarlar heyəti və İcra Komitəsi tərəfindən idarə olunması göstərilsə də, əslində ölkə Mərkəzin göndərdiyi və müdafiə etdiyi şəxslər, xüsusilə Rusiyaya tabe olan "Neftkom"un sədri rus Serebrovski, Azneft rəisinin müavini rus Barinov, Bakı fəhlə şurasının rəisi rus Kırılov, Bakı qəzası hərbi komissarı Anefski, Xüsusi Qafqaz ordusu komandanı rus Yeqorov, hərbi rəhbər Sıçkov, Azərbaycan Xalq Maarifinin şöbə müdiri rus Barçov, siyasi Maarif müdiri müavini Tartakov və ən başlıcası Nəriman Nərimanov hələ Azərbaycana gəlib çatmamış "Türkiyəyə kömək" pərdəsi altında Azərbaycana daxil olan XI Qırmızı Ordu qüvvələri 1 mayda Bakını, 1 ay müddətində də bütün Quzey Azərbaycanı istilaya məruz qoymuş, ölkəni yağmalamış, ölkədəki Türk komandanlarını ruslarla əvəz etmiş, nə qədər Osmanlı Türk zabiti varsa hamısını ya həbs etmiş, ya da ölkədən çıxarmış, milli ziyalıları, şəhər, qəsəbə və kəndlərdə olan mötəbər adamların kökünü birdəfəlik kəsmək üçün sorğusuz-sualsız qurşuna düzmüş, hər tərəfdə fəaliyyətə başlayan ÇK-lar gecə-gündüz qanlı işlərini davam etdirmişdi ki, bütün bunların da başında Azərbaycanın həqiqi diktatoru, cəlladbaşı, XI Qırmızı Ordunun siyasi şöbəsinin rəisi V.A.Pankratov dururdu. Pankratovun əmrinin fövqündə bir əmr yox idi. ÇK məmurunun özbaşınalığı o həddə çatmışdı ki, o hətta Azərbaycan Komissarlarının rəisi olan Nəriman Nərimanovun özünü belə həbs etmişdi. Bir sözlə Azərbaycanın xarici və daxili siyasəti, iqtisadi, hərbi sahələri, dəmir yolu, neft müəssisələri tamamilə Rusiyanın ixtiyarına keçmiş, xalq maarifi, səhiyyə və inzibati dairələri də başqa millətlərdən olan şəxslər tərəfindən idarə olunmağa başlanılmışdı. Belə bir vəziyyətdə Nəriman Nərimanov təkbaşına heç nə edə bilməzdi və zatən də edə bilməmişdi.

Azərbaycanda Türk milli mədəniyyəti əleyhinə görülən təşəbbüslər o qədər geniş vüsət almışdı ki, hökumət başçısı olmasına baxmayaraq Nərimanov konkret addımlar ata bilməmiş, bütün bunlara qarşı məqalələr yazaraq qəzetlərdə çap etdirmək məcburiyyətində qalmışdı. O, Bakıda rusca nəşr edilən "Bakinski raboçi" və türkcə nəşr edilən "Kommunist" qəzetində nəşr etdirdiyi bir məqaləsində yazmışdı: "Azərbaycan fəhlə və kəndlisi bəzi səbəblərdən siyasi haqqından, bütün mülkiyyətindən, iqtisadi faydasından keçə bilər. Fəqət öz dilindən kimsəyə fədakarlıq yapmaz" (14, 85).

Nəriman Nərimanovun Azərbaycanda olduğu müddətdə bütün istəklərinin tam yerinə yetirilməyəcəyini anlayan Stalin, Orconikidze, Kirov, Mikoyan, Moskvadan Bakıya göndərilən partiya və təsərrüfat rəhbərləri, xüsusən, Bakıdakı erməni rəhbər işçiləri onu Azərbaycandan uzaqlaşdırmaq məqsədilə "Lenin və partiya" qarşısındakı xidmətləri nəzərə alınaraq "1922-ci ildə Moskvaya dəvət olunmasına və onu Mərkəzi İcraiyyə Komitəsinin sədrlərindən biri təyin olunmasına nail olmuşdular.

Nəriman Nərimanov 1923-cü ilin yanvarından ömrünün axırına qədər SSRİ Mərkəzi İcraiyyə Komiitəsinin dörd sədrindən biri olmuşdur. Moskvada işlədiyi dövrdə "Lenin və şərq", " "Lenin və müsəlman Şərqi", "Elmi kommunizmi başa düşmək yolları", "Milli məsələ" adlı əsərlərini yazaraq, "Leninizm"i müdafiə və təbliğ etmişdi. V.İ.Leninin ölümü ilə əlaqədar matəm günlərində N.Nərimanov "İzvestiya" qəzetində çap olunmuş "Lenin və müsəlman Şərqi" adlı məqaləsində yazırdı ki, qəlbi bütün müsəlman xalqları üçün şəfqətlə döyünən, onları əsarətdən azad edib müstəqil inkişaf yoluna çıxarmağın səmimi arzusunda olan "dünyanın ən böyük psixoloqu" Leninin vəfatı Şərq aləmində dərin bir kədər doğurmuşdur (9).

Nəriman Nərimanovun həyatının son illərində Azərbaycan xalqına qarşı aparılan qeyri-səmimi və hətta düşmənçilik siyasəti ilə bağlı Stalin, Orconikidze, Kirov, Mikoyan və Moskvadan Bakıya göndərilən partiya və təsərrüfat rəhbərləri, xüsusən Bakıdakı erməni rəhbər işçiləri ilə münasibəti gərginləşmiş və bu ziddiyyət getdikcə dərinləşmişdi. O, "Ucqarlarda bizim inqilabın tarixindən" adlı yazısından seçdiyi hissləri məktub formasında Stalinə, surətini Trotskiyə göndərmişdi (2).

Nərimanov ömrünün sonlarında aldadıldığını, onun fikri ilə hesablaşmadıqlarını anlamışdı. Onu daşnak Mikoyan millətçilikdə ittiham edir, bu işi Bakıda Orconikidze və Kirovun himayəsi altında Bakı partiya təşkilatının rəhbərləri olan Mirzoyan, Sarkis davam etdirir, yerli satqınlar Əliheydər Qarayev, M.D.Hüseynov və başqaları da onlara qoşulurdu. Nərimanov göstərirdi: "Mən tam bir il neft məhsullarından Azərbaycanın xeyrinə ayırmaq üçün Serebrovski yoldaş ilə mübarizə apardım. Məsələni siyasi büroya qədər

çatdırdım, o da Serebrovskiyə tapşırdı ki, bunu etsin. Nə üçün Respublika Mərkəzi Komitəsi bu qərarın yerinə yetirilməsini izləmir? Ona görə ki, Kirov, Mirzoyan və kompaniyaları bu işə son dərəcə etinasız idilər... Onlar üçün Azərbaycan kəndlisinin cəhalət bataqlığında boğulmasının nə fərqi var". O, soruşurdu: "Həqiqətən indiki Azərbaycanda məhz Azərbaycanı təmsil edən partiya varmı? Mən təsdiq edirəm: bu partiya yoxdur və o vaxta qədər olmayacaq ki, Mirzoyanlar özlərini Azərbaycanı simasızlaşdırmaq kimi murdar siyasətlərindən əl çəkməyiblər... Bakı təşkilatına rəhbərlik edən ermənilər və rus şovinistləri cinayətkar siyasət yürüdürlər" (2).

Özünün ermənilər tərəfindən Azərbaycandan uzaqlaşdırıb Dağlıq Qarabağa muxtariyyət almaq istəmələrini şərh edərkən göstərir ki, mən Moskvaya işə gedəndən sonra Dağlıq Qarabağ Mirzoyanın güclü təzyiqi nəticəsində "Muxtar Vilayət" elan edildi. Mənim vaxtımda buna nail ola bilmirdilər... Sonra Gəncənin dağlıq hissəsi və s. haqqında məsələlər gəlirdi. Azərbaycanda daşnaq siyasəti var və bu gücü ilə gedir. Mən zərrə qədər də şübhə etmirəm ki, Azərbaycan Kommunist Partiyasının Mərkəzi Komitəsi (AKP MK), Serqo Orconikidze və Stalinin simasında biz türklərə inanmır və Azərbaycanın taleyini erməni daşnaklarına tapşırırlar. Qəribə burasıdır ki, bu adamlar düşünürlər ki, türklər o qədər qanmazdırlar ki, bunu başa düşmürlər (2).

Azərbaycan Xalq Komissarları Sovetinin sədri, Zaqafqaziya İttifaq Sovetinin sədri, SSRİ Mərkəzi İcraiyyə Komitəsi dörd sədrindən biri kimi yüksək vəzifələrdə çalışan, Azərbaycan Xalq Cümhuriyyəti və onun yaradıcılarına düşmən münasibət bəsləyən, Türküstanda Sovet hakimiyyətinin qurulmasına çalışan, kommunistlərin "parlaq liderləri"nə ürəkdən inanan Nəriman Nərimanovun "ömrünün axırına qədər öz əqidəsindən dönməməsini" dəstəkləyən tədqiqatçıların (5; 10). gəldiyi ümumi nəticə bundan ibarətdir ki, Nəriman Nərimanov o illərin azərbaycanlısı üçün bolşevizmin təzahürü kimi deyil, milli təmayüllü siyasətçi kimi inam qazanmışdır. "Milli təmayüllü kommunist" məfhumunu məhz N.Nərimanovun anlayışında qəbul etmək lazımdır: yəni azərbaycanlılar başqa xalqların maraqlarına toxunmadan Azərbaycanda tam milli inkişaf və ölkələrini idarə etmək hüququna malik olmalıdırlar. N.Nərimanov buna riayət edilmədiyindən bolşevizmin süquta məruz qalacağı fikrini irəlicədən söyləmişdir (12, 446-447).

Nəriman Nərimanovun apardığı milli təmayüllü siyasət sonralar "Nərimanovçuluq" adlı cərəyana çevrilmişdir. Deməli, N.Nərimanovun milli təmayüllü dünyagörüşünün kökləri həyat və yaradıcılığı ilə, xalqının yaşayışını və problemlərini, Azərbaycana qarşı hazırlanan məkrli planları, dünyada və bölgədə gedən prosesləri dərindən dərk etməsi ilə bağlı olmuşdur... N.Nərimanov Azərbaycan xalqının milli-mədəni inkişafına, din probleminə, Azərbaycan dilinə dövlət statusu, milli ziyalılara və təhsilə önəm verilməsinə Milli Dövlətçiliyin tərkib hissəsi kimi baxmış, ona xüsusi diqqət yetirmiş, Azərbaycan adət-ənənələrinin qoruyucusu, elm, təhsil və mədəniyyətin inkişafına qayğı göstərən başlıca şəxs olmuşdur. O, bu sahələrdə müvafiq sənədlər imzalamış və fəaliyyət göstərmişdir. N.Nərimanovun bu sahədəki fəaliyyəti Azərbaycan xalqının düşmənlərinin və bir sıra məhdud düşüncəli Azərbaycan bolşeviklərinin qəzəbinə tuş gəlmiş və onun əleyhinə geniş kompaniyaya başlamışdılar (7).

Nəriman Nərimanovu kommunist ideologiyasına münasibətdə və Rusiya bolşevikləri ilə əlaqələrdə milli maraqlara səthi yanaşmaqda, xüsusilə Azərbaycan Xalq Cümhuriyyətinin qurucularına qarşı düşmən münasibətdə olduğunu əsas götürərək onu tənqid etmiş (4). və göstərmişlər ki, bizcə, N.Nərimanovla bağlı irəli sürülən tənqidi fikirlər heç də əsassız deyildir. Belə ki, Azərbaycan Cümhuriyyətinin timsalında Azərbaycan xalqı bir millətin taleyində önəmli rol oynayan ideyaları (istiqlal, müstəqil parlament, müstəqil ordu, bayraq və s. əldə etdikdən sonra, onu Sovet Rusiyasının əli ilə yıxıb yerində "müstəqil" Sovet Azərbaycanı qurmağında, bu mənada Nərimanovun Sovet Rusiyasının başçıları ilə əslində tabeçilik anlaşması əsasında, onların qarşısında hansısa şərtlərlə çıxış etməsinin də heç bir anlamı yox idi. Burada qazanan yalnız bir tərəf var idi: Sovet Rusiyası və onun əlaltıları. Fikrimizcə, bu baxımdan Nərimanov Sovet Rusiyasından deyil, Sovet Rusiyası Azərbaycan Cümhuriyyətini işğalı planı çərçivəsində "Nərimonov faktoru"ndan maksimum faydalanmışdır. Bunu həmin dövrdə Moskvada yaşayan Nərimonovun Azərbaycanda baş verənlərlə bağlı Lenini daima məlumatlandırması, "Qafqazın işğalına baxış" məruzəsi və xüsusilə Azərbaycan Cümhuriyyətinin baş naziri Nəsib bəy Yusifbəyliyə yazdığı məktubundan aşıq şəkildə görmək mümkündür. Belə ki, Nərimanov özü etiraf edirdi ki, Moskvada olduğu dövrdə (1919-may 1920) Azərbaycanda hakimiyyətin bolşeviklərin əlinə keçməsi üçün hazırlıq irəli sürümüş, Nərimanov da bu planın həyata keçirilməsi üçün mərkəzi hökumətə, xüsusilə Leninə xidmət etmişdi (13, 13).

O, həmçinin Nəsib bəy Yusifbəyliyə yazdığı məktubunda özünün bolşeviklərlə bir yerdə olmasını siyasi-ideoloji baxışlarındakı fərqlərlə izah etməyə çalışmış və göstərmişdi ki, "Siz pantürkizm və panislamizm ideyalarını yayarkən, mən bir kommunist kimi sizin qəti əleyhinizə çıxmışdım, lakin sizin Türkiyə qanadı altına girmək cəhdinizə, bir psixoloq kimi lütfkaranə baxırdım. Türkiyə "zəfərlə" gəlib rüsvayçılıqla getdi" [11, 216].

Tədqiqatçılar göstərirlər ki, çox keçmədən Nərimonovu qanadının altına alan Sovet Rusiyası da Azərbaycana "zəfərlə" gəldi, ancaq şimal ölkəsi Türkiyədən fərqli olaraq ləyaqətlə getmədi. Sözün həqiqi mənasında bu ölkəni 70 il müstəmləkəsi kimi idarə etdi (6, 124).

Biz Nəriman Nərimonovla bağlı hər iki tərəfin fikir və mülahizələrinə hörmətlə yanaşaraq "Şərq dahisi" olma xülyasına düşən Nəriman Nərimonovu birmənalı olaraq böyük oyunların uğursuz qurbanı hesab edir, onun siyasi baxışlarını deyil, əsasən maarifçiliyini yüksək qiymətləndiririk

**Ədəbiyyat**


1. Alışanov Şirindil. Yaradıcı ömrün böyük bəhrəsi, professor Teymur Əhmədovun "Nəriman Nərimanov (həyatı, mühüm və ədəbi-bədii yaradıcılığı) adlı əsəri haqqında "Ədəbiyyat qəzeti" 7 aprel , 2018.
2. Azərbaycan EA-nın "Xəbərləri" (tarix, fəlsəfə, hüquq), № 4, Bakı, 1989.
3. Aydın Mədət oğlu Qasımlı. Böyük oyunların uğursuz qurbanı bolşevik Nəriman Nərimanov. "Türküstan" qəzeti, 22 dekabr, Bakı, 2016.
4. Balayev Aydın, Plennik idei ili politiçeskiy slepeç, "Azərbaycan" qəzeti, Bakı, 20 iyun, 1991.
5. Əhmədov Teymur, Nəriman Nərimanovun yaradıcılıq yolu, Bakı, Elm, 1991.
6. Ələkbərov Faiq. Milli ideologiya probleminə tarixi-fəlsəfi baxış (II hissə), "Elm və təhsil", Bakı, 2014.
7. Həsənov Həsən. Nəriman Nərimanov: milli ruh və siyasi təfəkkürün vəhdəti. Nəriman Nərimanov – 140, AFSEA, 2 (30), Azərbaycan Universiteti, Bakı, 2010.
8. Xəlilov Səlahəddin Milli İstiqlal və sosial ədalət ideallarının uzlaşdırılması yolu, Nəriman Nərimanov – 140, AFSEA, fəlsəfə və sosial-siyasi elmlər, elmi-nəzəri jurnal, Bakı, 2016.
9. 9.İzvestiya" qəzeti, Moskva, 25 yanvar, 1924.
10. Mir Cəlal. Görkəmli yazıçı, realist, "Ədəbi Azərbaycan", 1956, № 6;
11. Nərimanov Nəriman. Məqalələr və nitqlər. Bakı, 1971.
12. Nəriman Nərimanov. Oğlum Nəcəfə məktub, Nəriman Nərimanov. Seçilmiş əsərləri , Bakı, AMEA, 2001.
13. Nərimanov Nəriman, V.İ.Lenin haqqında, Bakı, Azərnəşr, 1957.
14. Rəsulzadənin M.Ə. "Azərbaycan Cümhuriyyəti". Bakı, 1990.


Göndərilib: 16.04.2021 Qəbul edilib: 21.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/17-23

**Kai Yang**
School of Business, Nanjing University of Information Science & Technology
doctor, lecturer
yangkai@nuist.edu.cn
**Mahammad Malikov**
MBA from Nanjing University of Information Science and Technology
master
malikov.m@protonmail.com

# EVALUATION OF DYNAMIC CHANGES OF CONSUMERS' ONLINE REVIEWS FROM THE ELABORATION LIKELIHOOD MODEL METHOD

**Summary**

One of the essential models that explain the concept of persuasion is the Elaboration Probability Model, which argues that there are two processes in the persuasion process, namely central and environmental persuasion. İt is thought that the article, including a detailed explanation of the model and information about the model, filled a gap in this regard.

– The research findings show that the model is mainly used in marketing and advertising studies.

– In terms of the level of affecting the probability of elaboration, the feature subject to the most significant number of studies is interesting.

– It was revealed that the factors involved in the elaboration process and whose effect has been handled the most in the number of studies are the power of assertion and the source credibility.

The review provides valuable information in terms of allowing the model's use and the variables in the model to be seen as a holistic example in Amazon.

***Key words:*** *ELM method, Amazon, main factors, reviews*

## Introduction

The model, which is also referred to as ELM in the literature, is based on the dual-process theory. In addition, it is based on the fact that a decision-making or persuasion process is affected by two different processes in parallel. It grades the decision-making process from high elaboration to low elaboration. Accordingly, decision-making reasons that can be discussed, discussed, and more objective are highly elaborate. In contrast, decision-making reasons based on relative feelings and perception are modeled at a low favorability level.

For example, when buying a car, the concepts such as fuel consumption, tax, how many people it can carry are objective, measurable, open to discussion, and easy to compare alternatives are considered more elaborate features. On the other hand, many features such as the color, design, and appearance of the car vary from person to person, based on perception and measurement. According to the double process theory, these low-detailed features have a complicated structure to change over time based on past experiences.

Using these two approaches above, it is also possible to think of decision and persuasion processes as two ways as central and peripheral ways. The central route follows when a person is closely related to any decision issue and has a curiosity about it. The person's perception is clear, and his thinking on the decision-making process works intensely. While it is certain that the person will make easier decisions about the subjects they sympathize with, it is satisfied with this and evaluates the highly detailed features in detail.

On the other hand, the peripheral path emerges on issues that more people do not directly care about, do not need much, and therefore do not concentrate on it. The person's decision process is mainly affected by some features and is not elaborated too much. It is also possible that the circumferential road turns into a primary path, with the peripheral road becoming a need or detailing the person's level of perception and, therefore, the decision processes.

**Elaboration Likelihood Model Method.** The main feature of the double-process theories developed after 1980 is that they divide the mental processes underlying social judgments and behavior into two according to their automatic or controlled realization. The basic assumption of dual-process theories is that the mind works bi-directionally, and therefore mental processes can be divided into two general classes.

These are processes that happen automatically or in a controlled manner. [1]While the automatic process involves fast, efficient, and uncontrolled processing, the controlled process is slow, more effortful, and rules-based. As an example of these two processes, talking on the phone while driving (automatic system) and stopping to give way to the ambulance coming from the side road (controlled system) can be given. The features of these two processes are included in Table 1.

| Automatic Process | Key Features | Controlled Process |
|---|---|---|
| Arise unintentionally | Willfulness | Intentionally initiated |
| Requires few cognitive resources | Activity | Requires cognitive resource |
| Cannot be stopped, if desired | Controllability | Can be stopped at any time |
| Out of conscious awareness takes place | Awareness | Happens consciously |

**Table 1. Features of Automatic and Controlled Processes**
**Source:** https://dergipark.org.tr/tr/download/article-file/210872

Relationship between ELM and Management Information Systems. As of this article's writing, an article was published in the last issue of MISQ magazine that analyzed a user's mood and behavior on the web using ELM and CST (customer search theory). The article's central theme is that the ELM method is used to measure the person's depth of thinking, but the ELM alone cannot model how many different characteristics a user can describe. For example, within the study's scope, an online book sales store was created, and the users' decision process was examined by collecting the user behaviors (which book they chose, the click statistics on the screen, etc.). In this process, ELM was used to understand which concepts the users thought more deeply, but ELM was not sufficient to reveal which concepts the users included in the decision-making process. Answer to this question, using the search theory (CST), an analysis of the matching of the books presented with the users' requests (or the book search for the user) was made.

Ease of navigation is the presence of various site functions to quickly find what their customers are looking for on their websites. One of the primary things that should be kept in mind in the website's preparation is that customers will never want to shop from an amateurish website. When big companies such as Amazon.com are examined, it is striking that the product categories on the site are displayed while the ease of navigation is provided to the users. Therefore, the website must be easy to navigate and understand. For this reason, companies should not ignore the following warnings while setting up their websites[2]:

- Instead of including links and logos that will cause customers to wait on the home pages of the sites, direct access to the site should be provided;
- It should be ensured that all the link marks (links) on the website are prominently displayed.
- It should be ensured that the order form page is easily accessible from the site's home page and every other page.
- Contents page should be self-explanatory and easily understandable.
- It should make ordering more manageable, and for this purpose, the opportunity to be connected to the order form page from all over the site should be provided.

Processing on the central route handling on the retentive route. Consider two prospective clients, all of whom need a new television. Emily is a technology enthusiast and frequent Amazon user, while Kevin occasionally makes online payments and is primarily interested in finding a good television at a reasonable price. Amazon hopes to inspire all customers to buy a TV (any television) from its website.

While all users will have some level of everyday signal handling (particularly for pricing), Emily is much more likely to pay attention to the messages and design with her interest in technology. If she likes what she likes, she will be more likely to buy from Amazon than a less convincing rival will.

[1] Park D., Lee J., Han I. (2007). "The Effect of On-Line Consumer Reviews on Consumer Purchasing Intention: The Moderating Role of Involvement", International Journal of Electronic Commerce, 11(4), 125-148.

[2] Rice D.H., Kelting, K and Lutz, R. (2012). "Multiple Endorsers and Multiple Endorsements: The Influence of Message Repetition, Source Congruence and Involvement on Brand Attitudes", Journal of Consumer Psychology, 22(2), 249- 259.




Picture 1. Amazon research results
Source: https://4bil.ua/blog/how-to-get-reviews-on-amazon/

Emily looks for high-end televisions, sorts them by ranking from high to low, and then examines the reviewers. She uses the "Buy now with 1-Click" option after deciding her decision because all of her data is already up to date in Amazon's system. Amazon's dependability and product over the years have gained her trust.

Amazon does not leave the occasional user hanging whenever compelling design. Many of its design features are intended to appeal to retentive processing.

First, consider how it employs graphic design. The focus of the product description, a good big picture of the business itself, is ideal for holding interest reading required to see that gem. It also allows viewing the brand from various angles. The myriad filtering choices allow prospective consumers to pick from a wide range of categories, which can act as a workaround to choosing a product they have no interest in thoroughly exploring (e.g., rating, price, age of product).




Picture 2. Amazon offers a thorough product name, emphasizes future costs, and keeps adding to cart clear and straightforward
Source: https://4bil.ua/blog/how-to-get-reviews-on-amazon/

**Method ELM and determination of their tonality.** The previously considered methods made it possible to find aspects and determine their sentiment separately as two independent problems. However, in reality, these tasks are interrelated, and statistical regularities within one model can improve both problems' quality. İ makes it urgent to develop methods that allow solving both problems simultaneously. A feature of this approach is predicting the relatedness of the aspect and the evaluative word even when there is no direct syntactic connection between them.

Experiments have shown that ELM has better accuracy than other models.

Additionally, the authors use a self-learning model approach, in which the model is trained on examples outside the training set predicted by itself. The papers reviewed focus on finding aspects. It allows us to extract expressions from the reviews' texts that contain an aspect and the users' opinion about it. For example, "firmware update without a hitch," "firmware update without a hitch."[3]

Extraction of such structures allows us to extract more detailed information about the product than other approaches. In the article, a set of reviews from the Amazon online store was proposed, in which aspects, evaluative statements, and connections between them, indicating the sentiment of the formed pair, were highlighted. For extraction, the authors propose to use a graphical probabilistic model, which shows the accuracy of extraction of links according to the $F1$ criterion equal to 65%. We should note the complexity of creating such a corpus and using machine learning methods to solve the problem, the relatively low consistency of the two assessors' results involved in marking up reviews.

[3] Zwier, S., Bolink, W. (2015). "'Betaserc (R) is Better'. The Third-Person Effect in Reactions to Direct-to-Consumer Advertising", Psychologie & Gezondheid, 39(4), 224-231.

sistemin tərkib hissəsinə daxil edilməsini mümkün edir və ən azından bir sıra toponimlərin, oronimlərin, hidronimlərin və s.-nin kristallaşma kimi tanınan sabitliyini nəzərə almağı labüd edir".

Bəlkə də, təcrübəyə əsaslanaraq bəzi tərif cəhdləri ilə birlikdə - bəzən tendensiyaların inventarlaşdırılmasına (V.Mançak), bəzən adın ümumi bir ada təmiz və sadə bir şəkildə endirilməsinə gətirib çıxaran yanaşmalar da bizi məyus edə bilər (G.Villet). Birinci yol, nəzərdə tutulan obyektin həqiqi tərifi deyil; ikincisi isə, bu obyektin müəyyən bir obyekt kimi mövcudluğunu inkar edir. Nəticədə, onomastikanı malik olduğu konkret təcrübəsi əsasında verdiyi praktik müdrikliyə görə təriflıməliyikmi? Ya əksinə, onu obyektə həqiqi bir adın necə veriləcəyini bilmədiyi üçün günahlandırmalıyıq? "Qırğını qarğaya dəyişmək" (ötəri mənfəət üçün üstünlüyünü əldən vermək) doğru olacaqmı? Qarğanı qırğıdan üstün tutduğu üçün tənqid olunacaqmı? Şübhəsiz ki, bu baxış bucağı məsələsidir ... Və qarğa / qırğı cütlüyünə verilən istinaddan asılı olaraq: nəzəri tərif / konkret izah? ya konkret izah / nəzəri tərif? ...

Xüsusi adın istinad funksiyası da problemi həll etmir. Baxmayaraq ki, xüsusi ad məna deyil, yalnız bir istinad mənbəyi ola bilər. Ancaq bu xarakter xüsusi adın yeganə gerçəyi deyil. Onsuz da Port-Royalın qrammatikləri eyni mexanizmi xüsusi adda və neytral işarə əvəzliyində görürdülər: hər ikisi deiktik rolunu oynayır və hər biri "*qarışıq düşüncə*" mənasını verir p. (11, s.162-163). Üstəlik, Jeyms Harris bir əsr sonra, xüsusi isimləri fərdi müraciət zamanı "*müəyyənedicilə*r"lə (əvəzlik və artikllər) müqayisədə dilin təsəvvür etdiyi "*ən zəif yaradıcı*" vasitə hesab edirdi, bu da o demək idi ki, istinad mənbəyi xüsusi isimi təyin edə bilməzdi. Əlbəttə, biz bilirik ki, bu yanaşmanı daha da təkmilləşdirmək və xüsusi isimə diektik və təsəvvür edilən sahə arasındakı keçid vəziyyəti tərifini verərək Xarrisin təklifini dəyərləndirmək mümkündür: "*Bizə elə gəlir ki, xüsusi ad digər iki dil arasında ara yeri tutan başqa bir dil sahəsindən ibarətdir: əslində xüsusi ad isimdir, lakin onun morfo-sintaktik, semantik və praqmatik funksiyası onu deyiktiklərə, məsələn, şəxs əvəzliklərinə yaxınlaşdırır. Düşünmək olar ki, elə dil xüsusiyyətlərini ümumiləşdirməyə və izah etməyə imkan verən də bu ara yerdir: hər bir fərdi şəxsiyyətinə və məkan-zaman davamlılığına görə təyin edən xüsusi ad, bir işarəni tək bir vahidin uyğun işarəsi edərək, təmsil etdiyi sahəni deiktik sahənin funksiyasına yaxın modallıqla istifadə edir*". Bununla birlikdə, əgər Port-Royal və Harris tərəfindən əvvəllər nəzərdə tutulan maraqlı bir yanaşma olsa da, xüsusi ada uyğun həqiqi bir tərif yoxdur, çünki kateqorik xüsusiyyətlər göstərilmir və ikisi üçün də ümumi olan bir elementə - deiktikə əsaslanılır.

Şübhəsiz, elə buna görə də - məntiqçilərin və dilçilərin səylərini qınamadan belə bir fikrə gəlmək olur – bu sahədə çoxlu yanaşmalar praqmatik olaraq qalır. Beləliklə, Benvenistə görə: "*Adətən xüsusi ad altında başa düşülən şey, davamlı və bənzərsiz tərzdə bir fərdi təyin edə bilmək qabiliyyətinə malik olan şərti sosial identifikasiya işarəsidir*" (2, s. 200). Tədqiqatlar zamanı E.Buyssensin pragmatizminə qarşı çıxan belə bir praqmatizmlə də qarşılaşırıq: "Əksinə, qeyd etmək lazımdır ki, xüsusi adın bir çox insan üçün ümumi ola biləcəyi də vurğulanmalıdır". Dükro və Todorovun da bu haqda fikirləri praqmatik olaraq qalır: "*Bu zaman müəyyən bir icma üçün xüsusi adın mənasını, bu adın daşıyıcısı ilə əlaqəli bir məlumat toplusunu, cəmiyyətin hər hansı bir üzvünün ən azı bir neçəsinə sahib olduğu düşünülən bir məlumat toplusu kimi hesab edə bilərik*" (6, s. 321). Bu nə deməkdir?- Xüsusi adın etimologiyanın təmin etdiyi orijinal mənasından kənar müəyyən bir məna kəsb etməsi və konvensiyaya söykənməsidirmi? Konvensiya müəyyən bir sosial qrupla məhdudlaşır: "Xüsusi adı xarakterizə edən şey, onun istifadəsinin sosial bir fakt və təqdimatla tənzimlənməsidir. Budur, biz, şübhəsiz ki, dil və ya məntiqi tərifdən uzaqlaşırıq, lakin, müəyyən bir reallığa yaxınlaşırıq ..."

Bu onomastiklərin davamlı qarşılaşdığı bir reallıqdır. Şübhəsiz bu yaxınlıq onu xüsusi adları müəyyən etməkdən daha çox izah etməyə vadar edir. Nəticədə, ona elə gəlir ki, bu adların mürəkkəbliyi təbiətindən daha çox tarixlərindədir. Bu təbiətin maraqlı olmamasından irəli gəlmir ... Ancaq onomastik tədqiqatlar tədricən onu ümumi adın təbiətinə endirir, çünki, əslində, xüsusi ad diaxronik olaraq mənası artıq başa düşülməyən bir ümumi addır: bu mənanı başa düşmək onu diaxronik olaraq həmişə olduğu kimi, törədiyi ümumi adın hesabına köçürməkdir: və bu mənanı anlamaq - məsələn, etiologiya da daxil olmaqla, digər məsələlərlə yanaşı - onomastiklərin payına düşür.

Nəhayət, bu işdə məsuliyyəti Volteri parodiya edərək onomastik senzuranın üzərinə qoymaq olarmı? Və « *Çox müdriklər xüsusi adın romanını yazdılar, yalnız tək bir müdrik ondan sadə tarix yaratdı*» mülahizəsini irəli sürmək olarmı ?

Onomastikanı müxtəlif yollarla dərk edilə bilməsi üçün müəyyən etmək və xüsusən də, Nouvelle Revue d'Onomastique tərəfindən tətbiq olunan standart formada araşdırmaq - bu iki müzakirə mövzusu bizə nominasiya sistemləri və onomastikanın gələcəyi ilə bağlı araşdırmaların xülasəsini verməyə imkan yaradır.

Onomastika haqqında bu qəbildən olan bütün belə sualların cavabını bu sahədə dərindən tədqiqatlar aparmaqla tapmağa çalışmaq lazımdır. Bu sahədə onomastikaya aid elmi mənbələr, o cümlədən 1960-cı ildə Albert Doza düşüncəsinin varisləri tərəfindən yaradılan Fransa Onomastika Cəmiyyətinin ildə iki dəfə nəşr edilən jurnalı (*Revue internationale d`onomastique*) tədqiqat mənbəyi kimi istifadə oluna bilər.

**Ədəbiyyat**


1. Beauzée M. Grammaire générale ou exposition raisonnée des élements nécessaires du language. Par M. Beauzée de la Société royale des sciences et arts de Metz, des Sociétés littéraires d'Arras et d'Auxerre, professur de grammaire à l'école royale militaire. Tom I, l'imprimerie J.Barbou, rue et vis à visla grille des Mathurins, -Paris, -1767, -p. 235-258.
2. E.Benveniste. Problèmes de linguistique générale, -Paris, Gallimard, -1976, II, -p. 200.
3. Buyssens E. Les noms singulier, Cahiers Ferdinand de Saussure, n° 28, Librairie Droz, -Paris, -1973, -p. 25.
4. Camproux C., Baylon C. et Fabre P. *Les Noms de lieux et de personnes*, -Paris, Nathan, -1982, -p. 16.
5. De Brosses. Traité de la formation méchanique des langues et des principes physiques de l'étymologie, -Paris, chez Saillant, Vincent et Desaint, -1765, -559 p.
6. Ducrot O. et Todorov T. *Dictionnaire encyclopédique des Sciences du langage*, -Paris, Seuil, -1972, -p. 321.
7. Dumarsais. *Œuvres complètes*, Tom IV, París, chez Furne, libraire-éditeur, Quai des Augustins, -1758, -p. 193 (900 p.)
8. W. Mańczak. *Le Nom propre et le nom commu.* Revue internationale d'onomastique, n° 3, -Paris, -1968, -p. 207-217.
9. Molino J.Le Nom propre dans la langue, Langages, n° 66, -Paris, -1982, -p. 5-20.
10. Kleiber G. *Problèmes de référence : descriptions définies et noms propres*, Klincksieck, -Paris, -1981, -538 p.
11. Pariente J.C. *L'Analyse du langage à Port-Royal*, Paris, Les Editions de Minuit, «Le sens commun», -1985, -p.162-163.
12. Polge H. Archéologie et toponymie : pour une prospection archéologique systématique du Gers. Bull. de la Soc. archéol., histor., litt. et scient. du Gers LIX, -Paris, -1958, -p. 631-637.
13. Revue internationale d'onomastique, n° 3, -Paris, -1968, -p. 33-54.
14. Revue internationale d'onomastique, n° 3, -Paris, -1968, -p. 205-218.
15. Revue internationale d'onomastique, n° 1, -Paris, -1975, -p. 49-52.
16. Sahlin G, César Chesneau. *Dumarsais et son rôle dans l'évolution de la Grammaire générale*, Les presses univesitares de France, -Paris, 49, Boulevard Saint-Michel, -1928,- 534 p.
17. New Comprehensive French-Russian Phraseological Dictionary. Moscow, Russian language, Media, -2005, -1624 p.
18. http:// journals.openedition.org/praxematique/1383.
19. https://turuz.com/book/title/Azerbaycan_Onomastikasi_Baki_1990_Kiril_91s


Göndərilib: 16.04.2021 Qəbul edilib: 21.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/75-85

**İradə Hətəm qızı Mirzəzadə**
AMEA Riyaziyyat və Mexanika İnstitutu
texnika üzrə fəlsəfə doktoru, dosent
irada811@gmail.com
**Gülçin Gülhüseyn qızı Abdullayeva**
AMEA İdarəetmə Sistemləri İnstitutu
fizika-riyaziyyat elmləri üzrə fəlsəfə doktoru, dosent
ag_gulchin@rambler.ru
**Həsənağa Rauf oğlu Nağızadə**
AMEA Riyaziyyat və Mexanika İnstitutu
dissertant
hasan.nagizada@yahoo.com

# TİBBİ İNFORMASİYA SİSTEMLƏRİNDƏ İSTİFADƏ OLUNAN RİYAZİ APARAT

***Açar sözlər:*** *bioloji sistem, biokibernetik məsələlər, differensial və inteqral tənliklər, riyazi model, Bayes metodu, süni neyron şəbəkələr*

## Mathematical machine usage in medical information systems

**Summary**

Biosystem of the human body is viewed as a whole. First of all adequate mathematical machine selection and class of biosystems needs to be assigned for creation of mathematical model of biological system. Biosystem has two types of appoach. One of them is supposed to be a simple approach, the other is likely to be very complex – indexed approach. Different biosystems with determination properties are usually described by differential and integral equations, linear and nonlinear algebra. In some cases, algebraic polynoms with timed argument are used for presenting determined biosystem dynamics. Adequate mathematical modeling machine, probability theory, Markov and random processes theory and the laws are applied for the description of likely characterized biosystems.

***Key words:*** *biosystem, biocybernetic issues, differential and integral equations, mathematical model, Markov chains, Bayes method, artifical neural networks*

## Giriş

Hələ 1964-cü ildə Norbert Viner biotexniki sistemlərin yaradılmasının vacibliyi haqqında yazmışdır (1). Bioloji sistemin riyazi modelinin yaradılması üçün ilk öncə adekvat riyazi aparat seçilməli, ən əsası biosistemin sinfi təyin edilməlidir. Biosistemin ümumi xassələrinin identifikasiyası tədqiq olunan göstəricilərə görə biosistemin işləməsinin təsvirini istiqamətləndirir. Determinə olunma xassələrinə malik olan müxtəlif biosistemlər adətən differensial və inteqral tənliklərin, xətti və qeyri-xətti cəbrin köməyilə təsvir edilir. Determinə olunmuş sistemlərin araşdırılması üçün cəbri metodlardan istifadə edilir. Determinə olunmuş biosistemlərin dinamikası adekvat olaraq qeyri-asılı dəyişən kimi zaman olan differensial və inteqral tənliklərlə göstərilir. Bəzi hallarda determinə olunmuş biosistemlərin təsviri üçün arqument şəklində zaman daxil olunmuş cəbri polinomlar istifadə edilir. Ehtimal xarakterli biosistemlərin işləməsinin təsviri üçün adekvat riyazi modelləşdirmə aparatı, ehtimal nəzəriyyəsi, markov və təsadüfi proseslər nəzəriyyəsi, ehtimal paylanma və qanunlarının təsviri üçün cəbri və differensial tənliklər tətbiq edilir. Ehtimal xarakterli biosistemlərin stasionar rejimi paylanma qanunlarını müəyyən edən cəbri ifadələrin, avto və qarşılıqlı korrelyasiya funksiyalarının, markov prosesləri və kütləvi xidmət nəzəriyyəsinin köməyilə araşdırılır. Qeyri-stasionar ehtimal xarakterli biosistemlərin araşdırılması təsadüfi proseslər nəzəriyyəsi, avtokorrelyasiya funksiyaları, markov prosesləri nəzəriyyəsi və avtomatlar nəzəriyyəsinin köməyilə aparılır. Qeyd etmək lazımdır ki, çox mürəkkəb ehtimal və ehtimal-determinə olunmuş biosistemlər üçün entropiya qiymətləndirilməsindən istifadə etmək olar. Beləliklə demək olar ki, eksperimental verilənlərin analizi biosistemlərin xassələrini aşkar etməli, bundan asılı olaraq biosistemin riyazi modelinin sintezi üçün adekvat riyazi aparat seçilməlidir. Biosistemin araşdırılmasının riyazi aparatının identifikasiyası elə biosistemin özünün vasitəsilə həll olunur. Şək.1-də tədqiq olunan biosistemin parametrlərinin riyazi emalından öncə istifadə olunacaq riyazi aparatların sxemi verilmişdir.




**Şək.3.1.** Riyazi aparatın struktur sxemi

Biotibbi siqnalların və verilənlərin böyük sayda emal metodları mövcuddur:

- verilənlərin təsnifatı;
- verilənlərin mənbəyi və xarateristikaları;
- eksperimentdə verilənlərin ümumi xarakteristikası və modelləri;
- zaman sıraları və markov zəncirləri nəzəriyyəsi;
- verilənlərin həndəsi modeli;
- obrazların identifikasiya və tanınması;
- verilənlərin statistik analiz metodları;
- qeyri-parametrik analiz metodları;
- çoxölçülü müşahidələrin təsnifatı;
- çoxölçülü verilənlərin qarşılıqlı əlaqəsinin tədqiqat metodları,
- təsvir fəzasının kiçiltmə metodları;
- informasiya verilənlərinin analizi zamanı alternativlərin seçimi;
- biotibbi təsvirlərin anaizinin əsası və s.

Biosistemin analizi üçün ilk növbədə bu və ya digər riyazi aparatın seçilməsi əsaslandırılmalıdır (2). Bioloji sistemin optimal xarakteristikasının həll problemi verilənləri adekvat təsvir edən riyazi aparatın seçilməsilə yerinə yetirilir. Bu məsələnin həlli ilkin informasiyanın xüsusiyyətinə əsaslanan biokibernetik məsələlərin təsnifatının aparılmasını nəzərdə tutur. Biokibernetik məsələlərin təsnifatının əsasını sistemin mürəkkəbliyi və səviyyəsinin kəmiyyət qiymətləndirilməsi təşkil edir. Mürəkkəbliyə görə identifikasiya sistemin maksimum mürəkkəbliyinin ədədi qiyməti ilə təyin edilir:

$$H_{max} = \log m, \qquad (1.1)$$

harada m – sistem tərəfindən qəbul edilən mümkün vəziyyətlərin miqdarıdır.

Bu zaman sistemin:

- vəziyyəti 8-ə qədər olduqda $0 < H_{max} \leq 3$ sadə,
- vəziyyəti 128-ə qədər olduqda $3 < H_{max} \leq 6$ mürəkkəb,
- 128-dən çox olduqda $H_{max} > 6$ çox mürəkkəb kimi qiymətləndirilir.

$H_{max}$ kəmiyyəti sistemin təşkilinin hesablanmasında maksimal qeyri-müəyyənlikdir. Əgər sistemin hər bir vəziyyətinin $p_i$ ehtimalını hesablamaq mümkündürsə onda sistemin işləməsinin qeyri-müəyyənliyi aşağıdakı kimi hesablanır:

$$H = -\sum_{i=1}^{m} p_i \log p_i . \qquad (1.2)$$

Daha sonra nisbi təşkil olunma hesablanır:

$$R = 1 - \frac{H}{H_{max}} . \qquad (1.3)$$

Nisbi təşkil olunmaya əsasən bütün sistemlər 3 qrupa bölünür:

➢Əgər $0 < R \leq 0.1$, onda biosistem ehtimal xarakterli olub az sərtliyə malik olur, öz vəziyyətlərinin paylanma qanunu dəyişə bilmək qabiliyyətinə malik olur.

➢Əgər $0.3 < R \leq 1$, onda bioloji sistem baxılan göstəriciyə görə determinə olunandır. Bu sistemlərə daxili orqanların idarəetmə biosistemləri, daxili mühitin parametrlərinin sabitliyini təmin edənlər aiddir.

➢Bu iki tip bioloji sistemlər, yəni həm determinizm, həm də ehtimal xarakterli olanlar arasında hər iki xüsusiyyəti birləşdirən böyük biosistem qrupu vardır. Onlarda nisbi təşkil olunmanın qiyməti $0.1 < R \leq 0.3$. Bu sistemlər ehtimal-determinə olunmuş və ya kvazideterminə olunmuş adlanır. Bu cür sistemlərə daxili mühitin göstəricilərinin idarə edilmə sistemləri aiddir.

Hər üç sistem arasında biosistemlərlə əlaqədar olaraq kəskin sərhəd yoxdur, çünki nisbi təşkil olunma səviyyəsinin qiyməti biosistemin daxili vəziyyətindən və ona təsir edən xarici siqnallardan asılı olaraq dəyişə bilər.

Sistemin mürəkkəbliyi və nisbi təşkil olunması öz aralarında xətti asılılıqda deyildir. Onlar biosistemin müxtəlif cəhətlərini xarakterizə edirlər (***$H_{max}$*** – vəziyyətlərin sayı, ***R*** – bu vəziyyətlərin sistem tərəfindən qəbul edilməsinin təşkili). Bunlar əsasında aşağıdakı təsnifat diaqramını qurmaq olar (şək.2).




Diaqramda aşağıdakı biosistemlər göstərilmişdir:

➢11 – sadə determinə olunmuş;
➢12 – sadə ehtimal-determinə olunmuş;
➢13 – sadə ehtimal;
➢21 – mürəkkəb determinə olunmuş;
➢22 – mürəkkəb ehtimal-determinə olunmuş;
➢23 – mürəkkəb ehtimal;

- 31 – çox mürəkkəb determinə olunmuş;
- 32- çox mürəkkəb ehtimal-determinə olunmuş;
- 33- çox mürəkkəb ehtimal.

Qeyd etmək lazımdır ki, determinə olunmuş sistemlər statik və dinamik, ehtimal xarakterli isə stasionar və qeyri-stasionarlara bölünür (3).

**Metodlar.** Prosesin bəzi hallarda sadə, bəzi hallarda isə çox mürəkkəb olduğunu nəzərə alaraq bu riyazi aparat və metodlardan istifadə etmək olar.

**Bayes metodu.** Biosistemin ehtimal xarakterli olması zamanı qərar qəbul etmək üçün istifadə olunan metodlardan biri Bayes metodudur. Bayes metodunun seçilməsi onun riyazi əsaslandırılması diaqnostika məsələlərinin və biliklərin testləşdirilməsi ilə bağlıdır. Qərar qəbul edilməsinin subyektiv Bayes metodu hər hansı bir hadisənin insan tərəfindən verilmiş qiymətə əsasən ehtimalıdır, bu, əlavə məlumat aldıqda dəyişə bilər. Bayes metodunun riyazi əsasını Bayes teoremi təşkil edir.

**Teorem.** Fərz edək ki, $H_1, H_2, ..., H_n$ – cüt-cüt bir-birinə uyğun gəlməyən hadisələr çoxluğudur, bu hadisələrdən biri mütləq baş verir, və $S$ $P(S)>0$ ehtimallı hadisədir. Onda $S$-in baş verməsinin $H_i$ ehtimalı aşağıdakı düsturla tapılır:

$$P(H_i/S) = \frac{P(S/H_i)P(H_i)}{\sum_{j=1}^{n} P(S/H_j)P(H_j)} \qquad (1.4)$$

Aşağıdakı terminologiya qəbul edilmişdir: hadisələr $H_i$ hipotez adlanır, $P(H_i)$ – hipotezlərin aprior ehtimalı, $P(H_i/S)$ – hipotezlərin aposterior ehtimalı, S hadisəsi - əlamət (simptom), $P(S/H_i)$ – S simptomunun $H_j$ hipotezlərinin təsdiqi ehtimalı.

Fərz edək ki, $H$ – hipotez, $S$ isə simptomdur. $H$ və $\sim H$ hadisələrinə baxaq. Onlar uyğun gəlmir və tamdırlar. S simptomun varlığı, $\sim S$ simptomun inkarı deməkdir. Onda Bayes teoreminə görə

$$P(S/H) = \frac{P(S/H)P(H)}{P(S/H)P(H) + P(S/\sim H)P(\sim \mathrm{H})}, \qquad (1.5)$$

$$P(H/\sim S) = \frac{P(\sim S/H)P(H)}{P(\sim S/H)P(H) + P(\sim S/\sim H)P(\sim H)} \qquad (1.6)$$

Aşağıdakı işarələri qəbul edək

$$P^+ = P(S/H), \quad P^- = P(S/\sim H),$$
$$P(\sim H) = 1 - P(H), \qquad (1.7)$$

Onları nəzərə alsaq

$$P(\sim S/H) = 1 - P(S/H), P(\sim S/\sim H) = 1 - P(S/\sim H) \qquad (1.8)$$

olduqda

$$P(H/\mathrm{S}) = \frac{P^+P(H)}{P^+P(H) + P^-(1 - P(H))}, \qquad (1.9)$$

$$P(H/\sim S) = \frac{(1 - P^+)P(H)}{1 - P^+P(H) - P^-(1 - P(H))} \qquad (1.10)$$

Əgər hər bir simptom üçün “Hə - Yox” cavabları mümkündürsə, onda $2^k$ qədər cavablar ardıcıllığı vardır, bunlar müxtəlif hesablama trayektoriyaları verirlər. Əgər cavablandırdıqda ehtimal artırsa (azalırsa) onda verilən hipotezin maksimal (minimal) $P_{max}(H)$ ($P_{min}(H)$ ehtimalına gətirib çıxaran trayektoriya əldə olunancaqdır. Maksimal və minimal ehtimal əsasında hər bir hipotez üçün yuxarı və aşağı sərhəd qiymətləri qoymaq olar. Məsələn, yuxarı ($M_1(H)$) sərhəd kimi 0,8-ə vurulmuş maksimal ehtimal qiyməti və aşağı sərhəd kimi ($M_2(H)$) 0,2-yə vurulmuş maksimal ehtimal götürülə bilər.

Əgər hesablama trayektoriyasının qiyməti yuxarı sərhədi aşırsa, hipotez qəbul edilmiş, əgər hipotezin ehtimal qiyməti aşağı sərhəddin qiymətindən azdırsa rədd edilmiş hesab edilir. Beləliklə, bütün hesablama trayektoriyaları üç sinif trayektoriyalara bölünür: hipotezin qəbul edilməsi, rədd edilməsi və qeyri-müəyyənliyi (4). Şək.3. -də qərar qəbul etmənin trayektoriyaları göstərilmişdir.




**Şək.3.** Bayes üsulunda qərar qəbul etmənin mümkün trayektoriyaları

**Neyron şəbəkə.** Süni neyron şəbəkələr canlı orqanizmlərin sinir sisteminin işləməsi haqqında biliklər əsasında yaranmışdır. Istənilən neyron şəbəkə biliklərin təsviri üçün sərbəst sistem şəklində istifadə olunur, bu bir qayda olaraq idarəetmə sisteminin bir komponenti və ya qərar qəbul edilməsinin bir modulu kimi iştirak edir. Şəbəkənin yerinə yetitrdiyi funksiyaları bir neçə əsas qruplara bölmək olar:

- approksimasiya və interpolyasiya;
- obrazların tanınması və təsnifatı;
- verilənlərin sıxılması;
- proqnozlaşdırma;
- identifikasiya;
- idarəetmə;
- assosiasiylar (5).

Bunların hər birində neyron şəbəkə bir neçə dəyişənin funksiyasının approksimatoru kimi rol oynayır və $y=f(x)$ funksiyasını realizə edir, harada $x$ – giriş vektoru, $y$ – bir neçə dəyişənin vektor funksiyasının realizasiyasıdır. Süni neyronu şək.3.4-də kimi təsvir etmək olar.




**Şək. 4.** Süni neyron

Neyron şəbəkələrin böyük potensiala malik olan əsas funksiyası bütün neyronlar tərəfindən informasiyanın paralel emalıdır. Bu xüsusiyyətə əsasən böyük saylı neyronlararası əlaqələrin nəticəsində informasiyanın emalı prosesi sürətlənir.

Neyron şəbəkənin digər əsas xüsusiyyəti öyrənmə və alınmış biliklərin ümumiləşdirilməsidir (6). Şəbəkə süni intellekt cəhətlərinə malikdir. Süni neyron şəbəkələr çoxlu əlaqəli böyük miqdarda paralel işləyən sadə prosessorlardan ibarət hesablama sistemidir. Onlar təcrübə, ümumiləşdirilmə, izafi məlumatdan mühüm verilənlərin çıxarılması kimi xüsusiyyətlərə malikdir. Öyrədilmə zamanı qoyulan məsələnin effektiv həlli üçün şəbəkənin arxitekturasının (neyronlar arasında əlaqələrin strukturu) və neyronların çəkilərinin seçilməsi

yerinə yetirlir. Hər hansı bir alqoritmə əsasən öyrədilməyə görə şəbəkə giriş siqnallarına qarşı daha yaxşı reaksiya verir (7).

Bu gün müxtəlif funksiyaları yerinə yetirən müxtəlif konfiqurasiyalı çoxlu miqdarda neyron şəbəkələr mövcuddur. Məsələn, çoxlaylı tam əlaqəli neyron şəbəkə obrazların qanunauyğunluqlarının və təsnifatının axtarılması üçün geniş istifadə olunur. Ən geniş yayılmış neyron şəbəkə arxitekturaları çoxlaylı perseptron, ümumi reqressiyalı neyron şəbəkə, Koxonen neyron şəbəkəsi və s.-dir.

Artıq bu gün süni neyron şəbəkələri bir sıra sahələrdə istifadə olunur. Onların istifadəsi məsələnin təbiətindən irəli gəlir. Giriş verilənlərinin və onlar arasında əlaqələrin çoxluğu şəraitində düzgün qərar qəbuletmə baxımından diaqnostika prosesində, o cümlədən tibbi diaqnostikada süni neyron şəbəkələri son zamanlar geniş istifadə olunur (8).

Tibbi praktikada həkim-diaqnostlar predmet sahəsini təsvir edən xarakteristikalar yığımı əsasında qərar qəbul edirlər. Bu xarakteristikalar formalizə olunmuş parametrlər kimi neyron şəbəkənin giriş qiymətləri şəklində istifadə oluna bilər. Neyron şəbəkənin çıxış qiyməti bu halda müəyyən xəstəliyin olması haqqında diaqnozun qoyuluşu kimi istifadə olunur. Adətən həkim problemi xarakterizə edən bir neçə on, yüz parametrlərlə əməliyyat aparır. Onlar ilkin parametrlər kimi təcrübə və bilik əsasında emal olunaraq diaqnoz qoyulur. Giriş və çıxış parametrləri müəyyən edildikdən sonra öyrətmə seçimini hazırlamaq lazım gəlir. Öyrətmə seçimi neyron şəbəkənin proqramçısı ilə həkim-diaqnostun müştərək işinin nəticəsi olur. Son məsələ perseptronu layihələndirərək öyrətmə vasitəsilə ona bilik və təcrübənin ötürülməsindən ibarətdir. Nəticədə perseptron öyrətmə seçiminin istənilən vektorunu nəticə vektoruna çevirməyi bacarmalıdır. Yeni giriş vektoru ilə xarakterizə olunan yeni vəziyyət yarandıqda perseptron onun üçün düzgün diaqnozdan ibarət olan yeni nəticə vektorunu artıq həkimin köməyi olmadan hesablamalıdır (9).

Süni neyron şəbəkələrinin tibbi diaqnostikada bəzi tətbiq sahələrini misal göstərmək olar: flüorestent spektrlərin analizinin köməyilə aterosklerotik piləklərin aşkar olunması; periferik damarların xəstəliklərinin diaqnostikası, miokard infarktının diaqnostikası, akustik siqnalların analizinin köməyilə ürəyin qapaqcıqlarının küylərinin diaqnostikası; psixi simptomların tanınması və s.

Neyroşəbəkə yanaşması çox vaxt statistik metodlarla müqayisə olunur. Lakin praktikada rast gələn verilənlər qeyri-xətti olduqları üçün neyron şəbəkələrdən istifadə olunur. Onlar bu cür verilənlərin emalı zamanı statistik metodlara nisbətən üstünlüklərə malikdirlər. Neyron şəbəkə giriş verilənlərinin ölçü fəzasını azalda bilir, bu zaman ən mühümləri seçilə bilər. Buna baxmayaraq statistika və neyron şəbəkə texnologiyaları bir-birini tamamlamalıdırlar.

Neyron şəbəkədə məsələnin həll üsulu haqqında biliklər öyrətmə prosesində toplanaraq neyronlar arasında sinaptik çəkilərdə yadda saxlanır (10). Sinaps neyron şəbəkədə siqnalların ötürüləməsini təmin edir. Diaqnostika məsələlərində cəld işləyən sistemlər yaratmaq lazım gəlir. Süni neyron sistemlərin bu cür tanıma rejimində çox cəld işlədiklərindən belə sistemlərin yaradılmasında onların nəzəri və praktiki əsası vardır. Neyrona giriş siqnlları daxil olur, onlar digər neyronların çıxış siqnallarıdır. Hər bir giriş siqnalı əlaqənin uyğun çəki əmsalına vurulur. Əlaqələrin çəkisi ilə giriş siqnalları cəmləmə blokuna daxil olur. Neyronun çıxış siqnalı aktivləşmə funksiyasının köməyilə müəyyən edilir. Aktivləşmə funksiyalarından məntiqi, artan xətti, eksponensial, siqmoidal geniş yayılmışdır. Verilənlərin şəbəkədə konkret çevrilməsi onun arxitekturası, neyronlararası əlaqənin topologiyası, şəbəkənin öyrədilmə üsulları, neyronlar arasında rəqabətin olub-olmaması, neyronlar arasında informasiyanın ötürülməsi ilə əlaqədardır.

Son zamanlar süni neyron şəbəkələrini ekspert sistemləri ilə birləşdirmək üçün cəhdlər göstərilir. Bu cür sistemlərdə süni neyron şəbəkə nisbətən sadə hallara reaksiya verir, qalan hallar isə ekspertlərin ixtiyarına verilir. Nəticədə mürəkkəb vəziyyətlər daha yüksək səviyyədə öz həllini tapır. Məsələn, tibbi diaqnostikada neyron şəbəkənin ekspert sistemi ilə birlikdə istifadə olunmasına aid misal «NeyroProyekt” şirkətinin südəmər körpələrdə eşitmənin obyektiv diaqnostikasıdır. Diaqnostikanın metodikasına görə səs həyəcanlandırıcısı beynin reaksiyasını qeydə alır. Bu elektroentsefaloqramlarda özünü göstərir. Təcrübəli ekspert uşağın eşitməsini yoxlamaq üçün 2000 test aparmalıdır, neyron şəbəkə isə həmin dürüstlüklə mütəxəssisin iştirakı olmadan bir neçə dəqiqə ərzində 200 müşahidə əsasında eşitmə səviyyəsini müəyyən edir (11).

Tibbi diaqnostikada neyron şəbəkələrinin tətbiqinin müxtəlifliyi predmet sahəsinin spesifikliyi ilə bərabər çəki funksiyalarının spesifikliyi, neyron şəbəkənin öyrədilməsinin modifikasiyası ilə əlaqədardır (12). Neyron şəbəkənin öyrədilməsi xüsusi konstruktiv alqoritmin köməyilə yerinə yetirilir.

**Zaman sıraları metodu.** Yeni kompüter texnologiyalarının əhalinin sağlamlığının mühafizəsi sahəsində müasir proqram və verilənlərin analizi metodlarının istifadəsi, xüsusilə sağlamlığa ətraf mühitin zərərli amillərinin təsiri şübhə doğurmur. Hal-hazırda ətraf mühit və sağlamlıq haqqında verilənlərin emalı üçün statistik metodlardan biri kifayət qədər incə məqamları araşdıran zaman ardıcıllığının analizidir. Bu metod

əsasən ətraf mühitin çirklənməsi ilə əhalinin sağlamlığı arasında əlaqənin analizi üçün çox münasibdir. Zaman sırası təsadüfi kəmiyyət və ya prosesin müşahidələrinin zaman boyunca nizamlanmasıdır. Bu ədədlər sırası müəyyən zaman anında müşahidə olunan təsadüfi kəmiyyətin qiymətini verir. Bir qayda olaraq zaman anları bir-birlərindən bərabər ayrılaraq saat, gün, ay, il kimi qiymətlərdən ibarət ola bilər. Sıranın elementlərinin nizamlanması müşahidələr məcmuyunun əsas xassəsi kimi onu təsadüfi sadə qiymətlər yığımından fərqləndirir və əlavə qiymətli nəticələr əldə etməyə imkan verir (13, 14).

Zaman sırası iki tip verilənlərdən ibarətdir: kəsilməz verilənlər, ixtiyari zaman anında müşahidə olunan kəmiyyətin qiymətini almağa imkan verir; diskret verilənlər müəyyən zaman anlarında müşahidə olunan kəmiyyətin qiymətini almağa imkan verir.

Adətən zaman sıraları fərdi deyil, zaman boyunca bərabər paylanmış sonlu nöqtələr çoxluğu kimi olur. Məsələn, gündəlik müraciətlərin sayı, konsentrasiyaların orta qiymətləri və s. Zaman sırası hər hansı bir dəyişənin, həmçinin bir neçə dəyişənlərin zaman ərzində qiymətləridir (məs. zəhərlərin konsentrasiyası, havanın temperaturu, qıc olmaların sayı, taxikardiya və s.). Bu cür zaman sıraları çoxölçülüdür.

Çoxölçülü zaman sıralarını öyrənməklə ayrı-ayrı dəyişənlərlə bərabər onların bir-birinə təsirini araşdırmaq olar.

Sadə halda qeyri-asılı $X_i$ kəmiyyəti ətraf mühitin zərərli amillərini ifadə edirsə, Y – təsir nəticəsidir. Onda bunlar arasında reqressiya əlaqəsi yaratmaq olar. Bunu zaman ardıcıllığı olduqda da yerinə yetirmək olar. Çoxölçülü zaman sıraları üçün ümumi reqressiya tənliyi aşağıdakı kimidir:

$$E(Y) = a_0 + \sum(a_i f_i(X_i)) + \varepsilon, \qquad (1.11)$$

harada $Y$ – təsirin miqdari nəticəsi;
$X_i$ – mühitin amilləri;
$i$ – mühitin amilinin (cari nömrə) indeksidir, i=1,2,..., n;
$n$ – amillərin sayıdır;
$E, f_i$ – sıranın əlaqə və çevrilmə funksiyalarıdır;
$a_0, \ldots, a_i$ – meyl əmsallarıdır (ilkin qiymətlər);
ε – qalıq (metodun xətası).
Məsələ tənlikdə $a_i$ əmsallarının müəyyən edilməsidir.

$E$ funksiyası asılı dəyişənin paylanma növü ilə müəyyən olunur. $f_i$ funksiyası meyllərin təsirinin aradan qaldırılması üçün filtrlərdir. Filtrin məqsədi $x$–in dəyişməsi zamanı y-in dəyişməsinin daha aydın göstərilməsini təmin etməkdir. Filtrasiya üçün bir neçə metodlar tətbiq olunur. Orta qiymət, sadə sürüşən orta qiymət və s. Zaman sıralarının analizinin aparılması zamanı filtrasiya prosedurası reqressiya modelinin qurulmasından qabaq tətbiq olunur. Filtrasiya həm $y$, həm də $x$ sırası üçün aparıla bilər. Əsas məsələ filtrasiya apardıqda lazımi statistik informasiyanın nəzərdən qaçırılmamasıdır. Bunun üçün sıraların müxtəlif hamarlama prosedurası yerinə yetirələrək müqayisə nəticəsində korrelyasiya analizinin köməyilə ən yaxşı variantlar seçilir. Daha sonra reqressiya modeli qurulur. Modelin keyfiyyəti qalıqların analizi əsasında qiymətləndirilir. Bunun üçün qalıqların qrafikinin normal paylanma qrafikinə uyğunluğu yoxlanılır.

Zaman sıralarının spesifikliyinə görə onların analizi üçün müəyyən metodika tətbiq olunur. Hər bir yeni məsələ həlli üçün zaman sıralarının analizi metodu çərçivəsində onun həll edilməsi metodikasının adaptasiyası aparılır.

Zaman sıraları metodu ətraf mühitin çirklənməsi ilə sağlamlıq arasında asılılığın yoxlanılması, epidemioloji tədqiqatlarda, koqort tədqiqatlarda, yəni müəyyən bərabər zaman anlarından bir müşahidələrin aparılması və s. tədqiqatlar həm fərdi, həm də qrup səviyyəsində aparıla bilər. Ümumiləşdirərək demək olar ki, zaman sıraları metodu müşahidələr və nəticələrin fiksə edilməsi bərabər zaman anlarında bir aparılan istənilən tədqiqatlarda istifadə oluna bilər.

Reqressiyanın öyrənilməsi zamanı

$$Y = a + b_1x_1 + b_2x_2 + \cdots + b_qx_q + \varepsilon \qquad (1.12)$$

modelindən istifadə olunur. Bu zaman $Y$ dəyişəni kəsilməz olub $x_i$ qeyri-asılı dəyişənləri və $b_i$ əmsalları çərçivəsində $Y$-n qiymətlərini təyin etməyə imkan verir. Bəzən $Y$ kəsilməz deyil, iki qiymət ala bilən funksiya da ola bilər. Vahid hər hansı hadisənin olması, sıfır isə hadisənin realizə olunmamasını göstərir. Riyazi olaraq

$$p = \begin{cases} P(Y = 1) \\ P(\text{"Hadisə baş verib"}) \end{cases}$$

Bu halda $p$ kəmiyyəti qiymətləndirilməlidir və $Y$-ə təsir edən amillər müəyyən edilir. Model bir qeyri-asılı dəyişən üçün

$$p = a + b_1 x_1 \qquad (1.13)$$

kimi müəyyən olunur. Bu modelin yararsızlığı $p$-nin (0,1) intervalında sol tərəfin istənilən qiymət ala bilməsidir. Aşağıdakı şəkildə də model istifadə oluna bilər:

$$p = e^{a+b1x1} \qquad (1.14)$$

Lakin bu modelin sağ tərəfi həmişə müsbət qiymətlər verəcəkdir. Bu məhdudiyyətin aradan qaldırılması üçün aşağıdakı model tətbiq olunur

$$p = \frac{e^{a+b_1x_1}}{(1+e^{a+b_1x_1}}. \qquad (1.15)$$

Bərabərliyin sağ tərəfində olan ifadə məntiqi funksiya adlanır. Riyazi çevrilmələr nəticəsində aşağıdakı ifadə alınır:

$$\ln\left[\frac{p}{1-p}\right] = a + b_1 x_1. \qquad (1.16)$$

p/(1-p) kəmiyyətinə "müvəffəqiyyət şansı" deyirlər. Bu səbəbə görə $p$-nin modelləşdirilməsi xətti reqressiya modelinə ekvivalentdir. Asılı və qeyri-asılı dəyişənlər arasında əlaqənin analizi statistik modelin köməyilə aparıldıqda məntiqi reqressiya adlanır.

**Analiz.** Alınan məlumatların planlaşdırılması və adekvat analizi aparılan araşdırmaların əsas hissəsini təşkil edir, statistik metodlar isə bunun üçün tətbiq olunan riyazi aparatdır (15). Biostatistika kliniki eksperimentlərin aparılması üçün statistik testlər, proseduralar çoxluğudur.

Tibbi eksperimentin statistik analizini aparmaq üçün aşağıdakılar lazımdır:

1. Aparılan eksperimentin əsas məqsədi üçün hipotezi irəli sürmək;
2. Eksperimental müşahidənin aparılma strategiyasını seçmək;
3. Asılı dəyişənləri müəyyən etmək;
4. Qeyri-asılı dəyişənlərin sayını müəyyən etmək;
5. Asılı və qeyri-asılı dəyişənlərin mahiyyətini (kəsilməz, sıra ilə, nominal) müəyyən etmək;
6. Statistik sxemlər əsasında statistik əhəmiyyət kriterisinin müəyyin edilməsi və təxmini qiymətləndirilməsi üçün statistik proseduranın seçilməsi;
7. $H_0$ sıfrıncı hipotezin və $H_A$ alternativ hipotezi formalaşdırmaq ($H_A$ tədqiq olunanlar arasında əlaqələrin olmamasını göstərir, $H_0$ tədqiq olunanlar arasında əlaqənin olmasını göstərir)
8. Öncədən qiymətləndirmə - burada aparılan tədqiqatlar nəticəsində alınmış verilənlərin ümumiləşdirilməsi üçün hansı ölçmələrin aparılması müəyyən edilir.
9. Nəticə və ya statistik əhəmiyyətliliyin yoxlanılması. Statistik əhəmiyyətlilik üçün testin tətbiqi. Əgər testin əhəmiyyəti ($p \leq 0.05$), onda $H_0$ rədd edilir, $H_A$ tətbiq olunur. Müxtəlif vəziyyətlərdə müxtəlif testlər tətbiqi edilir (Styudent, Fişer və s.) (16).

3-cü bənddən başlayaraq 9-cu bəndə qədər olan mərhələlərin yerinə yetirilməsi statistik sxemin yaradılması deməkdir.

Yeni emal metodları ilə təmin olunmuş müasir riyazi və statistik paketlərin yaradılması bu metodların tibbdə istifadə dairəsini genişləndirdi. Bu zaman əsas istiqamət olan diaqnostika və müalicənin qiymətləndirilməsi üçün yeni metodlarla yanaşı göstəricilərin informativliyinin qiymətləndirilməsinə yeni baxış imkanı əldə edildi. Müasir tədqiqatlarda öyrənilən əlamətlər siyahısına praktiki olaraq istifadəçinin imkanı dairəsində bütün klinik və laborator göstəriciləri daxildir. Məsələn, (Buccheri, Ferrigno, 1994) işlərində ağ ciyər xərçənginin 200 klinik və laborator göstəricilərinin proqnostik əhəmiyyətini qiymətləndirmək lazım gəlmişdir. Bu cür informasiya həcmi üçün əsasən çox parametrli verilənlərin emal metodları istifadə olunur.

Göstəricilərin zaman ərzində dəyişməsinin aşkar edilməsi üçün avtokorrelyasiya funksiyasından, parametrik, qeyri-parametrik statistik meyarlardan istifadə edilə bilər. Avtokorrelyasiya funksiyası zaman sırasında göstəricinin qiymətlərinin zaman intervalından asılı olaraq arasındakı əlaqəni xarakterizə edir. Cüt avtokorrelyasiya əmsalları aşağıdakı kimi təyin edilir:

$$K_{y(t)} = \frac{\sum_{i=1}^{n}\left[y_i(t)y_i(t+\tau)\right] - n\overline{y}(t)\overline{y}(t+\tau)}{\sqrt{\left[\sum_{i=1}^{n} y_i^2(t) - n\overline{y^2}(t)\right]\left[\sum_{i=1}^{n} y_i^2(t+\tau) - n\overline{y}^2(t+\tau)\right]}}, \quad (1.17)$$

harada $y_i(t)$ – $t$ zamanında göstəricinin qiyməti;
$Y_i(t+\tau)$ - $(t+\tau)$ zamanında göstəricinin qiyməti, yəni zamanın τ qədər sürüşməsi olduqda;
$Y(t)$ və $y(t+\tau)$ – $t$ və $t+\tau$ zamanlarında göstəricinin orta qiyməti;
$n$- göstəricinin cüt qiymətlərinin sayı.

Avtokorrelyasiya əmsallarının qiymətləri göstəricinin cüt qiymətlərinin sayı çoxaldıqca daha da artır, yəni müşahidənin davam etməsi uzandıqca artır. Göstəricinin qiymətləri arasında əlaqə və əlaqənin əhəmiyyəti avtokorrelyasiya əmsalının qiyməti və işarəsinə görə təyin edilir. Əmsalın müsbət qiyməti əlaqənin düz, mənfi qiyməti isə əks olduğunu göstərir. Əmsalın qiyməti:
- <0,3- əlaqə zəif;
- 0,3-0,7 - əlaqə normal;
- >0,7 - əlaqənin güclü olduğunu bildirir.

Cüt avtokorreyasiya əmsalları ilə yanaşı parsial (xüsusi) avtokorrelyasiya əmsalından istifadə etmək olar. Bu əmsal zaman intervalları ilə ayrılmış qiymətlər arasında əlaqənin qiymətlərini daha dəqiq göstərir. Onda bu funksiya cüt avtokorrelyasiya əmsalları ilə ayrı-ayrı zaman sıralarında diaqnostikanı tamamlayır.

Göstəricilər arasında zaman intervalları boyunca dəyişikliklərin olmasını qiymətləndirmək üçün parametrik və qeyri-paramerik statistik meyarlardan istifadə edilir. Lakin parametrik meyarlardan istifadə edilməsinə gəldikdə göstəricinin paylanmasının dəqiqləşdirilməsi və göstəricilərin qiymətlərinin zaman ərzində neçə dəfə ölçülməsi qabaqcadan naməlum olduğu üçün qeyri-parametrik üsullardan istifadə edilməsi məqsədəuyğundur. Həmçinin monitorinq zamanı hər hansı göstəricinin dəyişməsi qənaətbəxş olduqda lüzumsuz yoxlamalara ehtiyac olmur. Bu səbəbdən göstəricilərin neçə dəfə yoxlanmasını qabaqcadan proqnoz etmək olmur. Göstəricinin dəyişməsinin dürüstlüyünün yoxlanması üçün qeyri-parametrik metod olan Manna-Uitni, Vilkokson, Fridman, Kraskal-Uollisin meyarlarından istifadə edilməsi məqsədə uyğundur (17). İlk növbədə 0-cı hipotez irəli sürülür. Daha sonra göstəricilərin müqayisə nəticələrinin qiymətləndirilməsi üçün meyarların xüsusiyyətləri nəzərə alınmaqla onlardan hər hansı biri tətbiq edilir:

1.**Manna-Uitni U-meyarı** asılı olmayan göstəricilər arasında fərqin qiymətləndirilməsi üçün istifadə olunur. Adətən kiçik seçmələr üçün tətbiq edilir. Bu meyarın tətbiq olunması üçün hər hansı bir əlamətə görə müqayisə olunan seçmələr yeganə ranqlanmış sırada əlamətin artma istiqamətində təsvir olunur. Ən kiçik qiymət kiçik ranqlı olur. Ümumi ranqların sayı:

$$N = n_1 + n_2,$$

harada $n_1$ - birinci seçmənin sayı, $n_2$ - ikinci seçmənin sayıdır.

Ranqlanmış sıra iki hissəyə bölünərək birinci seçmənin ranqları cəmi hesablanır, analoji olaraq ikinci sırada da hesablama aparılır. İki ranq cəmindən ən böyüyü ($T_x$) müəyyən olunur. O, $n_x$ seçməsinə uyğun gəlir. Manna-Uitni meyarı aşağıdakı düsturla müəyyən olunur:

$$U = n_1 \cdot n_2 + \frac{n_x \cdot (n_x + 1)}{2} - T_x. \quad (1.18)$$

$n_1$ və $n_2$ üçün meyarın kritik qiyməti tapılır. Əgər $U$ alınmış qiymət cədvəldəki qiymətdən kiçik və ya bərabərdirsə baxılan seçmələrdə öyrənilən əlamətin səviyyəsi arasında əhəmiyyətli fərq olduğu aşkar olunur. Əgər $U$ qiyməti cədvəl qiymətindən böyükdürsə 0-cı hipotez qəbul edilir. Fərqlərin dürüstlüyü $U$-nun qiyməti az olduqca artır.

2.**Vilkoksonun T-meyarı** müalicədən əvvəl və sonra alınmış əlaqəli göstəricilər arasında fərqlərin qiymətləndirilməsi üçün istifadə olunur. Bu meyar ranqlara əsaslanır. Hər hansı bir əlamətin cüt fərqi kimi ranqlara bölünür. Müsbət və mənfi fərqlər (işarədən asılı olmadan) artan istiqamətdə bir sıraya düzülür. Mütləq qiymətcə ən kiçiyi birinci ranqlı olur. Ayrıca müsbət və mənfi fərqlərin cəmi hesablanır, işarə nəzərə alınmadan cəmlərdən ən kiçiyi (T) verilən meyarın statistikası üçün istifadə olunur. Əgər hesablanmış qiymət kritik qiyməti aşarsa 0-cı hipotez qəbul edilir.

3.**Fridman meyarı** eyni bir seçmədə zaman ərzində təkrar ölçülmüş göstəricilər arasında yaranmış fərqin dürüst aşkar edilməsində istifadə olunur. Bu meyar vəziyyətdən asılı olaraq göstəricinin dəyişməsini müəyyən etməyə imkan verir. Vilkokson meyarının ümumiləşdirilməsi kimi o, ikidən artıq ölçmələrin aparılmasında tətbiq olunur. Burada hər bir xəstə müalicə zamanı və ya müalicədən sonra müyyən zaman

anlarında müşahidə olunur və müşahidənin nəticəsi sıralanır. Ranqların cəmi müəyyən edilir. Əgər tapılmış qiymət kritik qiyməti aşırsa 0-cı hipotez rədd edilir. $x_{ij}$-un $k$ və $n$ müşahidələri verilmişdir, harada $1 \le i \le n,\ 1 \le j \le k$. $x_{ij}$ elementinin ranqı $r_{ij}$ kimi işarə olunur ($r_{ij} = 1.2,3,...,k$). Meyar aşağıdakı kimi müəyyən edilir:

$$S = \frac{12n}{k(k+1)} \sum_{j=1}^{k} \left( \frac{1}{n} \sum_{i=1}^{n} r_{ij} - \frac{k+1}{2} \right). \quad (1.19)$$

Əgər $S < S_\alpha(n,k)$ onda 0-cı hipotez qəbul edilir ($S_\alpha$ cədvəl qiyməti).

4. **Kraskal-Uollisin *H*-meyarı** hər hansı bir əlamətin eyni zamanda üç, dörd və daha çox seçmələrdə fərqinin aşkar edilməsi üçün istifadə olunur. Bu meyar Manna-Uitninin *U*-meyarının ümumiləşdirilməsidir və ikidən artıq seçmələr arasında fərqin aşkar edilməsi üçün tətbiq edilir. O, əlamətin seçmələrdə dəyişmə dərəcəsini müəyyən etməyə imkan verir. Bu meyara görə seçmələr nə qədər az qarşılıqlı kəsişərlərsə onda əhəmiyyətlilik səviyyəsi artmış olacaqdır. Bütün seçmələr şərti olaraq kəmiyyətin rast gəlməsinə görə bir seçmədə birləşirlər və bunlara ranqlar mənimsədilir. Sonra alınmış ranqlar ilkin verilənlərlə tutuşdurulur və hər bir seçmə üçün ayrıca ranqlar cəmi hesablanır. Əgər ranqlar cəmi bir-birindən fərqlənmirlərsə onda seçmələr arasında fərqlər o qədər əhəmiyyətli deyil.

Məsələn $k$ sayda seçmələr verilmişdir:

$$x_1^{n1} = \{x_{11}, \ldots, x_{1n_1}\}, \ldots, x_k^{n_k} = \{x_{k1}, \ldots, x_{kn_k}\}.$$

Ümumiləşdirilmiş seçmə $x = x_1^{n1} \cup x_2^{n2} \cup \ldots \cup x_k^{n_k}$ kimi olacaqdır. Bütün

$$N = \sum_{i=1}^{k} n_i$$

elementlər artan istiqmətdə sıralanır və $R_{ij}$ $i$-ci seçmənin $j$-cu elementinin ranqıdır. Onda iki seçmə arasında fərqin müəyyən edilməsi üçün Kraskal-Uollis meyarı aşağıdakı kimi müəyyən olunacaqdır:

$$H = \frac{12}{N(N+1)} \cdot \sum_i \frac{T_j^2}{n_j} - 3(N+1) \quad (1.20)$$

Harada $N$ – seçmənin ümumi sayıdır, $T_j$ – hər qrupda ranqların cəmi, $n_j$ – j-cı qrupda müşahidə olunanaların sayı.

Əgər $H \geqslant H_\alpha$ olarsa 0-cı hipotez rədd edilir ($H_\alpha$ cədvəl qiymətidir).

## Nəticə

İnformasiyanın gücü intellektual imkanları qabaqlayır. İnformasiya ehtiyatlarının idarə olunması və yeni mürəkkəb məsələlərin həllinin təmin edilməsi üçün bu gün yeni axtarış sistemlərinin mükəmməlləşməsi, informasiyanın yadda saxlanması və axtarışının yeni prinsiplərinə keçid, informasiya sistemlərinin yaradılması istiqamətində addımların atılması tələb olunur. İstənilən halda informasiya sistemlərinin əsas məsələsi konkret predmet sahəsi çərçivəsində konkret informasiya tələbatının ödənilməsidir.

Bu elmi məqalədə problemə yanaşma konsepsiyası yer almışdır. Insan orqanizminə bir tam biosistem kimi baxılır və onun ümumi xassələrin identifikasiyası üçün riyazi aparat araşdırılır və seçilir. Biosistemə iki növ yanaşma təklif edilir. Onlardan biri sadə ehtimal yanaşma, digəri isə çox mürəkkəb ehtimal-determinə yanaşmadır. Sadə ehtimal yanaşmada riyazi aparat olaraq Bayesin nəzəriyyəsi və düsturları tətbiq edilərək diaqnostika aparılır. Ikinci halda vəziyyət çətinləşəndə, yəni nəticə almaq mümkün olmayanda və ya qeyri-müəyyən cavablar alındıqda neyron şəbəkələrə müraciət etmiş və həllin hadisəyə adekvatlığını sübut edə bilmişik (18).

Digər tərəfdən zaman sıralarının analizinə də yer ayrılmışdır. Zaman sıralarının spesifikliyinə görə onların analizi üçün müəyyən metodika tətbiq olunur. Hər bir yeni məsələ həlli üçün zaman sıralarının analizi metodu çərçivəsində onun həll edilməsi metodikasının adaptasiyası aparılır.

Biostatistika dedikdə biz kliniki eksperimentlərin aparılması üçün statistik testlər, prosedurlar çoxluğu başa düşürük. Eksperimentin aparılmasının riyazi üsulları, biostatistika üsullarından Manna-Uitni U-meyarı, Vilkoksonun T-meyarı, Fridman meyarı, Kruskal-Uollisin *H*-meyarı verilmişdir.

## Ədəbiyyat

1. Viner N. Cybernetics or control and communication in the animal and the machine. Second edition. M, "Sov. radio ", 1968
2. Biostatistics. Information project in the field of healthcare in the countries of the Caucasus. Ottawa, 2003
3. Trofimova T.G., Chernov V.I. Classification of biocybernetic systems and the methodology of their theoretical research. // Collection of reports of the conference "Evidence-based medicine (clinical observation, statistical generalization, process models), Voronezh, January, 2000
4. Petrushin V. A. Expert training systems. Kiev: Naukovo Dumka, 1992, 196 p.
5. Osovsky S. Neural networks for information processing. Translated from Polish by I.D. Rudinsky M: Finance and Statistics, 2004, 344 p.
6. Muller K., Mika S. An Introduction to Kernel-Based Learning Algorithms, IEEE Neural Networks, 2001, No. 12 (2), P.181–201
7. Eremin D.M., Garceev I.B. Artificial neural networks in intelligent control systems. M .: MIREA, 2004, 75 p.
8. Egorov A.A. Mikshina V.S. Application of probabilistic neural networks for solving classification problems in surgery / Scientific and practical conference. NEUROINFORMATICS, Moscow, 2011, pp. 152-163
9. Aravin O.I. Diagnostics in medicine and biomechanics based on the apparatus of neural networks // Biomechanics in Russia, 2012
10. Wasserman F. Neurocomputer technology: theory and practice. Per. from English, 2004
11. Kalchenko D. Neural networks: on the threshold of the future // ComputerPress 1'2005
12. Sheozhev A.M. Development of neural network algorithms for the automation of biomedical research. Dissertation of the scientific degree of candidate of technical sciences, specialty 05.13.18, 2004
13. Guryeva V.M., Kotov Yu.B. Analysis of short segments of time series in medical problems // IPM im. MV Keldysh RAS, Moscow, 2005. This work was supported by the Russian Foundation for Basic Research (project No. 04-01-00434)
14. Yunkerov V.I., Grigoriev S.G. Mathematical and statistical processing of medical research data. Saint Petersburg, 2002
15. Merkov A.B. About Statistical Learning Theory [HTML] (http://www.recognition.mccme.ru/pub/RecognitionLab.html / slt.html), - 2006
16. Stanton Glantz. Biomedical statistics. Translation from English. Yu.A. Danilov. Moscow, 1999
17. Eliseeva I.I., Yuzbashev M.M. General theory of statistics: Textbook / Ed. I. I. Eliseeva. 4th ed., Rev. and add. Moscow: Finance and Statistics, 1999, 480 p.
18. G.G.Abdullayeva, N.H.Gurbanova, I.H.Mirzezade, R.H.Naghiyev. Information Technology: Diagnostics and Monitoring in Toxicology. Baku, 2016.

Göndərilib: 13.04.2021 Qəbul edilib: 19.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/86-88

**Sevinc Nadir qızı Kerimova**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
Sevakarimova@mail.ru

# HAMİLƏLİK VƏ MƏXMƏRƏK

***Açar sözlər:*** *hamiləlik, məxmərək, döl, infeksiya*

**Pregnancy and velvet**
**Summary**
The main prevention of rubella infection during pregnancy is to be vaccinated against this disease in preparation for pregnancy. Before you decide to get vaccinated against rubella, you need to have a special laboratory test to detect antibodies to the rubella virus in your blood to check if you are immune to this infection. The fact is that in some cases it is impossible to determine whether you are sick with rubella. Because in many cases, the disease can be latent or with a very limited number of symptoms, in which case, naturally, the body develops specific antibodies against the virus. Doctors believe that in this case, the body's immune response will be strengthened. It is recommended that the velvet vaccine be given at least 3 months before the planned date of pregnancy.
***Key words:*** *pregnancy, rubella, fetus, infection*

Hamiləlikdə məxmərək – hava-damcı yolu ilə ötürülən və dölün ağır inkişaf qüsurlarına səbəb olan virus infeksiyasıdır. Xəstəlik limfa düyünlərinin böyüməsi, hipertermiya, öskürək, konyunktivitlə müşayiət olunur. Hamiləlik zamanı məxmərəklə yoluxmadan 2-3 gün sonra papulyoz səpkilər yaranır, patoloji elementlər əvvəlcə üzdə əmələ gəlir, sonra isə bədən, əl və ayaqlara yayılır. Məxmərəyin diaqnostikasında immunoloji marker sayılan IgM təyin edən seroloji testlərdən istifadə olunur[1,2,4]. Xəstəliyin spesifik müalicəsi mövcud deyil, dölün ağır inkişaf qüsurları zamanı məxmərək hamiləliyin pozulmasına göstəriş hesab edilir.

Hamiləlik dövründə məxmərək – virus mənşəli xəstəlik olub, yüksək kontagiozluğa malikdir. Bu xəstəlik həmçinin «alman qızılcası» və «rubella» kimi köhnə adlarla məşhurdur[3,5]. Qadın üçün bu patologiya heç bir risk daşımır, lakin embrionunun zədələnmə ehtimalının yüksək olması ilə əlaqədar məxmərək təhlükəli xəstəlik hesab olunur. Hamiləlik zamanı məxmərək az hallarda müşahidə olunur.

Hamiləlik zamanı məxmərəyin təhlükəliyi həm də ondan ibarətdir ki, patologiya nəinki kəskin, eləcə də xroniki formada gedərək heç bir klinik əlamətlə müşahidə olunmaya bilər. Belə vəziyyətdə döl üçün mövcud olan riskləri vaxtında aşkar etmək və uşağın anadangəlmə patologiyalarının olub-olmadığını nəzərə almaqla hamiləliyin aparılma taktikasını seçmək mümkün olmur. Hamiləlik dövründə məxmərək embriogenezin müddətindən asılı olaraq müxtəlif dərəcəli təhlükələr kəsb edir. I trimestrdə virusa yoluxma (xüsusən ilk həftələrdə) 80% hallarda inkişaf qüsurları ilə nəticələnir. II trimestrdə qeyri-qənaətbəxş sonluq riski 75% uşaqlarda izlənilir, 28-ci həftədən sonra bu göstərici 50%-ə qədər azalır. Hamilelik zamani yoluxma bas verrdikde virus plasenta (cift) vasitəsi ilə dölə keçərək, hamiləliyin pozulmasına,betndaxili inkisafdanqalmaya, doğulacaq uşaqda müxtəlif inkişaf qüsurlarının əmələ gəlməsinə (karlıq, ürək qüsurları, mərkəzi sinir sisteminin zədələnməsi və s.) səbəb ola bilər. Bu bir az da hamileliyin muddetine baglidir. Bele ki, hamileliyin ilk 2 ayinda yoluxma olduqda 50-60% anomaliya yaranma ehtimali vardir. 3-4 ayinda bir qeder azalaraq 15% dusur.17 hefteden sonra ise bu ehtimal 1 % olur. Diaqnostikasi klinik elametlerle yanasi qanda Ig M antitellerin askarlanmasina esaslanir ki bu antiteller yoluxmadan 1 hefte sonra yaranir ve 3 aya kimi qanda dovr edirler. Bir qeder sonra ise diger antitel novleri Ig A,Ig E, Ig D yaranir.Eger qanda Ig M ve ya 4 defe artmis Ig G titri mueyyen olunursa bu zaman keskin infeksiya haqda fikir soylemek olar. Yoluxmadan sonra omurluk immunitet formalasdigi ucun hamilelik dovrunde askarlanan az miqdarda Ig G qorxulu deyil ve kecirilmis xesteliye qarsi olan immunitetden xeber verir.

Hamiləlik dövründə məxmərək embrional və limfoid toxumalara tropluğu ilə seçilən toqaviruslar cinsindən olan viruslar tərəfindən törədilir. Yoluxma başlıca olaraq, infeksiya mənbəyi ilə sıx təmas zamanı hava-damcı yolu ilə baş verir. Virusların yayılması hələ inkubasion dövrdə başlayır, bu zaman xəstəliyin aşkar əlamətləri müşahidə olunmadığından infeksiyalaşmış insanlarla əlaqəni istisna etmək mümkün olmur. Kontagiozluq 7 gün ərzində – səpkilər əmələ gələnə qədər və patoloji elementlərin yaranmasından sonra 1-2 həftə müddətində saxlanılır. Həmçinin hamiləlik dövründə məxmərəyə məişət yolu ilə – infeksiyalaşmış

insanın bioloji mayelərinin izi qalan ümumi əşyaların istifadəsi zamanı yoluxma mümkündür. Sübut olunmuşdur ki, törədici nəinki burun-udlaq seliyində, eləcə də qan, sidik, nəcisdə mövcuddur[5,6,8].

Hamiləlik dövründə məxmərək damar məcrası ilə dölə ötürülür. Əvvəlcə törədici ananın limfatik düyünlərinə daxil olur, tənəffüs orqanlarının toxumalarını zədələyir, sonra isə hematogen yolla ciftə və dölün orqanizminə yayılır. Hamiləlik zamanı məxmərəyin teratogen təsirinin ardıcıllığı tam öyrənilməmişdir[9], lakin isbat edilmişdir ki, törədici xromosom dəyişikliklərinə, embrional hüceyrələrin mitotik aktivliyinin pozulmasına səbəb olur. Bu diaqnozla zamanı tez-tez rast gəlinən hidrosefaliya, əqli və fiziki inkişafın ləngiməsi virusun təsirindən yaranan toxumaların inhibisiya və apoptozu, qanın sirkulyator pozğunluqları ilə əlaqədardır[4,7].

Digər vaxtlarda olduğu kimi hamiləlik dövründə də məxmərək 11-24 gün davam edən inkubasion dövrdən başlanır. Sonra xəstəliyin xarakterik əlaməti-ənsə, boyun və qulaqətrafı limfa düyünlərinin böyüməsi və ağrılı olması meydana çıxır. Qadınların təxminən 1/3 hissəsi törədicinin sinovial mayeyə keçməsi nəticəsində baş verən oynaq ağrılarından əziyyət çəkir[2,4,7].

Hamiləlik dövründə məxmərək çox zaman konyuktivit əlamətləri: gözlərdə kəskin ağrılar, işıqdan qorxma, gözlərin yaşarması ilə müşayiət olunur. Orqanizmin güclü intoksikasiyası ilə əlaqədar bədən hərarətinin 38-39˚C-yə kimi yüksəlməsi, halsızlıq, yorğunluq, baş ağrıları izlənilir[10]. Virus plasentar baryerdən keçərək, döl orqanizminə daxil olur və bətndaxili inkişafın ağır pozğunluqları ilə nəticələnir. Bu qüsurlar ultrasəs skanlama prosesində aşkarlana bilir[7].

Hamiləlik dövründə məxmərək çoxsaylı embriopatiyalarla müşayiət olunur. Döl tərəfindən ilk növbədə xarakterik Qreqq triadası qeyd olunur. Bu sindrom karlıq, korluq və ürəyin zədələnməsindən ibarətdir. Bununla yanaşı, hamiləlik zamanı məxmərək dölün əqli və fiziki inkişaf pozğunluqlarına, anadangəlmə distrofiyalara, uşaq serebral iflicinə, idiopatik trombositopenik purpuraya gətirib çıxarır. Hamiləliyin gec dövrlərində qadının məxmərəyə yoluxması zamanı döldə vaskulit, daimi residivlərlə müşahidə olunan pnevmoniyaya meyllik, xroniki ekzantema izlənilir. Orta hesabla 1/3 hallarda hamiləlik dövründə məxmərək uşağın ölümü ilə nəticələnir[4,9].

Hətta hamiləlik zamanı məxmərək II-III trimestrdə yoluxma üçün xarakterik sayılan dölün ağır anadangəlmə qüsurlarına səbəb olmasa da, onun uzaq ağırlaşmaları ola bilər. Əksər hallarda xəstəliyin uzaq təzahürləri uşağın cinsi yetişkənlik dövründə meydana çıxaraq, panensefalit, böyümə hormonun çatışmaqlığı ilə özünü büruzə verir.

Hamiləlik dövründə məxmərəyin diaqnostikası.

Hamiləlik dövründə məxmərək qadının qanında törədiciyə qarşı anticisimlərin olmasını müəyyən edən xüsusi seroloji analizlər vasitəsilə aşkarlanır. Əlamətlərin yaranması və ya gələcək ananın təsadüfən infeksiya ocağında olması zamanı vaxtında müayinə aparılması və dölün sağlamlığı üçün risklərin qiymətləndirilməsi məqsədilə təcili surətdə mama-ginekoloq və infeksionistə müraciət etmək lazımdır. Hamiləlik dövründə məxmərək adətən IgM səviyyəsini göstərən immunoferment üsulla (İFA) təyin edilir. Törədiciyə qarşı anticisimlər virusa yoluxmadan 7 gün sonra qanda sirkulyasiya etməyə başlayır və orqanizmdə 1-2 ay ərzində qalır[1,6].

Hamiləlik zamanı məxmərəyin üşaq üçün yüksək risk daşıdığını nəzərə alaraq xəstəyə PZR (polimeraz zəncir reaksiyası üsulu) təyin olunur. Tədqiq olunan bioloji substansiyada IgM-in yüksək titrlərinin aşkarlanması yoluxmaya və xəstəliyin kəskin gedişinə dəlalət edir. Belə hallarda ehtimal olunan yoluxma dövrü müəyyən olunmalı, dölün vəziyyəti qiymətləndirilməli (əsasən kordosentezdən istifadə olunur) və hamiləliyin davam etdirilməsinin mümkünlüyü təyin edilməlidir[2,4].

Hamiləlik dövründə məxmərəyin müalicəsi.

Qadının hestasiyanın 12-ci həftəsinə kimi məxmərəyə yoluxması döldə ağır inkişaf qüsurlarının formalaşmasına səbəb oloduğundan hamiləliyin süni yolla pozulmasına mütləq göstəriş hesab olunur. Embriogenezin 13-28-ci həftəsində infeksiyalaşma zamanı konsilium keçirilərək, hamiləliyin davam etdirilməsinin mümkünlüyü müəyyənləşdirilir. Hamiləlik zamanı məxmərəyin uşağın sağlamlığına təsir etmədiyi aşkarlandıqda və ya hamiləlik digər səbəblərdən pozulmadıqda xəstəyə 20-30 ml dozada immunoqlobulin əzələ daxilinə yeridilir[2].

Hamiləlik dövründə məxmərəyin proqnoz və profilaktikası.

Hamiləlik dövründə məxmərək aşkar olunduqda proqnoz qeyri-qənaətbəxş sayılır. I trimestrdə yoluxmaların 80%-i həyatla uzlaşmayan ağır qüsurların inkişafı ilə nəticələnir. Hamiləliyin davam etdirilməsi zamanı 20% hallarda ölü doğumlar baş verir. Bundan əlavə eyni sayda uşaqlar xəstəliyin anadangəlmə forması ilə doğularaq, həyatın ilk ayında ölürlər. 30% qadınlarda hamiləlik zamanı məxmərək özbaşına düşüklərlə sonlanır. Davam etdirilən hamiləliklərin 20%-də dölün ölümü qeyd olunur. Məhz bu

səbəblərdən hestasiyanın ilkin dövrlərində məxmərək hamiləliyin dayandırılmasına mütləq göstəriş hesab olunur.

Hamiləlik zamanı məxmərəyin spesifik profilaktikası qadının seroloji statusunun müayinəsindən və planlaşdırılan mayalanmadan 2-3 ay əvvəl fərdi göstərişlər üzrə vaksinasiyanın aparılmasından ibarətdir. Bu yanaşma qanda məxmərək əleyhinə anticisimlərin qanda titrinin15 BV/ml-dən az olması hallarında tətbiq olunur. Hamiləlik zamanı məxmərəyə tutulma ehtimalını azaltmaq üçün hestasiyanın 16-cı həftəsinə qədər qadının infeksiya ocağında olması hallarında törədiciyə qarşı anticisimlərdən ibarət immunoqlobulinlərin yeridilməlidir. Mayalanmadan sonra məxmərək əleyhinə vaksinasiya əks-göstəriş sayılır, lakin onun təsadüfi aparılması hamiləliyin süni yolla pozulması üçün səbəb sayılmır. Hamiləlik zamanı məxmərəyin qeyri-spesifik profilkatikası ehtimal olunan infeksiya daşıyıcıları ilə təmasın istisna edilməsi və immunitetin möhkəmləndirilməsindən ibarətdir.

## Ədəbiyyat

1. Duran B, Toktamış A, Erden Ö, ve ark. Doğum öncesi bakımda tartışmalı bir konu: TORCH taraması. CÜ Tıp Fakültesi Dergisi 2002;24:185-190.
2. Çakıcı C, Aka N, Yorulmaz S, ve ark. Gebelerde rutin olarak toksoplazma, rubella ve sitomegalovirus taraması yapılmalı mıdır? Turkiye Klinikleri J Gynecol Obst 2013;5:20-22.
3. Tekin A, Deveci Ö, Yula E. The seroprevalence of antibodies against Toxoplas-ma gondii and Rubella virus among childbearing age women in Mardin province. J Clin Exp Invest 2010.
4.American Academy of Pediatrics. Rubella. In: Kimberlin DW, Brady MT, Ja- ckson MA, Long SS (eds). Red Book: 2018-2021 Report of the Committee on Infectious Diseases. 31st ed. Itasca, IL: American Academy of Pediatri- cs, 2018:705-11.
5. Cherry JD, Adachi K. Rubella virus. In: Cherry JD, Demmler-Harrison GJ, Feigin RD, Kaplan SL, Steinbach WJ, Hotez PJ (eds). Feigin and Cherry’s Textbook of Pediatric Infectious Diseases. 7th ed. Philadelphia: Saunders Elsevier, 2014:2195-225.
WHO. Rubella vaccines: WHO position paper. Wkly Epidemiol Rec 2011.
6. Best JM. Rubella. Semin Fetal Neonatal Med 2007;12:182-92.
7. Webster WS. Teratogen update: congenital rubella. Teratology 1998;58:13-23.
8. Abdel-Fattah SA, Bhat A, Illanes S, Bartha JL, Carrington D. TORCH test for fetal medicine indications: only CMV is necessary in the United Kingdom. Prenat Diagn. 2005;25(11):1028-31.
9. Harker KS, Ueno N, Lodoen MB. Toxoplasma gondii dissemination: a parasite’s journey through the infected host. Parasite Immunol. 2015;37(3):141-9. https://doi.org/10.1111/pim.12163
10.Yıldırım D, Bu□yu□kboyacı N, Bo□lu□kbas□ı S, ve ark. Toxoplasmoz s□u□pheli hastalarda Toxoplasma gondii seropozitiflig□inin kemilu□minesan mikropartiku□l immunolojik test (CMIA) yo□ntemi ile aras□tırılması. Cumhuriyet Med J. 2013;35:468-74. https://doi.org/10.7197/1305-0028.2260
11.Obut M, Dogan Y, Bademkıran MH, ve ark.rubella ve sitomegalovirus seroprevalansı. Dicle Med J. 2019;46(2):189-94.

Göndərilib: 12.04.2021 Qəbul edilib: 19.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/89-94

**Gültəkin Ağacan qızı Əliyeva**
Bakı Slavyan Unversiteti
filologiya üzrə fəlsəfə doktoru, dosenti
gultekin392@mail.ru

# BƏXTİYAR VAHABZADƏ SƏRBƏST ŞEİRİNİN MƏNA VƏ ÜSLUB İMKANLARI

***Açar sözlər:*** *B.Vahabzadə, sərbəst şeir, struktur, məna, üslub, təzad*

**Meaning and stylistic means of Bakhtiyar Vahabzade's free rhymed poetry**
**Summary**

The article analyzes the free rhymed poetry of Bakhtiyar Vahabzade, a prominent representative of XXth century Azerbaijani poetry, in terms of meaning and stylistic nuances. It is noted that free rhymed poetry once again entered the stage of self-affirmation in the 50s, which began to decline in the literary environment in the late 30s,. At that time, B.Vahabzadeh began to express himself both in syllables and free rhyme. Starting from the first examples of creativity, the poet increased the journalistic tone in the way of purification and formation of the national consciousness, inspiring new artistic and aesthetic qualities. One of the main qualities of the poet's poetry is that philosophical shades are expressed in the context of Man and time. At the same time, contrast and contrastivity have enriched the originality and stylistic possibilities of his free rhymed poems. Associative perception and poetic capacity of thought are among the factors ensuring the originality of B.Vahabzadeh's free rhymed poetry. These stylistic enrichments also play an important role in shaping the development of Azerbaijani free rhymed poetry. The stylistic richness of the poet's free rhymed poetry creates wide opportunities for the description and philosophical understanding of life and world events.
***Key words:*** *B.Vahabzade, free rhymed poetry, structure, meaning, style, contrast*

Bəxtiyar Vahabzadə ötən əsrin 40-cı illərində yaradıcılığa başlayanda sərbəst şeir özünün böhranlı günlərini yaşayırdı. 30-cu illər repressiyası, İkinci dünya müharibəsinin baş verməsi ədəbiyyatın inkişafına da müəyyən təsir göstərmiş, onun mövzusunu dəyişməklə yanaşı, poetikasının forma müxtəlifliyinin məhdudlaşmasına da təsir göstərmişdir. 30-cu illərin sonlarından geri çəkilməyə başlayan sərbəst şeir bir də 50-ci illərdə özünü təsdiq etmək mərhələsinə keçmişdir. Bu zaman sərbəst şeir formasında yazanlar içərisində gənclər də yer tuturdu. Ədəbi gənclik arasında sərbəst şeirə meyl bu formanın gələcək inkişaf yolunu da müəyyənləşdirdi. B.Vahabzadə, N.Xəzri, Ə.Kürçaylı, Ə.Kərimin poeziyaya gəlişi ilə bu formada dövrün ictimai-estetik tələbləri bədii şəkildə öz əksini tapdı. B.Vahabzadə isə həm hecada, həm də sərbəst formada özünü ifadə etməyə başladı. İlk yaradıcılıq nümunələrindən başlayaraq şair milli şüurun saflaşması, formalaşması yolunda publisistik tonu bir qədər də artırmış, yeni bədii-estetik keyfiyyətlər aşılamışdır. Yaradıcılığının ilk mərhələsində tənqidçi Mehdi Hüseyn "Narahat şair" adlı ön məqaləsində yazırdı: "...o həmişə qızğın axtarışlarla məşğuldur, öz şeirlərini yeni-yeni üslub xüsusiyyətlərilə zənginləşdirir, hər bir əsərində əzəmi dərəcədə müasir və dolğun fikir ifadə eləməyə meyil göstərir, ən çox da müasir həyatımızdan doğan vacib və çətin suallara cavab verməyə çalışır. B.Vahabzadə sözün ən yaxşı mənasında narahat şairdir" (1, 5-6). Şairin poeziyasının əsas keyfiyyətlərindən biri fəlsəfi çalarlardırsa, digəri düşündürməkdir. Onun vəznindən və formasından asılı olmayaraq, bütün şeirlərinin əsas leytmotivində oxucunu düşündürmək faktoru dayanır. Bunu nəzərdə tutan ədəbiyyatşünas Ə.Ağayev şairin "Bir gəminin yolçusuyuq" kitabı haqqında yazdığı belə bir fikrində haqlı görünür ki: "Bəxtiyar Vahabzadənin poeziyasında oxucunu düşündürmək, onu daim ayıq vəziyyətdə saxlamaq, onu həyat və fəaliyyətə səsləmək keyfiyyəti vardır və bu onun poetik üslubunun məziyyətlərindən biridir" (3, 4).

B.Vahabzadənin ilk şeir yaradıcılığı hecada olmasına rəğmən, poetik mətndə sərbəstlik başlıca rol oynayırdı. Şeirindəki qafiyə sərbəstliyinin tez-tez təkrarlandığını da nəzərə almış olsaq, şairin sərbəst şeir formasına gec-tez müraciət edəcəyi gözlənilən idi. Poeziyada dilin, ifadənin qüvvətləndirilməsi naminə etdiyi inversiya, yerdəyişmə, ritm zənginliyi və s. faktorlar şairin bu formaya müraciətini zəruri edir. B.Vahabzadə poeziyasını dil, poetik sistem, vəzn baxımından təhlili onun bu formaya müraciətinin faktor zənginliyini üzə çıxarır. Poeziyasında öz əksini tapan fəlsəfi çalarlar, təzadlar harmoniyası, insan və zaman ətrafında düşüncələr bu formada daha yaxşı ifadə olunmuşdur. Xüsusilə 50-ci illərin sonlarından şairin yaradıcılığındakı zaman, vaxt, insan problemləri ilə bağlı fəlsəfi düşüncələr öz ifadəsini məhz sərbəst formada tapır. "Kimdir mənim düşmənim", "Bu gündən yapış", "Karvan gedir", "Otuz yeddi yaşım",

"Ekranda görüş", "Qorxu", "Anam təzədən böyüyür", "Babam, atam, mən", "Gün var min aya dəyər" və s. şeirlərində və poemalarında zamanla, insanla bağlı fəlsəfi mühakimələr sərbəst şeirdə yeni bədii-estetik dünyaduyumunun poetik mənzərəsini yaratmış olur. Bu şeirlərdə şair zaman qarşısındakı mənəvi cavabdehlik aktının poetik xəritəsini verir. "Nəsə çatmır" şeirində şair insanın istəkləri ilə reallığın heç də həmişə uyğun gəlmədiyini, dünyanı dərk etmənin konturlarını cızır. İnsan yazır, oxuyur, yaşayır, nələr isə əldə edir, lakin həmişə nəyin isə çatmadığını hiss edir:

Könlümüzdən
Keçənlərin arxasınca biz qoşuruq
Çalışırıq, vuruşuruq.
Səsə düşür məramımız,
Əməlcə bu səsə çatmır.
Düzü budur:
Sözümüzdə hər şey çatır,
Özümüzdə nəsə çatmır (3, 187).

İnsan hər zaman hərəkətdə olduğu bir zamanda istəklərini reallaşdırmaq üçün hər şey edir, lakin həyat çox təzadlıdır; hər zaman nəsə çatmır: "Lap ayda da, Lap gündə də nəsə çatmır, Çatmayanın özündə də nəsə çatmır". Şairin "nəsə çatmır" fəlsəfəsi həyatın bütün sahələrində davam edir; onun son nəfəsdə dediyi "nəsə çatmır" sözlərinə fəlsəfi məna verir. İnsanın "nəsə çatmır" fəlsəfəsində adi həyat qayğıları ilə yanaşı, həyatın fəlsəfəsi və insanın həyatı dərketmə fəlsəfəsi başlıca yer tutur. Şeirin sonluğunda şair ömrü boyu axtardığı "nəyin çatmadığını" tapmağa çalışdığını, lakin onun mümkün olmadığını bildirir. Ona görə ki, hər hansı bir sirr açılırsa, o sirrlə birlikdə bir neçə suala da cavab axtarılır. Beləliklə açılan sirrlə birlikdə min bir sirr çözmək lazım gəlir. Şairin poetik qənaəti "nəsə çatmır" fəlsəfəsini insanın həyatı dərk etmək varlığına bağlayır, şeir fəlsəfi məzmunun ifadə vasitələri kimi çıxış edir:

Öyrənirik-
Günü-gündən ucalırıq,
        qalxırıq biz...
Son zirvəyə
Çata bilmir əllərimiz.
Qoy çatmasın!
Elə deyək:-Nəsə çatmır!
Axı, insan
Çatmayana çata-çata insan olmuş,
"Hər şey çatır"-deməkdənsə
Ömrün başa çatması xoş!.. (3, 190).

Burada şair həm də yaşadığı zamanın (və bütün zamanların!) obrazını yaratmağa nail olmuşdur. Onun lirik qəhrəmanı bu Zamanın tərənnümçüsü olmaqla yanaşı, çatmayan, dərk olunmayan məsələləri də dilə gətirir. Maraqlıdır ki, dövrün ədəbi tənqidi şairin poeziyasındakı bu faktorları zamanında görmüş və yüksək qiymətləndirmişdir. Filosof tənqidçi Asif Əfəndiyev şairin son dövrlərdə (söhbət 60-cı illərdən gedir-G.Ə.) yazdığı şeirlərin əsas leytmotivinin "insan ömrü" və "zaman" olduğuna diqqət çəkərək yazır: "B.Vahabzadənin şeirlərində, məsələn, mənalı illərin sinəsində iz buraxan, narahat, xeyirxah həyat idealı tərənnüm olunur: insanlara gərək olmaq, hər anın, hər dəqiqənin qədrini bilmək, bir sözlə-əsl şairanə həyat idealı!" (4, s. 25). Doğrudan da, B.Vahabzadənin şeirlərində Zaman və İnsan obrazı qərmızı xətlə keçir və poetik dialoqun iki tərəfini müəyyən edir. Tənqidçi Y.Qarayev də bu fikirdədir ki, Zamanla ünsiyyət B.Vahabzadə şeirlərinin əsas xüsusiyyətlərindən biridir: "Bəxtiyar şeirində zamana maraq-xalqın mənəvi əbədiyyətinə, mənəvi "indi"sinə və keçmişinə maraq deməkdir. Zaman onu yalnız xalqın tarixi taleyi ilə, xalqın mənəvi və əxlaqi həyat təcrübəsi ilə bağlılığı baxımından düşündürür və narahat edir. Keçmişi və gələcəyi də şair məhz "Vətən tarixi"nin səhifələri kimi varaqlayır" (5, s. 8).

Şairin İnsan və Zamanla bağlı poetik fikirləri yalnız bir neçə şeirdə deyil, bütün yaradıcılığı boyu davam edir. Şair nədən yazır-yazsın lirik-fəlsəfi düşüncələr kontekstinin mərkəzində Zaman və İnsan dayanır. Hər hansı bir mövzunun poetik təqdimində təsvir etdiyi hadisələri mənalandırarkən bu amillər qırmızı xətlə keçir. Ədəbiyyatşünas Vaqif Yusifli bu faktorların şairin yaradıcılığının ana xəttini təşkil etdiyinə diqqət çəkərək yazır: "B.Vahabzadənin "İnsan və zaman" silsiləsi onun bütün yaradıcılığı boyu davam edən lirik-fəlsəfi düşüncələrin ifadəsidir. Bu silsilədə dünyada baş verən hər hansı yeni hadisəyə, elm və texnikanın insan həyatına necə təsir etdiyinə həssas şair münasibəti hiss edilir. Silsilənin altmışıncı illərə aid olan nümunələrinin bir çoxunda hələ fəlsəfi ümumiləşdirmələr dərininə getmir, bu şeirlərdə ŞAİR Bəxtiyarın üstünlüyü göz qabağındadır" (6, 130). Əlbəttə, tədqiqatçının sonuncu fikri bir qədər bizə mübahisəli görünsə

də, İnsan və zaman faktorunun şairin yaradıcılığındakı yeri doğru qiymətləndirilir. O ki, qaldı 60-cı illərdə "fəlsəfi ümumiləşdirmələrin o qədər də dərininə getməməsi" fikrinə, bununla razılaşmaq bir qədər çətindir. Çünki məhz bu illərdən başlayaraq şairin yaradıcılığında İnsan və Zaman faktoru poetik fikrin təkamülündə mühüm rol oynamışdır. Hətta bu silsilə o qədər qabarıq görünməyə başlamışdır ki, "İnsan və Zaman" adlı kitabını çap etdirmişdir (6). Azərbaycan poeziyasında ilk dəfə olaraq İnsan və Zaman konsepsiyası poetik kitabın adına verilmişdir. Özü də bu silsilə bütün yaradıcılığı boyu davam etmiş və böyük bir inkiaşf yolu keçmişdir. Əlbəttə, B.Vahabzadə bədii təfəkkürü yerində saymamış, getdikcə daha da dərinə işləmiş, fəlsəfi zənginliyini artırmışdır. Onun poeziyasının gücü, enerjisi də elə fəlsəfi ümumiləşdirmələrindədir. Görkəmli ədəbiyyatşünas Y.Qarayevin "Düşündürən poeziya" adlı məqaləsində B.Vahabzadə yaradıcılığının bu keyfiyyətinin aktuallığı bir daha təsdiqini tapmış olur: "Fəlsəfi zaman, məkan və işıq anlayışları varlıqla, dünya ilə ünsiyyətinin üfüqlərini böyütməkdə, öz düşüncələrinə vüsət və qanad verməkdə şairə kömək edir. Vəhdətə və tamlığa, ölçüsüzlüyə və nəhayətsizliyə, əbədi, doyumsuz bir təşnəlik ruhu Bəxtiyar poeziyasının "narahatlıq" keyfiyyətinin əsas məzmununu təşkil eləyir" (5, 10).

B.Vahabzadənin sərbəst şeirlərində zaman, vaxt, dünya, ömür haqqında fəlsəfi, poetik qənaətlər yaradıcılığının ana xəttini təşkil edir. Lakin onu da demək lazımdır ki, bu poetik qənaətlərdə ümid və inam pafosu başlıca yer tutur. "İntizar", "Bağçamdan axan su", "Dağ seliyəm", "Deyirlər", "Ata yurdu", "Tərksilah", "Saat", "Baş", "Əks-səda" və s. onlarla şeirlərində Zaman və İnsan tandemi uğurlu poetik qənaətlərlə müşahidə olunur. Bu poetik qənaətlərlə yanaşı, şair həlli vacib olan, dünyanı düşündürən suallar da verir. "Mənə nə var?!" dedin, Düzmü dedin sən?", "Buzdan soyuq olar ilanın qanı. İnsansan! O isti qanın bəs hanı?" ("Mənə nə var?"),"Tək özünmü? Xeyr, xeyr! Beynindəki fikirlər də, Qəlbindəki duyğular da sənin deyil, Sənin deyil!" ("Qara qutu"), "İnanmırsan? Aç qəlbini sən ondan sor!" ("Külək-ot"), "Bu gün qucaqlaşan qollarımıztək, Nə vaxt birləşəcək bəs vətənimiz" ("Vüsalda hicran"), "Yad dildə məktub yazıb, qardaş öz qardaşına, Bu məktubu oxuyan nə kül töksün başına?" ("Nə ondansan, nə bundan"), "Cahilin başıyla, düşüncəsiylə, Yaşayan o dahi, yenə dahimi?" ("Baş") və s. yüzlərlə şeirlərindəki poetik suallar İnsan və Zamanın içindən keçir. Bəzən isə kiçik bir şeirdə Zamanla İnsanın yarışında heç zaman tapılmayacaq, tapılması mümkün olmayacaq suallar qoyulur. Oxucu şairin "Bir insan nə qədər yaşamaq istər" sualına cavab tapa bilmir. Çünki bunun cavabı yoxdur. "Qurdla qiyamətə qalmaq" deyimi sanki bu sualın cavabını ifadə edir:

Bəzən soruşuram özüm-özümdən:
-Neçə il yaşamaq istəyirəm mən?
-Yüz il.
Yox, beş yüz il,
Min il,
-On min il,
-Yüz milyon il.
Yox, yox, bəs deyil!
Sonu olan ömrü istəmirəm mən.
Çıxaydım zamanın çərçivəsindən!.. (3, 88)

"Bu gündən yapış" şeirində isə şair keçmişlə və gələcəklə yaşmaqdansa bugünlə yaşamağın fəlsəfəsini açmağa çalışır. Belə ki, yaşadığımız hər gün "həyatın öz səsi", "dünənin nöqtəsi", "sabahınsa gölgəsi"dir. Lakin kölgəni "tutmaq", onu geri qaytarmaq "çətindir. Keçdiyin yollara baxdıqda ömürdən qalan günləri də hesablamaq ağırdır. Ona görə də bugünün bugün kimi yaşamalısan. Şairin çıxardığı poetik qənaət Zamanla İnsan tandeminin "əməkdaşlığı"nı ortaya qoyur:

Günün ömrü
Öz vaxtında uzanır,
Öz vaxtında gödəlir.
Vaxtında axşam gedir,
Vaxtında gündüz gəlir (7, 54).

B.Vahabzadə dünyanın dolanbac yollarında bəşər övladının müasir ovqatı, əzəli və əbədi sevginin ürəkdə oyatdığı sehrli duyğuları və sarsıntıları, ayağımızın altındakı yaşadığımız müqəddəs torpağa bağlılığımızı ifadə edir. İnsan və onun cəmiyyətdəki yeri, Yer üzünə gəlişinin missiyası, Zamandan maksimum dərəcədə bəşəriyyətin xeyri üçün çalışmaq bu şeirlərin leytmotividir, canıdır. Mövzusundan, zamanından asılı olmayaraq onun şeirləri mənsub olduğu xalqın həyatını əks etdirir və onun tərcümeyi-halına çevrilir. Onun poeziyasının yaşamaq haqqı da məhz xalqının varlığını əks etdirməsindən irəli gəlir. Böyük qırğız yazıçısı Çingiz Aytmatov "Axı dünya fırlanır" (Bakı, 1987) kitabına yazdığı "Yaradıbdır inam məni, mən inamın övladıyam" adlı ön sözündə şairin yaradıcılığına yüksək qiymət verərək yazır:

"Vahabzadənin poetik təfəkkür mədəniyyəti təbiətcə millidir. Bu müstəsna dərəcədə zəruri haldır ki, sən övladı olduğun xalqın nitq hissəsində feil olmağı bacarasan, xalqının canlı dil memarlığına öz töhfəni verə biləsən. Bununla yanaşı, Vahabzadənin poetik təfəkkür mədəniyyəti daha üstün mahiyyət kəsb edir və millilikdən ümumbəşəri səviyyəyə qalxır... İndiki halda sən azərbaycanlı şairi oxuyanda dünyanı oxuyursan" (8, 8).

B.Vahabzadənin sərbəst şeirlərini fərqləndirən bədii xüsusiyyətlərdən biri də təzadların təsviridir. Şair hər bir şeirində təsvir etdiyi hadisə və predmetlərin özünəməxsus əlaqə formalarını tapır və şeiri bu təzadlar üzərində qurmağa çalışır. Bu sərbəst şeirlərdə təzadların verilməsi üçün əldə edilən sərbəstlik şairə imkan verir ki, hadisə və predmetlərə uyğun söz və söz birləşmələrinin köməyi ilə fikirlərinə fəlsəfi yön, istiqamət versin. Bu zaman şair təzad fiqurlarından yaradıcı şəkildə bəhrələnir. Bu şeirlərdə insan münasibətləri təzadlı şəkildə əks etdirilir. Bu zaman "yer-göy", "dağ-aran", "yüksəlmək-enmək", "sevinc-kədər", "axşam-səhər", "təzə-boyat", "ölüm-həyat" və s. onlarla antonim ifadələrdən məharətlə istifadə edir. "Qafiyələr" kiçik sərbəst şeirində şair özünün yaradıcılığının bu orijinallığını "səsdən doğan" qafiyəni istəməməsində görür. Onu daha çox məna və hikmət düşündürür, lakin "iki simin bir kök üstə tutrəməsi"ni də qafiyə hesab edir:

Qafiyədir
Gül nəfəsi, bülbül səsi.
Qafiyədir
        göy ilə yer.
Qafiyədir
        sevinc-kədər
Qafiyədir eniş-yoxuş,
        axşam-səhər,
        təzə-boyat.
Ən müqəyyəd qafiyədir:
        ölüm-həyat! (3, 117)

B.Vahabzadənin "Təklik", "Səfərə çıxmışıq", "Sükut", "Fəryad", "Səkilər", "Qayıt", "Yox, düşmürəm, qalxıram", "Vətəndən-vətənə" və s. şeirlərində təzad fiqurlarından yaradıcı şəkildə istifadə etmişdir. Hətta, belə demək mümkünsə, təzad 60-70-ci illər poeziyasında ilk olaraq B.Vahabzadə poeziyasında özünü göstərmiş və bir müddət onun sərbəst şeirləri ilə təmsil olunmuşdur. Tədqiqatçı Sərxan Abdullayev bunu nəzərdə tutaraq yazır: "Təzad Bəxtiyar şeiri üçün o qədər səciyyəvi və doğmadır ki, əslində onun yaradıcılığına bu prizmadan daxil olmaq, onu düşündürən problemlərin, qəlbində baş-başa gələn fikir və ehtirasların poetik atlasını hazırlamaq mümkündür. Şair zamanın, insan münasibətlərinin müəyyən modellərini konkret təzad-paralellər əsasında təqdim etməyə çalışır, qarşılaşdırma, diametral tutuşdurma texnikasını şeirin əsas məntiqi hərləcinə çevirməklə sahə prinsipi üzrə hərəkət edir" (9, 44-45). Təzad-paralellərin fəlsəfi düşüncə ilə müşaiyət olunması B.Vahabzadə şeirində kiçik dünyanı sığışdıra bilir. Onun özünəməxsus poetik dünyası yaranır ki, bu dünyanı məhz təzadlar vasitəsilə dərk eləməyə çalışırsan.

B.Vahabzadənin sərbəst şeirlərində təzad-paralellər müxtəlif şəkildə üzə çıxır. Bunları aşağıdakı kimi qruplaşdırmaq olar:

a) poetik-üslubi strukturda;
b) təzadlı fikir və qafiyələrdə;
c) təzad-vurğularda;
d) qarşılaşdırmalı prinsipdə;
e) çarpaz fiqurlar və təzadlar;
e) assosiativ səsləşmə və əlaqələndirmələrdə. Və s.

B.Vahabzadənin sərbəst şeirlərində poetik üslubi struktur başlıca yer tutur; şeirin əsasını, strukturunu təzadlar və təzadlılıq təşkil edir. Şeirin birinci misrasından başlayaraq sualların verilməsi və sonda poetik ümumiləşdirmə şeirin strukturuna yad elementlərin daxil olmasına imkan vermir. Təzad-fiqurların şeirin strukturunda əsas rol oynadığından mətndəki təzadlar həyəcan yaratmaqla yanaşı, oxucunu düşündürməyə sövq edir və o da müəllif kimi bədii mətndə verilən suallara cavab axtarır. "Kimdir mənim düşmənim?" şeirinin adındakı sualına poetik mətn boyu cavab axtarılır:

Kimdir mənim
Ən qorxulu düşmənim?
Kaş biləydim bunu mən.
O zərbə vurmamışdan
Kəsəydim yolunu mən.
Kimdir mənim

Düşmənim?
Yaxşımı qoyub
Yamanımı danışanmı?
Yox!
Eyiblərimi deyib
Arxamca gülənmi?
Yox! (10, 13).

Poetik mətn boyu bu sıralamalar davam edir. Şairin lirik qəhrəmanı özünü tanımaq üçün onların gözü ilə baxıb eyiblərini görmək istəyir. Eyiblərinin deyilməsi onun özünə başqalarının gözü ilə baxılmasına imkan yaradır. "Ən qorxulu düşmənin" öhdəsindən gələ bildiyi halda "özü-özü ilə" bacara bilmir.

B.Vahabzadənin sərbəst şeirlərində hecaları bir-birindən fərqləndirən adi fonetik vurğulardan başqa təzad-vurğulardan da geniş istifadə edilir. Təzad-vurğuların üstünlüyü orasındadır ki, bədii mətndə güclü impulslar, təzadlardan doğan həyəcanlar yarada bilir, təhkiyəyə mütəhərriklik və operativlik gətirir. "Vətəndən-vətənə" şeirindəki təzad vurğular poetik mətni canlı və görümlü edir. Mövzuya yeni prizmadan nəzər salındığı kimi, nitq axarını təzadlar üzərində qurmaqla bədii mətndə ümumiləşdirici əlaqə yarada bilir. Vətənin iki yerə bölünməsinə yeni poetik münasibət ifadə olunur. Arazın o tayı da, bu tayı da vətən olsa da, bu taydakı oranı, oradakı buranı görə və gələ bilməməyi lirik məndə təzadlı suallar yardır:

Bu necə vətəndi?
Görmədim üzünü
Çatsam da bu yaşa
Ömründə bir dəfə
Bəs salam verməzmi
qardaş-qardaşa? (10, 16).

Bu kiçik şeirdəki poetik ümumiləşdirmənin özü də təzadlar üzərində qurulub. Şair özünün Vətənə həsrətlə baxmağı ilə Füzulinin həsrətini qarşılaşdırır:

Bu qəmim, bu dərdim dağlardan ağırdı
Arazın suyuna qarışıb axıram.
Füzuli həsrətlə qürbətdən Vətənə baxırdı,
Mən is...
Vətəndən-Vətənə baxıram (10, 17).

B.Vahabzadənin "Mənim şeirim" şeirində təzadlı fikir və qafiyələr işlətməklə bədii mətnə espressivlilik gətirir. Təzadlı fikir və qafiyələr onun sərbəst şeirlərinə maksimal yığcamlıq verir. Lakoniklik bu cür şeirlərin əsas xüsusiyyətlərindən biri kimi diqqəti cəlb edir. Şair bu şeirləri "əbədi bir od kimi öz içindən közərib" yandığını və bugündən sabaha boylandığını bu cür təzadlı fikirlərlə bildirir, onu "batan gecələrinin açılan səhərlərə salamı" kimi qələmə verir. Şeir onun dünyaya sualıdır, hədsiz məhəbbətidir, eşqi, həsrətidir, ilk məhəbbətidir, şadlığıdır. Anası ömründən kəsib oğluna, oğlu isə şeirə vermişdir. Lakin təzadlar bununla bitmir:

Mən səninçün,
Anamsa mənim üçün yandı, şeirim.
"Balamın rahatlığı yoxdur",-deyə o məni
sənə qısqandı, şeirim.
Ancaq o bilmədi ki, mən anamdan doğuldum,
Sənsə mənim qəlbimdə balamtək bəslədiyim
Duyğulardan doğuldun.
Məni anamdan alıb Vətənimə, xalqıma
Oğul edən sən oldun! (10, 27).

B.Vahabzadə sərbəst şeirlərində qarşılaşdırmalı prinsipdən də geniş istifadə edilir. "Əyri və düz", "yaxşı və pis", "ölüm-həyat", "təzə-köhnə", "dünən-bugün" və s. qarşılaşdırmalardan tez-tez istifadə edilir. Bəzən şair cəmi beş misrada iki qarşılaşdırmalı təzaddan istifadə edərək fəlsəfi poetik qənaətlərə gələ bilir. "Nəsənsə özün ol" şeiri bu cəhətdən təqdirəlayiqdir. Şeirin sonluğunda qarşılaşdırmalı təzadlardan maksimum dərəcədə sənətkarlıqla istifadə edilmişdir:

Nəsənsə, özün ol!,
Təzəsən onda
Sən köhnə olursan
yamsılayanda.
Nəsənsə, özün ol!

Kökündən yapış!
Dünənə arxalan,
Bu gündən yapış! (10, 38).

B.Vahabzadə şeirlərində ən çox işlənilən formalardan biri də çarpaz fiqurlardır. Məhz çarpaz fiqurlar vasitəsilə şairin poetik mətndə verməyə çalışddığı təzad texnikası yeniləşir və bütövləşir. Çarpaz fiqurlar da digər təzad növləri kimi poetik mətnə evvektivlik gətirməklə yanaşı, bədii mətnin məna yükünü, siqlətini artırır. Bu isə sənətkarın yaradıcılıq imkanlarını zənginləşdirmiş olur. Çarpaz təzadlar şeirdəki ideya ilə səsləşdikdə və ya bir-birini tamamladıqda poetk mətn daha güclü görünür. "Həyat-ölüm" poemasında mətn boyu bu faktordan geniş istifadə olunur. "Səkilər" şeirində şair təzad-fiqur elementindən maksimum dərəcədə istifadə edir:

Kim gecəni ulduzla
 günəşi ayla görmüş?
Kim hicranı vüsalla
 qışı da yayla görmüş?
Bu səkidə qarışır
 su-atəşə, ay-günə
Hicranın göz yaşları
 vüsal gülüşlərinə.
Bu dünyada vüsalla
 hicranın görüş yeri... (10, 129)

Assosiativ səsləşmə və əlaqələndirmə B.Vahabzadə şeirlərində istifadə olunan vasitələrdən biridir. Şair bu vasitədən ən çox həcm etibarilə böyük şeirlərində, yaxud poemalarında istifadə edir. Bu cür şeirlərdə yığcamlıq, lakoniklik olmur. "Muğam" poemasında səslə sözün əvəzlənməsi buna ən yaxşı nümunə ola bilər. Şair bədii təhkiyə boyu assoasiativ səsləşmə və əlaqələndirmədən yeri gəldikcə istifadə etməklə poemada bir ləngərlik yaradır. Yaxud "Həyat-ölüm" poemasında qarşılaşdırmalı təzadlarla yanaşı assosiativ əvəzlənmələrə də yer verilir. Poemada təqdim edilən "ölüm və həyat" modeli həyatdan dərs çıxarmaq, cəmiyyəti irəli aparmaq üçün bir nümunə olur. Onun şeirlərində təzad yaradıcılığı şeirdə yalnız effektivlik və ekspressivlik yaratmaq üçün işlədilmir, həm də sərbəst şeirin daxili məntiqindən doğur.

Burada B.Vahabzadə sərbəst şeirinin əsas xüsusiyyətlərini özündə cəmləşdirən bəzi amillərə nəzər yetirdik. Bütövlükdə, onun sərbəst şeirlərini səciyyələndirən cəhətlər çoxdur. Assosiativ qavrayış və fikrin poetik tutumu B.Vahabzadə sərbəstinin orijinallığını təmin edən faktorlardandır. Bu üslubi zənginliklər həm də Azərbaycan sərbəst şeirinin inkişafının şərtləndirilməsində mühüm rol oynayır. Bu amillər həm də şairin sərbəst şeirinin poetik üslubunu müəyyənləşdirir. O qədər müəyyənləşdirir ki, bu şeirləri oxuyanlar dərhal onun müəllifinin kimliyini asanlıqla müəyyənləşdirirlər. Şairin sərbəst şeirindəki üslubi zənginliklər həyat və dünya hadisələrinin təsvirində və fəlsəfi dərkində geniş imkanlar yaradır.

**Ədəbiyyat**


1. Mehdi H. Anxious poet. Foreword. //B.Vahabzade. Man and time. Baku, Azerbaijan State Publishing House, 1964, p. 5-9
2. Agayev A. The hymn of the century. Baku: "Yazichi", 1980, 231 p.
3. Vahabzade B. Selected works. In 2 volumes, I volume. Baku: Azerbaijan State Publishing House, 1974,
4. Efendiyev A. The power of wisdom. Baku: "Ganjlik", 1976, 192 p.
5. Garayev Y. Contemplative poetry. Foreword // Vahabzade B. Selected works. In two volumes, I volume, Baku, Azerbaijan State Publishing House, 1974, p. 7-16
6. Yusifli V. Ways and years of poetry (1960-2000). Baku: Translator, 2009
7. Vahabzade B. Man and time. Poems. Baku, Azerbaijan State Publishing House, 1964,
8. Aytmatov Ch. "Faith created me, I am the child of faith." Foreword // Vahabzade B. After all, the world revolves: Poems and translations. Baku, 1987, p. 5-10
9. Abdullayev S. Language and artistic perception. Baku, Yazıchı, 1989, 167 p.
10. Vahabzade B. Selected works. In 2 volumes, I volume, Baku, Leader, 2004, 328 p.


Göndərilib: 15.04.2021 Qəbul edilib: 20.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/95-100

**Ülviyyə Çingiz qızı Əliyeva**
Azərbaycan Universiteti
filologiya üzrə fəlsəfə doktoru, dosent
**Leyla Pərviz qızı Kazımzadə**
magistrant
leyla.kazimzade.96@mail.ru

# VAŞİNQTON İRVİNQİN "YUXULU DƏRƏ ƏFSANƏSİ" VƏ "RİP VAN VİNKL" ƏSƏRLƏRİNDƏ AMERİKA GERÇƏKLİYİ

***Açar sözlər:*** *novella, İnqilabi müharibə, müstəmləkəçilik, ruh, şəxsiyyət*

**American Reality in Washington Irving's "The Legend of the Sleepy Hollow" and "Rip**

**Summary**

This article analyzes Washington Irving's two most popular novels in American literature, "Sleepy Hollow" and "Rip Van Winkle." The main issue is the issue of identity in this period of history. The author of these short stories answers everyone who asks about the American people's quest for freedom and what it means to be an American. These novels are a source of inspiration for Americans to build their own culture.
***Key words:*** *novella, Revolutionary war, colonialism, spirit, personality*

## Giriş

İnqilabi müharibədən sonra Amerika ədəbiyyatının vəziyyəti yaxşı deyildi. Bəzi insanlar Amerika ədəbiyyatında milli hissin olmamasından narahat idilər və milli xarakteri ifadə edə bilən kitabların nəşr olunmasını istəyirdilər. Çoxları Amerika ədəbiyyatının Britaniya ədəbiyyatından azad olmaq üçün çox gənc olduğuna inanırdı. Bəziləri milli ədəbiyyata can atmağın belə səhv olduğunu düşünürdü. Bu münaqişə yüz ilə yaxındır ki, aydınlaşmır. Yeni müstəqil Amerikanın ilk populyar janrı novellalardan ibarət oldu.

XIX əsrin əvvəllərində Amerika ədəbiyyatının mərkəzi Nyu-York şəhəri idi. Bu dövrün yazıçılar "Knickerbockers" adlanırdı və əsrin əvvəllərindəki dövr, Amerikan ədəbiyyatının "Knickboker dövrü" adlanır. Bu dövrdə Charlotte Temple, Charles Brocken Brown da daxil olmaqla bir neçə nüfuzlu müəllif var idi, lakin bunlardan ən əsası Vaşinqton İrvinq idi.

İlk Amerikan post İnqilabçı yazıçı Vaşinqton İrvinq, 31 aprel 1783-cü ildə on bir uşaqdan sonuncusu olaraq dünyaya gəldi. Ona ilk Amerika prezidenti və Amerika İnqilabının qəhrəmanı Corc Vaşinqtonun adı verildi. (4) İrvinq yalnız bir yazıçı deyil, eyni zamanda Birləşmiş Ştatların İspaniyadakı səfiri vəzifəsinə xidmət etmiş və ölümündən əvvəl Amerika yazıçılarının müəllif hüquqlarını qorumaq üçün daha sərt qanunların qəbul olunması üçün böyük rol oynamışdır.

Ədəbiyyatda ilk addımı 1802-ci ildə Londonda dərc olunan "The Morning Chronicle" qəzetində Conatan Oldstayl təxəllüsü altında Nyu-Yorkun sosial həyatı və teatrları haqqında yazdığı yazılarla atmışdır.1819-cu ildə ona sonradan dünya şöhrəti qazandıran "Ceffri Krayonun qaralama dəftəri" (The Sketch Book of Geoffrey Crayon ) kitabını nəşr etdirmişdir. (1)

Vaşinqton İrvinq Ceyms Fenimor Kuperlə yanaşı Avropada bəyənilən ilk amerikalı yazıçılardan biri olmuş və Nataniel Hotorn, Herman Melvil, Henri Lonqfellou və Edqar Allan Po kimi Amerika yazıçılarını həvəsləndirmişdir. (1)

İrvinqin romanları canlı hekayə, əyləncəli süjet üçün mənzərə və mənzərənin gözəlliyi ilə birləşdirilmiş şedevr hesab olunur. Onun işlərinin ümumi xüsusiyyəti, birincisi, Amerikanın müasir həyatındakı incə istehza, yumor, parodiya, satira və qroteskin birləşmələri, ikincisi, gündəlik həyatdan sehrli və sirli dünyaya real keçid ilə fantastik şeylərin birləşmələridir. Bu İrvinqin əsərlərində normal təbii bir şey kimi görünür.

Onu bəzən "Amerika ədəbiyyatının atası" da adlandırırlar. Kitabları dünyada ən yaxşı satılan ilk amerikalı yazıçı idi. Onun tarixi mövzudakı əsərləri ilk ABŞ prezidenti Corc Vaşinqton, irlan yazıçısı Oliver Qoldsmit və Məhəmməd peyğəmbərin bioqrafiyalarından və XV əsr İspaniya tarixi ilə bağlı mövzulardan ibarətdir. "Ceffri Krayonun qaralama dəftəri" kitabına daxil olan "Rip Van Vinkl" və "Yuxulu dərə haqqında əfsanə" hekayələrinə görə şöhrət qazanmışdır. Hər iki hekayə Amerika ədəbiyyatında ən çox sevilən iki hekayədir və hər ikisi də ilk iki Amerika qısa hekayəsi sayılır. Həm "Yuxulu dərə əfsanəsi" nin, həm də "Rip Van Vinkl" in süjetləri Alman xalq nağıllarına əsaslanır. Hər ikisi Hudson çayı boyunca - Tarrytaun yaxınlığındakı "Yuxulu dərə əfsanəsi" və bir qədər şimalda "Rip Van Vinkle" - və bu gün kifayət qədər mülayim və xoş fövqəltəbii, qəribə köhnə saxta Holland əfsanələri kimi xatırlanmağa meyllidirlər. Irvinq

fövqəladə dərəcədə səmimi və mülayim bir dastançıdır, rahat hiss etməyimizi istəyən və bunun əvəzinə yalnız onun qarmaqarışıq, dolaşıq yolları ilə getməyimizi istəyən bir aparıcıdır. Ancaq "Yuxulu dərə əfsanəsi" və "Rip Van Vinkle", həm əvvəlki Nyu York povestlərindən, həm də bir-birindən çox fərqli hekayə strategiyalarından çox fərqli hekayələrdir.

"Yuxulu dərə haqqında əfsanə" novellası daha əvvəl də qeyd etdiyim kimi, Irvinqin ən əhəmiyyətli əsərlərindən biridir. "Yuxulu dərə əfsanəsi" Irvingin folklora olan sevgisini və istifadəsini ortaya qoyur. Bu əsər nəşr olunduqda Amerika da hər şey təzə və yeni idi - o qədər təzə idi ki, həll ediləcək bir çox torpaq sahəsi var idi və insanlar bunu etmək üçün qərbə doğru hərəkət etməyə başladılar. "Yuxulu dərə haqqında əfsanə" romantik fantastikanın möhtəşəm bir nümunəsidir. Bu əsər özündə nümunəvi bir romantik qəhrəmanı və mücərrəd bir məsələdə həqiqəti tapmaq səylərini özündə birləşdirir. İrvinqin romantik qəhrəmanını fövqəltəbii hadisələrə və qadınlara qarşı narahatlığa nəhəng bir heyranlıq müşayiət edir. Vaşinqton İrvinq şəhər həyatının sərt gerçəkliklərini təbiətin romantik gözəlliklərinə yaxınlaşdırır, romantizmi bütöv bir şəkildə təyin edir. Şəhərin və onun bulaşıcı təbiətinin yuxusu bizi birbaşa oxuyucuları Irvinqin nağılına cəlb edir. "Yuxulu dərə haqqında əfsanə" Yuxulu Dərə adlı bir qəsəbəyə köçən Içabod Vinç və başsız atlı haqqında bir hekayədir. Irvinqə görə, bütün dünyanın ən sakit yerlərindən biri olan bu müstəmləkə orijinal Holland köçkünləri yaşayır. İcmalarının məskunlaşdıqlarının ilk illərində orada yaşayan bir Alman həkim tərəfindən sehrləndiyinə və yaşlı bir Hindistan rəisinin səlahiyyətlərinin torpaq üzərində olduğunu düşünürlər. Oradakı insanlar bu ruhları hiss edirlər və bütün qonşuluq hər cür ecazkar inanclara inanmış kimi görünür - qəribə şeylər görür və havada səslər eşidirlər. Buna görə bir Hessiya əsgərinin ruhuna inandığı başsız atlı haqqında çox məşhur bir əfsanə yaranıb. Bu fiqur sayəsində Amerika tarixində çox əhəmiyyətli bir hadisə olan İnqilabi Müharibə ilə əlaqəni hiss etmək olar. Irving'in Baltus torpaqlarının sərvətini ətraflı təsvir etməsi həm Amerika çölündə zəngin olmağın nə olduğunu müəyyənləşdirir və həm də Amerikanın təbii ehtiyatlarının bolluğunu vurğulayır.

"Yuxulu Dərə haqqında əfsanə" əsərində başsız atlının fiqurunda müharibə əsgəri ilə əlaqə görünür. O bir Hessi əsgəri idi və bu əsgərlər İnqilab Müharibəsi dövründə ən çox nifrət edilənlərdən biri idi.Onlar çox qəddar, vəhşi və barbar insanlar hesab olunurdular. Bu səbəbdən müharibənin kitabdakı təmsilçiliyi də çox vəhşi və qəddar xarakterli bir atlıdan keçir. Kitabdakı atlı heç kimə həqiqətən zərər verməməsinə baxmayaraq, hər iki uyğunlaşmada da soyuqqanlı bir qatildir.

Bir məktəb müəllimi olan Crane, dünyanın ən səssiz yerlərindən biri olduğu iddia edilən Yuxulu dərəyə gəlir. Bu Holland kəndində insanlar bir Alman həkimi və ya qoca bir hind rəisi tərəfindən lənətləndiyinə inanılır. Bu kənddəki köçkünlər də bu nağıllara və dəhşət hekayələrinə inanırlar.

"Bu kənddə insanlar hər cür inanclara inanır, havada musiqi səsləri və qəribə səslər eşidirlər. Bütün məhəllə yerli nağıllarla, ruhlu hekayətlərə və alatoran xurafatlara inanır. Doğrudanda ruh bu sehrli bölgəni təqib edir və əmr edilmiş kimi görünür". (2, p 304) Bu, gerçəkliyin, tarixin və fövqəltəbii əridilmənin ilk böyük nümunəsidir. İnqilabi Müharibə, şübhəsiz ki, çox sayda ölümə və məhvə səbəb oldu. Hekayələr danışmaq, əlbəttə ki, kəndlilərin müharibə qarışıqlığı ilə barışmalarının bir yoludur. Içabod və yerli kişilər arasındakı hekayədə bir neçə ikili vəziyyət qurulur.İçabod qadınların ürəyinə yol tapmağa vaxt ayırır.

Bəzi əyləncəli alliterasiya yaratmaqla yanaşı, Irvinq Atlıya ilk dəfə gerçək bir tarix qazandırdı. Bu başsız atlının başını top mərmisi ilə vurulan əsgəri olduğu düşünülür. Kessiya əsgərinin cəsədi kilsənin həyatində basdırılsa da, ruhu hələ də gecə yarısına kimi dərənin ətrafında dolaşır və yenidən kilsənin həyatinə qayıdır. Konnektikutdan olan Ikabod Vinç, İnqilabdan otuz il sonra Yuxulu dərəyə gəlir. "Hündür, lakin həddən artıq arıq, dar çiyinləri, uzun qolları və ayaqları, qollarından bir mil məsafədə uzanan əlləri, kürəklərə xidmət edə biləcək ayaqları və bütün çərçivəsi ən sərbəst şəkildə asılmışdı. Başı kiçik və üstü düz idi, nəhəng qulaqları, iri yaşıl şüşəli gözləri və uzun bir snayper burnu var idi ki, küləyin hansı tərəfə əsdiyini söyləmək üçün mili boynuna tıxanmış bir hava xoruzuna bənzəyirdi". (2, p 306)

İcabodun fiziki keyfiyyətləri onun xəyalpərəst, ağılsız xarakterinin göstəricisidir. Sadəcə olaraq, İçabod Vinç hündür və cılızdır, çirkin, acgöz, qorxunc hekayələri sevir, lakin bu hekayələrə güclü inamı səbəbi ilə bunlardan çox qorxur. İçabod tipik faciəvi qəhrəmanın əksidir. O, əsasən bu hekayənin anti-qəhrəmanıdır.

İçabod Vinç meşəli bir təpənin yanında bir məktəb binasında yaşayırdı. O davranışına və uşaqlara xoş rəftarına görə qəsəbədə çox sevilirdi. Tezliklə o fermer Baltus Van Tasselin gözəl qızı Katrina Van Tasselə və atasının puluna aşiq oldu. Hekayədə Katrinanın kabuslarla və cadılarla müqayisəsi, Icabodun Katrinaya olan heyranlığının onu nə qədər problemə salacağını qabaqcadan göstərir. Katrinanın təsviri onu böyük ölçüdə İçabodun başqa bir maddi istəyi və nəticədə mübarizə aparacaq bir məqsədi kimi göstərir. "Yuxulu dərə əfsanəsi" ndə iştirak edən əsas mövzu acgözlükdür. Məsələn, Katrina, kişilər onunla mübahisə edərkən ona göstərilən diqqəti sevir.

"O zənginliyindən razı qalmırdı və qürur duymurdu və yaşadığı üslubdan daha çox bolluğa can atırdı". (2, p 306) Katrinanın ailəsinin pulu, həqiqətən, İçabodun Katrina ilə evlənməsinə əsas səbəbi idi.

İçabod, Van Tassels iqamətgahını ziyarət edərkən cazibədar idi və Katrinanı qazanmağı düşünürdü. O həmçini Katrinanın atasının pullarını da qazanmağı düşünürdü. Içabodun uzun təsviri ilə başlayan və qəhrəmanının Van Tasselin torpağının zəngin məhsullarını gördüyü zaman hiss etdiyi az qala fiziki aclığa qədər davam edən təsirli bir aclıq görüntüləri əsərdə öz yerini alır. Katrinanın ürəyini qazanmağa çalışan tək o deyildi. Ölkənin qəhrəmanı, ləqəbi Brom Bones kimi məşhur olan İbrahim Van Brunt da Katrinaya aşiq idi. Bu rəqib ilə Içabod Kreyn mübarizə aparmaq məcburiyyətində qaldı. Irvinq Brom Bones obrazında müəllif özünə güvənən Amerika qəhrəmanının konsepsiyasını yaratmışdır.Brom Bones, Içabodun niyyətlərini öyrəndikdə, onu təqib etməyə başladı.Bir payızda gecəsində Içabod Vinç Van Tasselin evində keçiriləcək yeməyə dəvət edildi. İçabod, yaşlı bir Hollandiyalı Hans Van Ripperdən bir at da borc alaraq özünü tamamilə hərtərəfli hazırladı.

"İçabod belə bir at üçün uyğun bir fiqur idi. O, dizlərini az qala yəhərin yanına gətirən qısa üzəngi ilə sürdü; iti dirsəkləri çəyirtkə kimi çıxdı; qamçını əlində bir çubuq kimi dik tutdu; və atı qollarının hərəkətində qaçarkən bir cüt qanad çırpmaqdan fərqli olmayaraq sürürdü". (2, p 318)

Təsvirdən göründüyü kimi, Icabod həqiqətən gülünc bir şəxsiyyət idi. Əlbəttə ki, İrvinq, tamamilə rasional düşüncənin üstündəki təsəvvürün üstünlüyünə, şəxsi azadlığın vacibliyinə və təbiətin həqiqiliyinə inanan Amerika Romantizmini tapmağa kömək etdi. Ancaq bu təsvir, daha çox romantizm nəsrinin bir parodiyasıdır.

Van Tasselin evindəki ziyafətdə, İçabod evlənmək istədiyi Katrina ilə rəqs edərkən hər şeyin yaxşı olduğu görünürdü. Bu vaxt İçabodun rəqibi İbrahim "Brom Bones" Van Brunt, qısqanc hisslərlə özü küncdə oturmuşdu. Yığıncaqda Ichabod bir qrup yaşlı Hollandiyalı ilə bir araya gəldi, Yuxulu dərəsinin Başsız Atlısı - hamının tanıdığı -məşhur əfsanədən bəhs etdi.

Həmin gecə, Içabod evə tək getməli olur. Qaranlıqdan qorxduğunu əsərdə yazıçı qeyd etmişdir və İçabod meşədə gizlənən xəyalları təsəvvür etməyə başlayır. Hər şey dağılmağa başlayır və onu yaxşılaşdırmaq üçün Içabodun edə biləcəyi bir şey yoxdur. İçabod evə qayıdarkən, qərib bir atlı onu izləmiş kimi görünürdü. Tezliklə şəhərin ətrafında dolaşan başsız atlı olduğunu başa düşdü. Dəhşət dolu gecədən sonra İçabod nə axşam yeməyində, nə də səhər yeməyində göründü. İnsanlar İçabodu son dəfə yığıncaqda gördü. O ya Atlı onu öldürdü, ya da qaçdı. Hər iki halda da İçabod məhv edilir. Yaşlı bir hollandiyalı Yuxulu dərə sakinlərindən biri Ichabodu axtarmağa başladı, taleyi barədə narahat idi. Hər yeri axtardılar və qısa müddətdə İçabodun bir şapkasını tapdılar və ona yaxın bir yerə səpələnmiş balqabaq tapdılar, lakin Ichabodun cəsədini heç bir yerdə tapmaq mümkün olmadı.

Qoca bir əkinçi İçabod Vinçinin hələ sağ olduğunu söylədi. "Məhəllədən qismən qulyabani və Hans Van Ripper qorxusu ilə və qismən də sığınacaqdakı mortifikasiyada varis tərəfindən qəfildən rədd edildiyinə görə ayrıldı". (2, p 329)

İçabod Vinç itkin düşdükdən sonra Brom Bones Katrina ilə evləndi. Yaşlı qadın, Kranın fövqəltəbii yollarla ruhdan salındığını və məktəb binasının uğursuz pedaqoqun ruhu tərəfindən gözümçıxdıya salındığını söylədi. Bu hekayə ətrafdakıların ən sevdiyi hekayə olmağa başladı. Bu son hekayədə, başqalarında olduğu kimi, Irvinq də New Yorkluların olan New England "Yankees" in şəxsiyyəti ilə ziddiyyət təşkil edir. Yeni İngiltərə vətəndaşı olan Ichabod Crane, komik biçim yaradır. O, acgöz və xurafatçıdır. Onu vadidən qorxudan "başsız atlı" real deyil. Kənardakıları qorxutmaq üçün yerli New Yorklular tərəfindən icad edilmişdir.

Hekayənin ən diqqət çəkici xüsusiyyətlərindən biri zəngin təsviri detalların istifadəsidir. Yazıçı mənzərənin xəyalpərəstliyini uzun müddət izah edir, lakin hekayə diqqətini İçabod və düşüncələrinə yönəltdikdə təsvir daha canlı olur. Məsələn, İçabod axşam evə gedəndə yazıçı onu qorxudan hər varlığı sadalayır: qamçı, ağac qurbağası, çığır-bayquş, atəş milçəyi, böcək. Van Tassel tövləsinə baxdıqda, "fermanın xəzinələri ilə birlikdə", İçabodun baxışları qaranquş, göyərçin, donuz, qaz, ördək, hinduşka, guineafowl və xoruz üzərində qalır.

Bu hekayənin şöhrətinin başqa bir cəhəti daha əvvəl də qeyd edildiyi kimi, Amerikanın ən məşhur bayramlarından biri olan Halloween bayramı ola bilər. Hekayədə balqabağın olması və hekayənin bütünlükdə qorxulu olduğundan, Halloween ənənəsinin bir hissəsi halına gəldi. Bu novellanın Amerikanın Halloween bayramı ilə əlaqəsi İrvinq yaradıcılığının Amerika mədəniyyətinin və tarixinin vacib bir hissəsinə çevrildiyini göstərir. Yazıçının mistik-qotik novellası oxucunu ovsunlayır, qorxuya salır. Hekayədəki qəhrəmanların həyatı bitmək bilməyən gecə kabusunu xatırladır. Onlar ruhlarla qarşılaşır,qaranlıq meşələrdə və dərələrdə gəzir, müəmmalı şəkildə itkin düşürlər. Ən əsası isə ümidsizcəsinə yuxunun harada başa çatdığını, reallığın harada başladığını anlamağa çalışırlar.

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/109-111

**Gülnarə Adil qızı Kazımova**
ADPU nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci
müəllim

# N.GƏNCƏVİ POEMALARINDA VƏTƏNPƏRVƏRLİK VƏ BEYNƏLMİLƏL İDEYALARIN TƏRƏNNÜMÜ

***Açar sözlər:*** *şair, vətənpərvərlik, vətən, ideya, beynəlmiləl, poema*

**Glorifying of the patriotic and international ideas in Nizami Ganjevi's poems**
**Summary**

The article deals with the glorifying of the patriotism in N.Ganjevi's creation.The poet's works are analysed just from this standpoint. It is emphasized that Nizami as one of the most progressive thinkers of that period who loved sincerely the picturesque towns, flowering fields, meadows, mountains with snow-white peaks of his native country spoke about the necessity of its defence from the foreign invaders. In the poet's opinion the place a person was born and grew up in is the dearest for him. Nizami believing in his poetic power hoped to glorify his motherland and expressed all his feelings in his works.
***Key words:*** *poet, patriotism, motherland, idea, international, poem*

2021-ci ilin "Nizami Gəncəvi ili" elan edilməsi Prezident İlham Əliyevin klassik irsimizə olan qayğı və diqqətinin təzahürüdür. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatının ədəbi abidələri, hansı dildə yazıldığından asılı olmayaraq, milli təfəkkürü əks etdirir. Klassik poeziya mənəvi dəyərləri təlqin etməklə yanaşı, Azərbaycanın qədim və zəngin mədəniyyətindən xəbər verir. Nizami Gəncəvinin yaradıcılığı mənsub olduğu xalqın mənəviyyatı, düşüncəsi ilə sıx bağlı olduğundan xüsusi maraq kəsb edir. Mütəfəkkirin Şərq elmi və ədəbi fikrinin inkişafında əvəzsiz xidməti vardır. Nizami dünya mədəniyyəti xəzinəsinə dəyərli töhfələr bəxş etmiş böyük şəxsiyyətdir. Şairin ideya aləmi ümümbəşəri mahiyyətilə seçilir, Nizami irsi dünya şərqşünaslığında tədqiq olunur. Nizaminin Allaha müraciətlərindən birində deyilir ki, dindar olsam da, bütpərəst olsam da, hər növdən olsam da, məni bağışla. Mənimlə işimə görə rəftar etmə! İnsanlığa bu cür yanaşma şairin dünyagörüşünə milli düşüncədən gəlirdi. Bu gün hələ də dünyanın diskriminasiya ilə mübarizə apardığını nəzərə alaraq deyə bilərik ki, XII əsr Azərbaycan şairinin insanlığa bu ali baxışı onu yetirən xalqın humanist görüşlərinin çox əski dövrlərdən formalaşmasının təcəssümü kimi özünü göstərir. Bu günlərdə "Mədəniyyət" kanalının qonağı olan akademik R.Hüseynov 2021-ci ilin ölkəmizdə "Nizami Gəncəvi ili" elan edilməsini həm də azərbaycançılığa töhfə kimi dəyərləndirdi. Şairin 880 illik yubileyinin dövlət səviyyəsində qeyd edilməsi mütəfəkkirin insan və cəmiyyət ilə bağlı düşüncələrinin təbliğində də rol oynayacaqdır. Nizami irsinə 2021-ci ildə daha çox müraciət olunacaq, bu da milli-mənəvi dəyərlərin gənc nəslə aşılanmasına geniş imkan yaradacaqdır. Məlumdur ki, ədəbiyyat mənəviyyatla bağlıdır və onun əsas tədqiqat obyekti insandır. Nizami vətənə, torpağa, doğma dilə məhəbbəti insana xas olan ən yüksək cəhətlər kimi təqdim edir. Yeni poetik məktəbin əsasını qoymaqla şairin yaradıcılığı orta əsrlər hüquqi, ictimasi-siyasi fikir tarixində yeni mərhələ təşkil edir. Nizami beytlərində elm və bədiilik vəhdətdədir. Əsərləri dövrünün bütün elmlərinə dərindən bələd olduğundan xəbər verir. Nizami irsinin müxtəlif elm sahələrində çalışan alimlərin diqqətini cəlb etməsi də sırf bununla bağlıdır. Poemaları fəlsəfi poeziyanın örnəyi kimi də dəyərlidir, burada hər beytdə gizli mənalar yer almışdır. Bu ilin "Nizami Gəncəvi ili" elan olunmasının mühüm cəhətlərindən biri də odur ki, şairin yaradıcılığında tədqiqata ehtiyacı olan sahələrə bir daha nəzər salınacaq, mübahisəli fikirlərə aydınlıq gətirməyə kömək edəcəkdir. Eləcə də, qədim mədəniyyətimizi beynəlxalq aləmdə tanıtmaqda daha geniş imkanlar yaranacaqdır. "Xəmsə" Azərbaycan mədəniyyətinin güzgüsüdür.

Nizami dövrünün ən böyük humanist sənətkarlarından biridir. Onun əsərləri insana xidmət etmək, insanın haqqını və mənafeyini müdafiə etmək, insanı fiziki zənginliyəvə, mənəvi kamilliyə səsləyən bir sənət xəzinəsidir. Nizami yaradıcılığındakı ən mütərəqqi cəhət onun insanı insan kimi yaşamağa, dünyanı zəkası və əmməlləri ilə bəzəməyə, zənginləşdirməyə çağırmasıdır. Şair göstərir ki, insan yalnız özü üçün yaşamamalı, böyük məqsədlər uğrunda, bəşər həyatına xidmət etmək yolunda çalışmalıdır.

Çalış, insanların işinə yara,
Geysin əməlinlə dünya zərxara.
Bacarsan hamının yükünü sən çək,
İnsana ən böyük arxadır kömək.

Nizami öz əsərlərində bütün xalqlara hörmət və məhəbbətlə yanaşır. Şair insanı hansı xalqa, hansı ölkəyə mənsub olmasına görə yox, ləyaqətinə, insanlığına görə qiymətləndirməyi əsas götürür. Nizami yüksək bir vətənpərvərdir. Onun əsərlərində vətənpərvərlik müqəddəs bir anlayış kimi verilir. Nizami doğma yurdu Azərbaycandan danışanda bu əsrarəngız diyarın zəngin təbiətindən, mərd və nəcib insanlarından böyük hərarətlə, iftixar hissi ilə söz açır:

Bu mərdlər, gözəllər yurdunda inan,
Çox saysız xəzinə gizləmiş zaman.
Belə şux, sevdalı gülşən harda var?!
Harda var xəzinə saçan bu diyar?!

Nizami vətəni qorumaq naminə canından keçməyə hazır olmağı hər bir vətən övladının borcu sayır. Lakin o, saysız insan məhvinə səbəb olan ədalətsiz müharibələrə qarşı çıxır. Mənəmlik və dünya ağalığı iddiası ilə başlanan savaşların gec-tez məğlubiyyətlə nəticələndiyini göstərir. Nizaminin bu fikirləri bu günümüzün reallığı ilə də üst-üstə düşür, ədalətsiz, işğalçı müharibələrin insanlığa fəlakət gətirdiyini, aclıq və səfalət yaratdığını bütün aydınlığı ilə açıb göstərir.

Dahi Nizaminin vətənpərvərlik ideyalarının ən parlaq təmsilçiləri "Isgəndərnamə"də Nüşabə, "Xosrav və Şirin" əsərində Şirin və Məhin Banudur. Məhin Banu Arrandan Ərmənə (indiki "Ermənistan") qədər geniş ərazidə hökmranlıq edən, öz yurdunu sonsuz məhəbbətlə sevən, ağıllı, mərd, cəsarətli və hünərli bir qadındır. Məhin Banu qadın olduğuna baxmayaraq, öz doğma vətənini yadelli işğalçılardan qorumağa nail olur. O, Xosrovu ilk dəfə gördükdə onu doğma yurdu Bərdəyə dəvət edir. Məhin Banunun yerinə taxta çıxan Şirin də onun kimi vətənpərvərliyi ilə fərqlənir. O, Xosrovu ata yurdunu qorumağa, "xilas etməyə" çağırır:

Cavansan, şir kimi cəsarətin var,
Tacidar olmağa ləyaqətin var.
Ölkəni fitnədən xilas edərək,
Qüdrətini göstər bir dəfə görək.

Xosrova: "Qılınc al, meydanda özünü göstər", – deyən Şirin öyrədir ki, düşməni güclə, qüdrətlə məğlub edib doğma yurdu azad etmək olar. Ulu şairin bu hərbi-vətənpərvərlik ideyası ərazimizin 20%-nin işğalçı ermənilərin tapdağı altından azad edilməsi bugünkü gerçəkliyimizlə necə də müasir səslənir. Şirini böyük məhəbbətlə sevən Xosrov öz doğma vətənini Bəhramdan azad etmək üçün ona qarşı müharibəyə başlayır və qalib gəlir, ölkəsini əsarətdən xilas edir. N.Gəncəvinin ağıllı, cəsarətli bir qadın hökmdar kimi tərənnüm etdiyi Bərdə hakimi Nüşabə həm də "doğma ölkəsinə qol-qanad" verən alovlu vətənpərvərdir. O, öz ölkəsinin müstəqilliyini və ərazi bütövlüyünü qoruyub saxlamağa çalışır, dünyanı fəth edən Isgəndər kimi qüdrətli hökmdarı öz ağlı, fərasəti və cəsarəti ilə "ram" edir, beləliklə, vətəninin azadlığını təmin etməyə nail olur:

Gedərkən Nüşabə bağladı peyman,
Isgəndər verməsin mülkünə ziyan.
Vəsiqə yazmağa şah verdi fərman,
O cənnətdən çıxıb getdi hökmüran.

Dahi şair-pedaqoqun vətənpərvərlik ideyasına görə Vətəni hamı sevməli və qorumalıdır.

Çalış ki, kirpiyin olsun almaz tək,
Ayıq ol, ölkənin keşiyini çək.

Nizaminin bədii iris elmi-fəlsəfi mahiyyəti ilə XIII əsrdən başlayaraq şairlərin, təzkirə müəlliflərinin, alimlərin diqqətini cəlb etmiş, əsərlərinə nəzirələr yazılmış, çox sayda elmi tədqiqatlar ərsəyə gəlmişdir. Azərbaycanda Nizami yaradıcılığının geniş tədqiqinə SSRİ dönəmində başlanılmışdır. Ulu Öndər Heydər Əliyevin təşəbbüsü ilə 1979-cu ildə qəbul olunmuş "Azərbaycanın böyük şairi və mütəfəkkiri Nizami Gəncəvinin irsinin öyrənilməsini nəşrini və təbliğini daha da yaxşılaşdırmaq haqqında" qərar Nizami poeziyasının öyrənilməsində və təbliğində yeni nailiyyətlərin əldə olunmasına imkan yaratdı. Nizami əsərlərinin filoloji və bədii tərcümələri nəşr olundu. Şairin fəlsəfi düşüncələri, poetikası, Yaxın Şərq şeirinin inkişafında istiqamətverici mövqeyi ilə bağlı yeni elmi nəticələri əks etdirən monoqrafiyalar qələmə alındı.

Nizami "Xəmsə"si insanlıq dəyərlərinin toplusudur. 8 əsrdən artıqdır ki, mütəfəkkirin yaradıcılığına müraciət olunur. Orta əsr şairlərinin əsərlərində elə bir ideya yoxdur ki, Nizami irsində yer almasın. İlk poemasında şairi bir sual daha çox düşündürür: "Cahanın yaşı çox keçsə də, başından bir tük də əksilməyibdir. Cavanlığı cahana vermiş bizlər nədən qocayıq, biz ki, ondan doğulmuşuq". Nizamini insan, zaman və cəmiyyətlə bağlı suallar

düşündürür. Biz bu dünyaya nə üçün gəlmişik, belə xoş, işıqlı cahan varkən əbədilik nədən axirətdədir kimi suallara cavab axtarır. Xoşbəxtlər ölkəsi ilə tanış olduqdan sonra İsgəndər fikirləşir ki, əgər insan bunlardırsa, onda biz kimik, əgər xasiyyət budursa, bizim xasiyyətimiz nədir? Şairin sualları da, özü tərəfindən bu suallara verilən cavablar da oxucunu düşündürür. "İsgəndərnamə" əsərinin sonunda belə bir ideyanı təlqin edir ki, cəmiyyətin xoşbəxtliyi onu təşkil edən fərdlərin mənəvi kamilliyinə bağlıdır. Nizamiyə görə, kamilliyin birinci şərti Yaradanı tanımaq və özünü dərk etməkdir. Özünü dərk etməyən insan məqamını dərk edə bilməz. Ağıl, iradə, iman və sevgi həqiqətin dərkinə aparır. Şairin səadət quşu olan Hümaya bənzətdiyi insan ədalətli, mərd, xeyirxah olarsa, Tanrının ona bəxş etdiyi məqamı qoruyub saxlaya bilər. Kainatda nə varsa, insanda da mövcuddur. Nizami yazır ki, kainatın hərflərini axtarmaq istəsən, hamısı səndədir. Ağıl və sevginin vəhdəti insanı doğru yola istiqamətləndirir. Şair belə bir nəticəyə gəlir ki, bəşəriyyətin nicatı ədalətin yer üzündə bərqarar olmasındadır. O qeyd edir ki, dünya yaxşıların üzərində qərar tutur. Tanrıdan başqa nə varsa fanidir. Bütün canlıları "müvəqqəti vücudlar" adlandırır. Bu "müvəqqəti vücudlar" gözlərini ədəblə nurlandıraraq bir-birinə xidmətdədirlər. Xidmət sifəti insanlığın surətidir. Nizamini insanın yer üzərindəki missiyası düşündürür.

Mənəvi kamilliklə bağlı düşüncələrində Nizami ağlın və elmin rolunu xüsusi qeyd edir. Onun fikrincə, nəzər saldığımız hər nəsnədə gizli bir xəzinə vardır. Şair milli və dini dəyərləri təlqin etməklə yanaşı zamana uyğunlaşmağı da vacib sayır. Çünki hər kəs öz yaşadığı dövrün övladıdır. Mütəfəkkir belə hesab edir ki, sağlam düşüncə səadətə gedən yolun işığıdır. Özünü tanıyan Tanrını tanıyır və nəfsin qaranlığından təmizlənir. Bu zaman insan ruhunun pak işığı zahirə çıxır. Şərq fəlsəfəsinə görə, qəlb pasdan təmizlənməsə işığı əks etdirə bilməz. İnsanın qəlbi və üzü klassik ədəbiyyatda aynaya bənzədilir. Üzdə və gözlərdə əks olunan qəlbdən gələn nurdur. Nizamiyə görə, insan daxilindəki işığın gücü ilə diri ikən əbədiliyi əldə edə bilər. Buna işarə edərək yazır ki, ölü bir şəxsəm, ancaq mərdanə gedirəm. Dirilər karvanı ilə gedirəm, amma bu karvandan deyiləm. Nizami insan və zamanla bağlı deyilməmiş məna qoymamış, özünün də qeyd etdiyi kimi mənalar fəziləti ilə yeri və zamanı göylərin fərmanına əsasən tutmuşdur. Yəni o, zamanın və məkanın fövqündədir.

İnsan nəfsinin köləsi olmamalıdır, özünü tanıyan insan, nəfsini ağlına tabe edərək əbədilik qazana bilər. Mütəfəkkirin fikrincə, ağıl bağışlanamış can Tanrının bizə bəxşişidir. Can ağılla əbədi diridir. Yaradanın hədiyyəsi olan idrak qabiliyyəti və qəlbindəki sevgi, iman Nizamiyə ölməzlik qazandırdı. Nizami mənəviyyatını qoruyaraq, mənəvi dəyərləri yaşadaraq, ağlın göstərdiyi yol ilə gedib elmin qapılarını səylə açaraq axtardığı işığı tapdı. Ona ölməzliyi qazandıran da məhz bu işıq, yəni düşüncənin işığı oldu.

Nizami yaradıcılığında qadın obrazları da diqqəti cəlb edir. Nizami XII əsrdə gender bərabərliyi ideyasını Məhinbanu, Şirin, Nüşabə obrazları ilə əks etdirir. Qadının cəmiyyətdəki aparıcı rolunu ilk dəfə bədii ədəbiyyatda Nizami yaradıcılığında görürük. Sənətkara görə, qadının müstəqil fikir yürütmək hüququ və sevmək haqqı var. Nizami qadın hüquqlarının müdafiəçisidir. Şair ərəb rəvayətlərinin hüquqsuz, aciz Leylisini dünya ədəbiyyatının ən cəsarətli aşiqinə çevirə bilmişdir.

İnsan xarakterinin və dünyagörüşünün formalaşmasında genetik faktorla yanaşı, mühitin təsirini də vurğulayır. Gəncəvi 14 yaşlı oğluna faydası olan elmi öyrən, sənin sabahkı munisin sənin bu günündür kimi məsləhətlər verir. Nizaminin oğlu Məhəmmədə nəsihətləri hər dövrün gəncliyinə önəmini itirməyən tövsiyələrdir. Sağlam qidalanmadan tutmuş ekologiyanın təmizliyinə qədər zamanın hər dönəmində aktual olan məsələlər şairin diqqət mərkəzində olmuşdur. Eləcə də, bütün dinlərə, millətlərə və irqlərə hörmətlə yanaşması Nizami yaradıcılığını ən ali mərtəbəyə qaldıran və sevdirən keyfiyyətlərdəndir. Həmid Araslı Nizamini insanşünas adlandırırdı. Nə qədər ki insan var, yer üzündə həyat var Nizami yaradıcılığı aktuallığını itirməyəcək.

Nizami yaradıcılığının sehri nədir? sualına cavab olaraq deyə biərəm ki, böyük mütəffəkir insana özünü dərk edərək sevməyi öyrədir. Tanrını və yaratdıqlarını sevməyi, həyatı sevməyi, özünü sevməyi. Yaradılışdan məqsəd sevgidir. Sevgi ilə qidalanmış düşüncənin qarşısında heç bir qüvvə dura bilməz. Çünki bu zaman insan ruhunun pak işığı zahirə çıxır. Nizami qələminin sehri bundadır.

**Ədəbiyyat**

1. Decree of the President of the Republic of Azerbaijan Mr. Ilham Aliyev dated January 5, 2021
2. “Nizami Ganjavi 870”, “Adiloglu” Baku-2011
3. Nizami Ganjavi's poem "Khosrov and Shirin". "Adiloglu" Baku-2011
4. Nizami Ganjavi “Iskendername” Leader publishing house Baku-2004
5. Alibeyzade E. “Nizami and our history”, Baku-2004
6. Arzumanli V. "World fame of Nizami Ganjavi". Gartal, Baku-1997

**Rəyçi: dos.D.F.Hümbətova**

Göndərilib: 02.04.2021 Qəbul edilib: 08.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/112-115

**Nəzakət Əli qızı Quliyeva**
Beyləqan şəhər R.Abbasov adına
4 nömrəli tam orta məktəb
psixoloq
nezaketquliyeva6@gmail.com

## MƏKTƏB PSİXOLOQUNUN İŞ PRİNSİPİ VƏ PSİXOLOJİ XİDMƏTİN ƏSAS İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *məktəb, psixoloq, psixoloji dəstək, insan tərbiyəsi, şəxsiyyətin formalaşması, psixoloqun parametrləri*

### The principle of work of a school psychologist and the main directions of psychological services

**Summary**

It is clear that the school psychologist performs psychological services at school. However, it is not possible to implement this important issue qualitatively by one specialist. Therefore, the whole pedagogical staff, or more precisely, every teacher must have the skills to provide psychological services at school. In the end, the greatest responsibility still falls on psychologists. The main goal of the work of a school psychologist is to be able to freely implement psychological methods and tools to achieve a solution to the problem on the basis of an individual approach.

Psychological research has long shown that it is much more difficult to eliminate a defect in a student's mental development than to prevent it in advance. Here the importance of psycho-prophylactic work is especially noteworthy. This aspect should be taken into account during psychological services at school.

***Key words:*** *school, psychologist, psychological support, human education, personality formation, psychologist parameters*

Müasir dövrdə insan tərbiyəsi və onun formalaşması olduqca aktual və özünəməxsus çətinlikləri olan bir prosesdir. Bu işin həyata keçirilməsi insanı öyrənən müxtəlif elmlər sisteminin əsas predmetinə çevrilib. Lakin etiraf etməliyik ki, insanın bir şəxsiyyət kimi formalaşmasının parametrləri və mexanizmlərini bütün dövrlərdə öyrənən psixologiya elmidir.

"İnsan şəxsiyyətinin formalaşması prosesi müxtəlif mərhələləri və sistemləri əhatə edir. Bu sistemləri mikro, mezo, ekzo və makrosistemlər adlandırırlar. Mərhələli və fasiləsiz surətdə həyata keçirilən bu işin təşkili əsasən mikro sistemə aid olan orta ümumtəhsil məktəblərinin payına düşür. Orta ümumtəhsil məktəblərində yeni insan tərbiyəsi ilə müxtəlif ixtisaslı kadrlar məşğul olur. Lakin bu işin həyata keçrilməsi heç də hər zaman problemsiz ötüşmür və ortaya bir sıra çətinliklər çıxır. Qarşıya çıxan bu çətinliklərin aradan qaldırılmasında isə məktəb psixoloqlarının rolu əvəzsizdir" (1, 242).

Bu işin yerinə yetrilməsi bir sıra amillərin nəzərə alınmasını özündə ehtiva edir.

1) Tərbiyə olunanın şəxsiyyətinin parametrləri.

2) Onun şəxsiyyətinin formalaşması işini həyata keçirən məktəb psixoloqunun şəxsiyyətinin parametrləri.

3) Psixoloji xidmətin həyata keçirildiyi konkret şərait və bu şəraitin imkanları.

Elə bu səbəbdən də bizi haqlı olaraq aşağıdakı suallar narahat edir:

✓Məktəb psixoloqu kimdir və onun şəxsiyyətində hansı psixoloji parametrlər öz əksini tapmalıdır?

✓Onun işinin əsas istiqamətlərini nələr təşkil etməlidir?

✓Müasir dövrdə bu işin həyata keçirilməsi üçün konkret şərait imkanları hansı üstünlükləri ilə seçilir və məktəb psixoloqunun öz işini müasir tələblər baxımından qurmasına necə təsir edir?

Məktəb psixoloqu kimdir və onun şəxsiyyətində hansı psixoloji parametrlər öz əksini tapmalıdır?

Yığcam halda bu parametrləri aşağıdakı kimi qruplaşdırmağı məqsədəuyğun hesab etmək olar: Azərbaycançılıq ideologiyasına sadiq olan; daim milli maraqları üstün tutan və ümumbəşəri dəyərləri qoruyan; öz peşəsini sevən; savadlı; uşaqları sevən və onlara məhəbbətlə yanaşan; özünün və insanların şəxsiyyətinə hörmətlə yanaşmağı bacaran; liderlik xüsusiyyətlərinə malik; yeni innovasiyalardan xəbərdar; təşkilatçı; təşəbbüskar; öz şəxsi nüfuzunu qoruyan; özünə inamlı.

Oxuduğumuz ədəbiyyatlardan və həyatda qazandığımız təcrübədən aydındır ki, psixoloji yanaşmada şəxsiyyətin nümunəvi təsir imkanları ən əsas amil rolunu oynayır. Bu baxımdan yuxarıda məktəb psixoloqunun şəxsiyyətində öz əksini tapması zəruri olan parametrlər yeni insan tərbiyəsində qarşıya çıxacaq problemlərin həlli istiqamətində nümunəvi tərbiyəvi təsir gücünə malik, olduqca mühüm təsiredici

elementləridir. Hər bir məktəb psixoloqu öz şəxsiyyətinin təkmilləşməsində bu elementlərin formalaşmasına xüsusi diqqət yetirməlidir.

***Müasir dövrdə məktəb psixoloqunun işinin əsas istiqamətlərini nələr təşkil etməlidir?***

Müasir dövr bütün istiqamətlərdə olduğu kimi, məktəb psixoloqunun da öz işinə yeni tələblər baxımından yanaşmasında əsaslı dönüşlər yaratması üçün qarşısına bir sıra zəruri vəzifələr qoyur. Bu vəzifələrin müəyyənləşməsi və icrası işinin təşkilində milli maraqlar nəzərə alınmaqla yanaşı müasir dövrün "Qloballaşma əsri" olduğunu da unutmamalıyıq.

Psixoloqların da dediyi kimi düzgün və vahid tərbiyə bu gün demək olar ki, mümkün deyil. "Əvvəlki dövrlərdə təlimin məqsədi, davranış normaları, tərbiyə standartları məlum idi. İndi qapalı cəmiyyətlər açıq cəmiyyətlərlə əvəz olunur və belə də az qala hər ailənin öz tərbiyə sistemi, etik görüşləri olur və hər bir ailə öz dünyagörüşü, etiqadına uyğun gələn tərbiyə sistemi qurur. Deməli, yeni dövrdə insan şəxsiyyətinin formalaşması artıq milli konteksdən çıxaraq qloballaşıb. Elə bu baxımdan da bu əsrin adını "Qloballaşma əsri" adlandırırlar" (2, 257). Məktəb psixoloqu yeni insan tərbiyəsində yaranmış problemlərin həllində qloballaşmanın da təsir imkanlarını dəyərləndirməli və müxtəlif psixoloji problemlərin yaranma səbəblərini məhz bu təsir imkanlarında da axtarmağı bacarmalıdır.

Məktəbə psixoloji xidmətin əsas istiqamətləri və sahələrini aşağıdakı şəkildə müəyyənləşdirmək olar: psixoprofilaktik işlər, konsultativ işlər, diaqnostik işlər, korreksiya işləri, yardımçı işlər.

Bu işlər bir növ məktəbə psixoloji xidmətin, o cümlədən məktəb psixoloqunun funksiyalarını təşkil edir. Həmin fəaliyyət sahələrini ayrı-ayrılıqda nəzərdən keçirək.

***Məktəbə psixoloji xidmət prosesində yerinə yetirilən psixoprofilaktik işlər***

Psixoloji tədqiqatlar artıq çoxdan sübut etmişdir ki, şagirdin psixi inkişafında baş verən bu və ya digər qüsuru aradan qaldırmaq, əvvəlcədən həmin qüsurun baş verməsinin qarşısını almaqdan qat-qat çətindir. Buradan isə psixoprofilaktik işlərin əhəmiyyəti xüsusi olaraq diqqəti cəlb edir. Həmin cəhət məktəbə psixoloji xidmət zamanı da nəzərə alınmalıdır. Bəs bu işin mahiyyəti nədən ibarət olmalıdır? Psixoprofilaktik işlər başlıca olaraq məktəb təlimi prosesində uşaqların psixi inkişafında baş verə biləcək qüsurların qarşısını almaq məqsədilə həmin inkişafın gedişi üzərində nəzarətin təşkilindən ibarətdir. Müəllimlə birlikdə psixoloq şagirdin əqli inkişafında və şəxsiyyətinin inkişafında müəyyən qüsurların, yayınma hallarının baş verməsinə səbəb ola biləcək xüsusiyyətləri aşkara çıxarmağa cəhd göstərir və müvafiq tədbirləri həyata keçirir. Bu zaman birinci növbədə uşağın həyatının keçid mərhələləri, məsələn, onun əsas fəaliyyət növünün kəskin şəkildə dəyişməsi ilə nəticələnən məktəbə daxil olma dövrü, yaxud yeniyetməlik dövrünün başlanması və s. üzərində nəzarətə xüsusi yer verilməsi lazım gəlir. Ona görə də məktəb psixoloqu uşaqların birinci sinfə qəbulunda iştirak etməli və bu zaman onların zəif, normalara uyğun gəlməyən cəhətlərini aşkara çıxarmalı, onların nail olduqları səviyyə ilə yanaşı müvəffəqiyyətlə oxumalarına müsbət və ya mənfi təsir göstərə biləcək idrak fəallığının, məktəbə motivləşmə, emosional-iradi cəhətdən hazırlığın inkişaf xüsusiyyətlərinə xüsusi diqqət yetirməlidir.

"Məktəb psixoloqunun profilaktik fəaliyyətinin ən perspektiv formalarından biri psixoloji-pedaqoji konsiliumun keçirilməsindən ibarətdir. Psixoloji-pedaqoji konsilium zamanı sinifdə dərs deyən müəllimlər psixoloqla birlikdə bu və ya digər şagird və ya bütövlükdə sinif haqqında fikirlərini birlikdə, kollektiv şəkildə müzakirə edir, çətinliyin və geridə qalmanın səbəblərini aşkara çıxarır, eyni zamanda bu və ya digər çətinliyin qarşısını almaq, onu aradan qaldırmaq üçün səmərəli yollar düşünürlər" (3, 2). Psixoloji-pedaqoji konsilium, eyni zamanda, ümumi orta təhsil şəraitində xüsusi aktuallıq kəsb edən və mürəkkəb xarakterə malik olan şagirdlərdə meyl, qabiliyyət və talantın inkişaf etdirilməsi problemini dərindən həll etməyə imkan verir.

***Məktəbə psixoloji xidmət prosesində yerinə yetirilən məsləhət (konsultativ) işləri***

Məktəbə psixoloji xidmət fəalyyətində müəllim, şagird və valideynlərlə aparılan məsləhət işləri əsas yerlərdən birini tutur. Məktəb psixoloqunun apardığı bu cür məsləhətlər fərdi və qrup halında keçirilə bilər. Hər ikisində əsas məqsəd bu və ya digər çətinliklərin mahiyyətini açmaq və onları aradan qaldırmaq üçün müvafiq psixoloji yollar göstərməkdən ibarətdir. Adətən, psixoloq məktəb müəllimlərinə aşağıdakı hallarda məsləhət verməli olur: şagirdlərin tədris materialını mənimsəmələrindəki çətinliklər, oxumaq həvəsinin olmaması və oxuya bilməmələri ilə bağlı, müəllimlə sinif arasında münaqişə yarandıqda, aparılan pedaqoji təsir vasitələri nəticə vermədikdə, müəllimin şagirdlərlə və şagirdlərin bir-biri ilə ünsiyyətindəki çətinliklərlə əlaqədar, şagirdlərin maraq, meyl və qabiliyyətlərini aşkara çıxarmaqla bağlı, şagirdlərin peşə yönümü, peşə seçmələrinə istiqamət verməklə bağlı və s. Psixoloq şagirdlərlə fərdi olaraq tədris, inkişaf, öyrənmənin səmərəli yolları, həyat mövqeyini müəyyənləşdirmək, böyüklərlə və yoldaşları ilə ünsiyyət, özünütərbiyə və

s. məsələlər ətrafında məsləhət keçirə bilər. Bununla yanaşı olaraq bir qrup şagirdlərlə və ya siniflə özünü tərbiyə, əqli əmək mədəniyyəti və s. problemlər ətrafında məsləhət təşkil edə bilər.

***Məktəbə psixoloji xidmət prosesində yerinə yetirilən diaqnostik işlər***

Psixoloji xidmətdə əsas yerlərdən birini diaqnostik işlər tutur. Bu işlərin əsas üstün cəhətləri ondan ibarətdir ki, psixoloqun köməyi ilə şagirdlərin həm əqli, həm də şəxsi imkanları aşkara çıxarılır. Bununla da şagirdlərin fəaliyyətini və inkişafını idarə etmək prosesi asanlaşır. Məhz buna görə də təlim və tərbiyə prosesində ayrı-ayrı şagirdlərin təlim və tərbiyəsindəki qüsurların psixoloji səbəblərinin aşkara çıxarılması və onların aradan qaldırılması yollarının müəyyənləşdirilməsi məktəbə psixoloji xidmət işində mərkəzi yer tutur. Bunun üçün psixoloji xidməti təşkil edən şəxsdən xüsusi hazırlıq tələb olunur. Bu işi aparan adam düzgün sual verməyi, psixoloji problemi müəyyənləşdirməyi, lazımi məlumatı əldə etməyi, həmin məlumatları təhlil etməyi və bütün bunların əsasında zəruri nəticəyə gəlməyi bacarmalıdır. “Məktəbə psixoloji xidmətlə əlaqədar olaraq psixoloq aşağıdakı diaqnostik işləri həyata keçirməlidir:

✓ayrı-ayrı fənnlər üzrə şagirdlərin mənimsəyə bilməmələrinin psixoloji səbəblərini aşkara çıxarmaq;

✓şagirdlərin intizamsızlıqlarının psixoloji səbəblərinin diaqnostikası;

✓şagirdlərin əqli inkişafının, şəxsiyyətinin və emosionaliradi xüsusiyyətlərinin diaqnostikası;

✓şagirdlərin sinif yoldaşları ilə qarşılıqlı münasibətlərinin pozulmasının, sinifdə şəxsiyyətlərarası münasibətlərin pozulmasının səbəblərinin psixoloji diaqnostikası;

✓şagird-müəllim, sinif-müəllim münasibətlərinin pozulmasının səbəblərinin psixoloji diaqnostikası;

✓uşağın məktəbə hazırlığının psixoloji diaqnostikası;

✓şagirdlərin ibtidai məktəbdən orta məktəbə keçməyə hazır olmalarının psixoloji diaqnostikası;

✓şagirdlərin yeniyetməlik dövründən ilk gəncliyə keçməyə hazır olmalarının psixoloji diaqnostikası və s.

Şübhəsiz bütün bu cür diaqnostik işləri necə gəldi aparmaq mümkün deyildir. Bunun üçün psixoloq düşünülmüş və bütün tələblərə cavab verən metodlardan istifadə etməlidir” (4, 17).

***Məktəbə psixoloji xidmət prosesində yerinə yetiriləcək korreksiya işləri***

Məktəbə psixoloji xidmət təkcə diaqnostik işləri həyata keçirməklə də başa çatmır. Bu və ya digər çətinliyi və onun səbəbini aşkara çıxarmaqla yanaşı (istər intellektual, istərsə də şəxsiyyət baxımından) psixoloji xidməti həyata keçirən mütəxəssis həmin çətinlikləri aradan qaldırmaq, təshih etmək üzrə də iş aparmalıdır. Yalnız bu zaman nəzərdə tutulmuş nəticəni əldə etmək mümkündür. Məhz buna görə də psixoloji xidmət zamanı aşağıdakı korreksiya işlərinin həyata keçirilməsi zəruridir:

✓şagirdlərin şəxsiyyətində, əqli inkişafında, emosional iradi xüsusiyyətlərində özünü göstərən çətinliklərin aradan qaldırılması;

✓şagirdlərin yaşlılar və həmyaşlıları ilə qarşılıqlı şəxsiyyətlərarası münasibətlərində özünü göstərən qüsurların aradan qaldırılması.

Adətən, korreksiya proqramının həm psixoloji, həm də pedaqoji cəhətləri vardır və onların həyata keçirilməsi birbirindən müəyyən dərəcədə fərqlənir. Psixoloji korreksiya psixoloq tərəfindən planlaşdırılır və həyata keçirilir. Pedaqoji korreksiya isə məktəb psixoloqu müəllimlərlə birlikdə (məktəb direktoru, dərs hissə müdiri, sinif rəhbəri, fənn müəllimi) planlaşdırılır, psixoloqun nəzarəti və köməkliyi ilə müəllimlər və valideynlər tərəfindən həyata keçirilir.

***Məktəbə psixoloji xidmət prosesində yerinə yetiriləcək yardımçı işlər***

Məktəbə psixoloji xidmətlə əlaqədar əsasnamədə yuxarıda qeyd olunanlarla yanaşı, bir sıra yardımçı işlərin həyata keçirilməsi də nəzərdə tutulur. Həmin işlər bu və ya digər şəkildə əsas işlərlə bağlanır və onların həyata keçirilməsinə xidmət edir. Psixoloji xidmət zamanı yerinə yetirilən həmin yardımçı işlərə aşağıdakıları aid etmək mümkündür:

✓məktəb psixoloqu şagirdlərin davranış və mənimsəmələrinin psixoloji təhlilini vermək və burada onların şəxsiyyətlərinin və qabiliyyətlərinin fərdi psixi xüsusiyyətlərini daha dəqiq, ətraflı açmaq məqsədilə pedaqojikonsilium təşkil edir;

✓məktəb psixoloqu məktəbin pedaqoji şurasının işində iştirak edir;

✓psixologiya kabinəsi və məktəb kitabxanasının köməyi ilə müxtəlif yaşlı uşaqların təlim və tərbiyəsi problemlərinə dair psixoloji-pedaqoji ədəbiyyatdan və şagirdlər üçün psixoloji ədəbiyyatdan ibarət bölmə, "kitabxana" yaradır.

Məktəbdə psixoloji xidmətin qeyd olunan istiqamətlərini müxtəlif konkret sahələrə tətbiq etmək mümkündür. Bunların ən əsaslarından bəzilərini nəzərdən keçirək.

***Məktəbə psixoloji hazırlığın diaqnostikası***

Məktəbə psixoloji xidmətdə əsas yerlərdən biri uşaqların məktəbə psixoloji hazırlığının diaqnostikasını verməkdən ibarətdir. Bu sahədə aparılan işin əhəmiyyəti öz-özünə aydındır. Uşağın məktəbə, məktəb təliminə psixoloji hazırlıq səviyyəsini müəyyənləşdirmək bir tərəfdən həmin sahədəki qüsurları aradan qaldırmaq, digər tərəfdən məktəbdə ilk gündən şagirdlərin imkanlarına uyğun iş aparmaq üçün şərait yaradır. Məhz buna görə də məktəb psixoloqu (sinif muəllimi ilə birlikdə) birinci sinfə qəbul olunacaq uşaqların məktəbə psixoloji hazırlıq səviyyəsini aşkara çıxarmalıdır.

Psixofizioloji tədqiqatlardan məlum olduğu kimi, həmin yaş dövründə uşaqların əqli iş qabiliyyətinin səviyyəsi məhz 20-30 dəqiqədən ibarət olur. Digər tərəfdən, uşağı I sinfə yazdırmaq üçün valideynlər onu bir neçə dəfə yoxlamaya gətirməyə o qədər də razılıqla yanaşmırlar. İkincisi, psixoloji yoxlamaları valideynin iştirakı ilə aparmaq məqsədə müvafiqdir. Belə olduqda uşaqlarda və valideylərdə gərginliyin yaranmasının qarşısı alınır. Yoxlamadan əvvəl valideynlərə izah olunur ki, yoxlamanın məqsədi uşağı imtahan etməkdən ibarət deyildir. “Burada əsas məqsəd uşağın imkanlarını aşkara çıxarmaq və gələcəkdə onunla işləmək üçün müvafiq yollar düşünməkdən ibarətdir. Yoxlama motivinin bu cür izahı valideynin psixoloqa inamla yanaşmasına və yeri gələndə ona köməklik göstərməsinə imkan yaradır” (5,18). Üçüncüsü, yoxlamanın nəticələri uşağın xüsusiyyətlərinin keyfiyyət xarakteristikasını verməlidir. Gələcək I sinif şagirdləri üzərində aparılan eksperimental psixoloji yoxlama suallardan başlanmalıdır. Adətən, bu cür suallar standart xarakter daşıyır: sənin adın nədir?, neçə yaşın var?, uşaq bağçasına gedirsənmi? və s. sualları verməklə psixoloq öz təbəssümü ilə uşaqları ruhlandırmalıdır. Burada yeri gəldikcə bu və ya digər cəhətə əsasən uşağı tərifləmək tələb olunur. Məsələn, qıza belə demək olar ki, sənin nə yaxşı donun, saçın var? Oğlana demək olar ki, afərin, nə yaxşı oğlansan, yəqin atanın yaxın köməkçisisən və s.

Məlumdur ki, orta məktəbdə təhsil alan şagirdlərdə oturaq bir fikir yoxdur. Bunlar zaman-zaman formalaşır. Diqqəti bu istiqamətə yönəltmək lazımdır. Bunun üçün məktəb-valideyn-uşaq sistemi dəqiq işləməlidir. Əgər sinif rəhbərləri, fənn müəllimləri məktəb psixoloqu ilə davamlı olaraq əlaqə saxlasa, öz şagirdlərində müşahidə etdiyi psixoloji vəziyyəti psixoloqla bölüşsə, eyni zamanda şagirdlərin psixoloqla görüşünü təşkil etsə, o zaman “çətin uşaq” anlayışı ortaya çıxmaz. Amma çox təəssüf ki, bu gün reallıq başqadır. Müəllim öz dərsini keçməklə öz missiyasının tamamlanmış olduğunu düşünür. Müəllim şagirdləri ilə, hər şeydən öncə, bir dost, bir sirdaş kimi münasibət qurmalıdır. Yeri gələndə həll edə bilmədiyi hər hansısa bir durumu psixoloqla məsləhətləşərək həll etməli və bu, şagirdin xeyrinə həll olunmalıdır. Əgər məktəblərdə şagird-psixoloq münasibəti normal səviyyədə qurulsa, bu, istər-istəməz şagirdlərdə sağlam psixologiyanın yaranmasına səbəb olacaqdır. Nəticədə, şagirdlər mükəmməl bilik və savada yiyələnəcəklər.

**Ədəbiyyat**

1. Hamzayev M.A. Pedagogical psychology. Baku, 1991
2. Hamzayev M.A. Basics of age and pedagogical psychology. - Baku, 2003
3. Alizade A.A. Psychological service to school: problems, thoughts // Azerbaijan school, 1993, №3.
4. Aliyev R.I. Actual issues of school psychological service. Baku, 2004.
5. Mammadzade R.H. Psychological services in educational institutions. Baku, 1996.

**Rəyşi: dos. S.Mirzəyeva**

Göndərilib: 02.04.2021 Qəbul edilib: 08.04.2021

ELMİ İŞ beynəlxalq elmi jurnal. Impakt faktorlu. 2021 / Cild: 15 Sayı: 4 ISSN: 2663-4619
SCIENTIFIC WORK international scientific journal. With Impact Factor. 2021 / Volume: 15 Issue: 4 e-ISSN: 2708-986X

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/116-119

**Xalidə Qələndər qızı İsmayılova**
Bakı, Azərbaycan

# NADİR ŞAHIN DÖVLƏTÇİLİK ƏZMİ

***Açar sözlər:*** *Nadir Şah, Təhmasib, Xətai, dövlətlətçilik, sərkərdə*

## Nadir Shah's determination to statehood

**Summary**

The article "Nadir Shah's determination to statehood" is a scientific analysis of Nadir Shah's legacy of statehood, his historical perspectives, and state-building resources in general, who fought strongly and decisively for the ideas of Azerbaijanism and the renaissance of statehood. In short, the exceptional services of this great and powerful commander in the history of Azerbaijan have been studied from a wide angle.

The article highlights Nadir Shah's success, ability and restraint in state and military affairs as a special case. It is not overlooked that these processes played a significant role in the Shah's determination to win, emphasizing security as a key issue.

It turns out that Nadir Shah, like Shah Khatai, had always considered the internal strife that dragged our country into the abyss to be extremely urgent, and used his political wisdom, rich management experience, rescue and creative mission to conquer large areas in difficult, extreme conditions. Basically, he took decisive steps to solve these fateful tasks quickly, and the implementation of his multi-vector action plan was one of the important tasks for Nadir Shah at that time.

***Key words***: *Nadir Shah, Tahmasib, Khatai, statehood, warlord*

## Giriş

Dövlətçilik, milli dövlət hissi hər bir xalqın mövcudluğunun əsas şərtidir. Hər bir xalq tarix boyu özünütəsdiq imkanı əldə etmək və milli dövlət yaratmağa çalışmış, eyni dilə, dinə, mənəvi irsə, adət-ənənə və dəyərlər sisteminə məxsus insanlar qrupu tarixən konkret məkan və ərazi hüdudlarında milli dövlətlərini yaratmaq idealı ilə yaşamışdır. Milli dövlətə mənsubluq hər xalqa nəsib olmasa da, insanlar tarixən nəyə qadir olduqlarını, çətin mübarizə yollarını, dünya dövlətləri sırasında layiqli yer tutmaq əzmini şərəflə nümayiş etdirmişlər. Məhz sınaqdan çıxmış təcrübə də göstərir ki, xalqların təşəkkül tapması prosesində milli dövlət mühüm rol oynayır.

Azərbaycan xalqı da bildiyimiz kimi, tarixən milli dövlət qurmaq uğrunda davamlı mübarizə aparmış və əsrlər boyu özünün müstəqil dövlətçilik ideallarının gerçəkliyə qovuşması üçün ciddi cəhdlər etmişdir. Bu mənada, minilliklərin sınağından çıxmış təcrübə göstərir ki, fenomenal keyfiyyətlərə, yüksək dövlətçilik və idarəçilik təfəkkürünə malik lideri olmayan xalqlar nəinki müstəqil dövlət yarada bilməmiş, hətta dünya səhnəsindən tamamilə silinmək təhlükəsi ilə üzləşmişlər...

Bəllidir ki, dövlətçilik işində əsas amil həm də zamana təsir etməyi bacarmaqdır. Zamanın nəbzini tutmağı, hadisələrə real qiymət verməyi bacaran, siyasi potensialını düzgün dəyərləndirə bilən liderlər cəmiyyətdəki siyasi prosesləri istiqamətləndirməyə nail olmuş, milli inkişafın əsasına çevrilən cəlbedici proqram və konsepsiyaların müəllifinə çevrilmişlər. Hərbi nailiyyətlərinə görə bəzi tarixçilərin Şərqin Napoleonu və ikinci Makedoniyalı İsgəndər kimi ləqəblər verdikləri Nadir şah da məhz bu keyfiyyətləri ilə düzgün dövlət idealı formalaşdırmışdır.

Bilirik ki, Nadir şah (22 oktyabr 1688 (1689) -19 iyun 1747) Azərbaycan, Türküstan və Hindistanın şahı (1736-1747), türksoylu əfşarlar sülaləsinin banisi kimi tarixə düşmüşdür. Azərbaycan türklərindən olan bu böyük sərkərdə, dövlət xadimi, Azərbaycan tarixinin görkəmli şəxsiyyətlərindən biri kimi dövlətçilik işində xüsusi xidmətlər göstərmiş, tarixdə həmçinin Nadirqulu bəy və Təhmasibqulu xan adları ilə də tanınmışdır. Əsas etibarilə, onun dövlət qurmaq əzmində başlıca istiqamətlər müstəqillik və dövlətçlik rifahı olmuşdur.

Müstəqillik dövlətçilik rifahının və ölkə islahatlarının əsasıdır. Dövlətlər milli hissi qorumaq üçün daim bu amala xüsusi diqqət yetirmişlər. Hələ əsrlər əvvəl dövlətçilik hissinin bərqərar olmasının təsirli mexanizmləri sırasında istiqlaliyyət həlledici rol oynamışdır. Bu üzdən xalq hakimiyyətinin həyata keçirilməsinin təmin edilməsi məhz müstəqil ideyalar nəticəsində meydana çıxmışdır. Bu proses hakimiyyətin xalq etimadını əldə etməsinin ən təsirli və sınanmış vasitəsidir; bütün zamanlarda cəmiyyətləri ədalətsizlikdən və diktatura təhlükəsindən qorumuşdur.

Məhz 1688-ci ildə Xorasan vilayətinin Dərgəz mahalının Dəstgird kəndində köçəri maldarlıqla məşğul olan bir ailədə dünyaya gəlmiş Nadir də hələ uşaq yaşlarından sinfi əzilməni pisləmiş, özünün diribaş, hazırcavab, fərasətli və bacarıqlı olması ilə diqqət çəkmişdir. Tarixçilər bu kimi halların balaca Nadirdə əbəs yerə

yaranmadığın qeyd etmişlər. Çünki ağlı kəsən vaxtlarda qul kimi satın alınan, ağır, iztirablı və məşəqqətli həyat yaşayan Nadir yaşa dolduqca ölkə və dövlətçilik hislərini hər kəsdən daha yaxşı qavramağa başlamış, qəti əmin olmuşdur ki, insanların həyat rifahını möhkəmləndirən əsas aspektlərdən biri istiqlaliyyətdir. O, yeniyetmə və gənc yaşlarından bu istiqamətdə məqsədyönlü işlər görmək üçün böyük təcrübəyə və ağıla malik olmağın da yollarını axtarmışdır. Bəs buna necə nail olmalı? Bu sual onu gecə-gündüz düşündürmüşdür. Nəhayət, gənc Nadir öz-özlüyündə qərar vermişdir ki, güclü dövlətçilik prinsipləri qurmaq, xalqın qul vəziyyətinə düşməməsi üçün hadisələrə birinci növbədə, mövcud qanunvericiliyin hüquqi aspektləri prizmasından yanaşmaqla sosial həyatın tələblərini vətəndaş missiyası ilə qoşalaşdırmaq lazımdır.

Gənc Nadir XVII əsrin sonu XVIII əsrin əvvəllərində Səfəvilər dövlətinin qorxunc iqtisadi və siyasi böhran keçirdiyi, ölkənin mərkəzi və şərq hissəsinin əfqan işğalı altına düşdüyü vaxt bu fikrə düşmüşdü və mübarizə yolları barədə bir sıra tezislər də hazırlamışdı. Həmin vaxt Azərbaycan, Şirvan və həmsərhəd ərazilər də Osmanlı İmperiyası tərəfindən işğal olunmuşdu. Rusiya da bir tərəfdən böyük fəallıq göstərməyə başlamış, 1723-cü ildə I Pyotr Bakı üzərinə yürüş etmiş və Xəzərboyu əraziləri ələ keçirmişdi. Qısası, həmin dövrdə faktiki olaraq, Mazandaran vilayətindən başqa heç bir yer müstəqil deyildi. Tarixdən bəlli olduğu kimi, oraya da hələ Səfəvilərin hakimiyyətinin sonlarından bəri möhkəmlənmiş Fətəli xan Qacar hökmranlıq edirdi. O, Səfəvi şahı Sultan Hüseynin əfqanların əlindən qurtulmuş oğlu Təhmasibi öz sarayında saxlamış, az sonra Təhmasib özünü şah elan etmişdi. Ölkədə qərarlaşmış vəziyyət isə həm kəndlilər, həm şəhər əhalisi, həm də zadəganlar arasında haqlı narazılıq doğurmuşdu. Bu məqamda işğalçılara qarşı mübarizədə rəhbərliyi öz üzərinə götürə biləcək bir liderə ehtiyac yaranmışdı. Nəhayət, o zaman çox da tanınmayan, İranın gələcək şahı, türk mənşəli əfşarların Qırxlı boyundan olan Nadir (Nadirqulu xan Əfşar) bu imkandan maksimum yararlanmağı qarşısına məqsəd qoymuşdu. İçindəki qisas yanğısı onun bu israrını bir qədər də artırmışdı. Bilirik ki, hələ on səkkiz yaşı tamam olmamış Nadir anası ilə birlikdə Xarəzm özbəklərinin yürüşlərindən birində əsir alınmış və qul edilmişdi. Çox keçmədən o, əsirlikdən qaçıb Xorasana qayıtmış, Əbivərd hökmdarı Baba Əli bəyin yanında qul kimi çalışmışdı. Azadlığının əlindən alınmasına dözə bilmədiyi üçün o, başına kiçik bir dəstə toplamış, Xorasan əyalətlərinin bir neçəsini tutduqdan sonra özünü Nadirqulu bəy adlandırmışdır. Əlbəttə, təcrübəsizlik tarixi döyüşlərdə çox vaxt məğlubiyyət acısı yaşadır. Bunu Nadir özü də yaxşı hiss etmiş, qüdrətli feodal Məlik Mahmud qarşısında tab gətirə bilməmiş və kömək üçün şah I Təhmasibə müraciət etmişdir. Bu müttəfiqlik həm onun təcrübəsinin artmasına, həm də I Təhmasib tərəfindən Xorasana canişin təyin olunmasına zəmin yaratmışdır.

1727-ci ildən başlayaraq döyüş təcrübəsi, sərkərdəlik imkanları və dövlət quruculuğu işi artdıqca Nadir şah Təhmasiblə də əlaqələri tam qırmış və bütün Xorasanda özünün hökmranlığı uğrunda mübarizəyə başlamış, bir sıra qətiyyətli yürüşlər vasitəsilə bütün şimal-şərqi İranı birləşdirmişdi. Ard-arda qazandığı parlaq qələbələri ilə o, ölkənin yadellilərdən təmizlənməsi uğrunda mübarizəsinin başlanğıcını qoymuşdu. Elə bu tarixi təcrübə sayəsində Nadir əfqanlarla haqq-hesab çəkdikdən sonra Azərbaycan üzərinə yerimək fikrinə düşmüş, beləliklə, 1731-ci ildəki hərbi əməliyyatlar nəticəsində osmanlıları əzərək Azərbaycanı, Həmədanı və Kirmanşahı azad etmişdir.

Əminliklə demək olar ki, əsrlər əvvəl Azərbaycanın mövcudluğu, inkişafı və tərəqqisi bu dövlətin Nadir şah tərəfindən yaradılmış özülünün möhkəmliyi ilə əlaqədardır. Məhz yüz illər əvvəl onun yaratdığı fundamental baza üzərində qurulmuş Azərbaycan dövləti bütün sahələrdə böyük uğurlar qazanmışdır. Bu sistemin ictimai perspektivi dövlətçilik prioritetinin hansı səviyyədə olduğunu göstərir. Elə Nadir şahın dövlətçilik iradəsini də möhkəmləndirən məhz bu zəminlər olmuşdur.

Nadir şahın dövlətçilik amalında təcrübə ilə yanaşı kökündə məkr dayanmayan ağıllı hiylə də önəm kəsb edir. Onun Gəncə manevri zamanı işlətdiyi hiylə qələbə üçün əsas vermişdir. A.Bakıxanovun yazdığına görə də Nadirqulu xanın sərkərdəlik istedadı Gəncənin mühasirəsi zamanı özünü daha parlaq tərzdə göstərmişdir. Bilirik ki, o zaman Gəncədə osmanlıların qarnizonu otururdu. Mühasirə tamam daralsa da, qarnizon Abdulla paşadan kömək gələcəyi ümidi ilə təslim olmurdu. Abdulla paşa isə Qarsda idi və özünün vədləri ilə mühasirədəkilərə təsəlli verirdi. Nadir qoşunların bir hissəsini Gəncə qapısında qoyaraq, 15 minlik döyüşçü götürüb, Dağıstan yolunu bağlayır və Qars üzərinə hücuma keçir. Abdulla paşa öz sərkərdəlik məharəti ilə ad çıxarmış Nadirlə döyüşə girməkdən boyun qaçırır və qalaya girib, uzunmüddətli mühasirəyə hazırlaşır. Hadisələri sürətləndirmək məqsədi ilə Nadir belə bir fənd işlədir: gecənin birində mühasirəni götürüb tələsik geri çəkilir. Aldanmış Abdulla paşa 100 minlik qoşunu ilə qaladan çıxaraq, Nadiri İrəvana qədər təqib edir. Üçmüədzinin cənub-qərbində qəflətən qoşunu geriyə döndərən Nadir osmanlılarla ölüm-dirim savaşına girir. Qəfləti döyüş osmanlı qoşununda vahimə yaradır və Nadirqulu xan bu dəfə də tam qələbə qazanır. Bundan sonra İrəvan qalası və Tiflis qalasındakı osmanlı qarnizonları ona döyüşsüz təslim olurlar.

Bu ideal hiylə əslində, dövlət qurmaq əzmi olan bir sərkərdənin milli qürurunun bariz ifadəsidir.

Səmimi etiraf olunmalıdır ki, Azərbaycançılıq fəhminin daha da qüdrətlənməsi istiqamətində Nadir şahın ümdə vəzifə və xidmətləri olmuşdur. O, türk məişəti mühitində formalaşmış və Azərbaycan türkcəsi onun ana dili olmuşdur. Tarixdən bəllidir ki, o, bu dildə danışıb. Hətta sonralar hərbi yürüşləri zamanı sərkərdələri ilə də

Azərbaycan türkcəsində ünsiyyətdə qurub. Bu, Nadir şaha etimadı artırıb, haqqında mədhlər yazılıb. Bu barədə mənbələrdə çoxlu sayda faktlar var.

Necə ki, XV-XVI əsrlər Azərbaycan xalqının həyatında taleyüklü bir dövr olmuşdur, eləcə də, Nadir şahın vaxtında Azərbaycan öz intibahına daha yaxın idi və bunun üçün Nadir şah kimi qüdrətli bir sərkərdənin tarix səhnəsinə çıxması olduqca labüd idi. Nadir şah da şah Xətai kimi Azərbaycançılıq ideyalarının intibah xarakterli olması üçün əllərindən gələni etmiş, bir növ, Xətainin apardığı islahatları davam etdirmişdir.

Biz Xətainin tarixi xidmətlərini dəyərləndirərkən onun hakimiyyətə gəlişi zamanı mövcud dəyişiklikləri necə xarakterizə etmişdiksə, Nadir şahın da tarixi arenaya gəlişini, həmin vaxtda ətraf əhatələrdə inqilab dalğasının nə qədər güclü mənbələrdən yönəldildiyini, bu təsirlərin qarşısında Nadirin hansı ağıl və gücdən istifadə etdiyini də o tərzdə səciyyələndiririk. Həqiqi mənada, həm şah Xətai, həm də Nadir şah vahid dövlətin yaranmasında və inkişafında, milli birliyin və maraqların təmin edilməsində tarixi rol oynamışlar.

Xətaidən fərqli olaraq Nadir şahın siyasi fəaliyyətinin əsas predmeti mərkəzləşdirmə faktı olmuşdur. Bəllidir ki, onun apardığı mərkəzləşdirmə siyasəti feodal əyanlarının maraqlarına toxunurdu və bunun üçün də 1741-ci ildə Mazandaran meşələrindən keçərkən ona qarşı sui-qəsd törədilib. Bundan sonra Dağıstandakı uğursuzluqlar və 1743-1747-ci illərin üsyanlar dalğası başlayıb. Bütün bunlar Nadir şahı qəzəbləndirib və o, kütləvi cəza tədbirlərinə başlayıb. Onun qəzəbini bu kimi hallarla xarakterizə etmək mümkündür. Əlbəttə, hakimiyyətin və çəkilmiş əziyyətin hədər getməsi onun üçün son dərəcə ağır ola bilərdi və bu üzdən o, işğal etdiyi ərazilərdə bir sıra amansızlıqlara da yol verib.

Nadir Şahin şəxsiyyəti barədə tarixi mənbələrdə tutarlı dəlillər var. Mənbələr və tarixi ədəbiyyat sübut edir ki, Nadir şah orta əsrlər hərb tarixinin ən parlaq simalarından biri olmuş, bəşər tarixinin Makedoniyalı İsgəndər, Əmir Teymur kimi sərkərdələrinin Asiyadakı uğurlarını təkrar edərək özünə Asiyanın sonuncu böyük fatehi kimi bir ad qazanmışdır.

Üstəlik, Nadir şah fatehlik və sərkərdəlik əzəməti ilə hərbə yeni məzmun gətirmiş, məğlubedilməzlik simvoluna çevrilməklə hərbi peşəkarlığı ən yüksək zirvəyə çatdırmışdır. Hətta, deyilənlərə görə, insan zəkasının təsəvvür edə bilməyəcəyi qərarları qəbul edərək onların icrasında çox böyük məharət, ustalıq və əzmkarlıq nümayiş etdirən Nadir şah müasirləri üçün əlçatmaz olan məqsədlərə çox asanlıqla çatmışdır. Məhz bunun nəticəsidir ki, Nadir şah Səfəvi dövlətinin az qala yarıya qədər əldən getmiş ərazilərini geri qaytarmış, Yaxın Şərqi öz imperiyasına qatmış, Osmanlı dövlətinin hərb maşınının qarşısını saxlamış, sürətlə güclənməkdə olan Rusiya dövlətini onunla hesablaşmağa məcbur etmiş, Hindistanı, Əfqanıstanı və Türküstanı fəth etmiş və özünün yeni imperiyasını yaratmışdır.

Tarixdə Nadir şahın həyat yolundan, siyasi fəaliyyətindən, apardığı müharibələrdən bəhs edən bir sıra ilkin qaynaq və onlarla tədqiqat işləri mövcuddur və bu mənbələr ümumilikdə Nadir şah irsini və şəxsiyyətini, onun tarixi təcrübəsini, sərkərdəlik bacarığını öyrənmək baxımından çox əhəmiyyətlidir.

Nadir şahın həyatı və fəthləri barədə Mirzə Mehdi xan Astrabadinin "Tarix-e Cahanqoşa-ye Naderi", həmçinin Məhəmməd Kazım Mərvinin "Tarix-e Aləm Ara-ye Naderi" salnamələri, digər çoxsaylı tədqiqat işləri tutarlı mənbələrdir və burada Nadir şahın dövlətçilik irsi, tarixi nailiyyətləri, hətta qətli barədə sübutlar var.

L.Lokkart, M.Aksvörti, bir sıra başqa tanınmış şərqşünas və tarixçilərin də əsərlərində Nadir şahın həyatı geniş araşdırılıb, maraqlı məqamlar tam çılpaqlığı ilə verilib.

İngilis şərqşünası və tarixçisi Maykl Aksvörtinin 2006-cı ildə Londonda nəşr olunmuş kitabı da bu baxımdan xüsusi maraq doğurur.

Akademik Ramiz Mehdiyev də "Nadir şah" kitabına yazdığı ön sözdə, Moskvada rus dilində çap olunmuş "Milli ideyanın formalaşmasında tarixin idrakının faydası haqqında" adlı monoqrafiyasında Nadir şahın şəxsiyyəti, dövlətçilik irsi və sərkərdə bacarığı barədə maraqlı məqamlara toxunub, onun Azərbaycan dövlətçilik tarixinin təşəkkül tapmasındakı rolu barədə önəmli fikirlər səsləndirib.

Dövlətlərin yaranması və inkişaf tarixi çox çətinliklərdən keçir; bu mənada Azərbaycan da Səfəvilər və Nadir şah dövründə özünün çiçəklənmə və tənəzzül dövrünü yaşayıb, güclü iradə nümayiş etdirib. Xüsusilə də Nadir şahın dövlətçilik salnaməsinin şanlı səhifələri Azərbaycanın siyasi xətti üçün əsaslı mənbələrdir və dünya siyasətində böyük tarixi mütəfəkkir və bacarıqlı sərkərdə kimi etiraf edilən fenomen şəxsiyyət Nadir şahın yaratdığı milli dövlətçilik tarixin xalqımıza bəxş etdiyi milli sərvətdir.

Hələ əsrlər əvvəl Aristotel yazırdı ki, "siyasi liderliyin ilkin şərti dövlətin gələcəyini öncədən görmək və gördüyünü həyata keçirə bilməkdir". Bu mənada, istər Azərbaycan tarixində, istərsə də xalqımızın yaddaşında Nadir şah müstəqil və suveren dövlətin simvolu, xarizmatik siyasət dahisi, cəsur insan və böyük vətəndaş kimi qalmışdır və qalacaq. Çünki o, Azərbaycan tarixində bütöv bir epoxanı özündə təcəssüm etdirən, müstəqil dövlətin siyasi, iqtisadi, hüquqi, sosial-mədəni, elmi əsaslarını yaradan, onların ardıcıl inkişafını təmin edən siyasi kursun və milli inkişaf strategiyasının müəllifi kimi status qazanıb.

Etiraf olunası haldır ki, Nadir şah dövlətin varlığının əsasını təşkil edən iqtisadi inkişafı dövlət həyatının ən vacib vəzifəsi hesab etmiş və bildirmişdir ki, dövlət qurarkən cəmiyyətin yaşam tərzini, ictimai həyat normalarını, idarəçiliyi, qanunçuluğu, sabitliyi, vətəndaş birliyini, milli həmrəyliyi və s. vəzifələri dolğun və davamlı təmin etmək ən doğru şərtlərdir. Onun xalqımızı milli əxlaqa və güclü iradəyə malik, qlobal və azad düşüncəli, təşəbbüskar, fəal, ölkədaxili və beynəlxalq proseslərdən baş çıxara bilən, təhsilli, ədalətli, vətəni üçün gərəkli xalq kimi görmək istəyi bu gün də alqışlanır.

Azərbaycanın dövlətçilik əsasları zaman-zaman sivil inkişafa söykənib. Nadir şahın da dövlətçilik işində ölkəmizin milli inkişafı, bitkin nəzəri konsepsiyası, mütərəqqi Azərbaycan modeli var.

Bütün dövrlərdə, o cümlədən Nadir şahın zamanında Azərbaycan siyasi qloballaşmada milli özünüdərkə, adət-ənənə prinsiplərinə, ləyaqət, qürur hisslərinə daha ətraflı və əhatəli yanaşmışdır. Elə Nadir şahın tezislərindən də bəlli olur ki, qloballaşma, qlobal prinsiplər heç də ölkələrin dəyər sistemlərini zəiflətməyə xidmət etmir, əksinə, ölkələrarası sivill parlaqlığı təmin edir.

Məhz özünün Azərbaycançılıq hislərini həyata keçirəndə də o, əmin olmuşdur ki, bütün prioritetlərin əsasında qüdrətli bəşəri inkişaf perspektivləri, düşünülmüş, balanslaşdırılmış siyasət, ölkə daxilində sabitliyin təminatı, dövlətçiliyin möhkəmlənməsi durur. Təbii ki, bu etibarlı bazanın üzərində əsrlər əvvəlin dövlətçilik iradəsi mühüm göstərici kimi çıxış edir. Bunu dərk etmək qürur hissi yaradır.

Nadir şah Rusiya ilə müharibə barədə düşünəndə rus çarının ona məktub göndərməsi, sanki böyük israrla öz acizliyini ifadə etməsi də maraq doğurur. Məktubda yazılırdı: *“Gəl birləşək, bir yerdə Osmanlı imperiyasını məhv edək”. Nadir şah isə rus çarına yazır: “Mən təkbaşına bir addım atdım, Hindistanı tutdum, bir addım da atsam, dünyanı tutaram”.*

Bu, Nadir şahın sərkərdə qüdrətindən, şəxsiyyət amalından xəbər verir.

Ümumiyyətlə, Türk-Azərbaycan hərb tarixi üçün Nadir şah Əfşarın xidmətləri çox böyük və əhəmiyyətlidir. Hərbi məktəblərin açılması, ilk dəfə hərbi gəmiqayırma zavodlarının tikilməsi, müharibə üçün top istehsalı, poladəritmə zavodu və s. Nadir dəvələr üstünə qoyulduqdan sonra 360 dərəcə fırlanan şah balaca toplar icad etmişdir.

Nadir şah Napoleon kimi nadir sərkərdələrdən olub ki, bütün döyüşçülərini üzdən və adı ilə tanıyıb. O, keçmiş inzibati ərazi bölgülər olan Şirvan, Qarabağ, Çuxursəd və Təbriz bəylərbəyiklərini ləğv edərək ilk dəfə olaraq Azərbaycan adı altında vahid inzibati bölgə yaratmışdır. O, həmçinin, Yeni Şamaxı (Ağsu), Nadirabad, Xivaqabad şəhərlərini salmış, Dəstgirdə mövludxana, Kelatda xəzinə, Qəzvin və Mazandaranda (Əşrəfdə) saraylar tikdirmiş, Məşhəddə İmam Rza məqbərəsini genişləndirmiş, məscidin Şah kitabxanasına ianə vermiş və bura 400 əlyazma bağışlamış, ölkənin xristian təbəələrinə çox dözümlə yanaşmış, onların azad etiqad hüququna hörmət qoymuş, «İncil», «Tövrat» və Quranın müəyyən qisimlərini türk dilinə təcrümə etdirmişdir.

Nadir şahın türk dünyası qarşısında mühüm xidmətlərindən biri də bu olmuşdur ki, o, iki türk xalqı-Osmanlı və Səfəvilər arasında məzhəb ayrılığna son qoymaq və düşmənçiliyi aradan qaldırmaq üçün hər iki məzhəbin qəbul etdiyi ortaq (Cəfəri Sadiq) məzhəb təklif etmişdir. Bu barədə sonralar 19-cu əsr Azərbaycan tarixçisi və yazıçısı Abbasqulu ağa Bakıxanov təəssüflə yazırdı: “Bu məsələ dəfələrlə Osmanlı dərbarına təqdim edilsə də, qəbul olunmadı”.

Belə etiraf olunur ki, bu gün Azərbaycanda İslam dini sahəsindəki bir çox islahat məhz Nadir şahın adı ilə bağlıdır.

Beləliklə, Nadir şah Əfşarın yaratdığı Əfşarlar dövləti əsasən Azərbaycan və İran ərazisində hökm etmiş, bütövlükdə Şərq, ümumtürk və Azərbaycan tarixində silinməz izlər buraxmışdır.

Bəli, bugünkü Azərbaycan vətəndaşlarının milli iftixar mənbəyini təşkil edən çoxəsaslı, fundamental amillərin içərisində Azərbaycanın Nadir şah dövründəki uğuru da vacib tarixi prioritet hesab olunur.

## Ədəbiyyat

1. A. Bakikhanov. "Gulustani-Iram" (Translated by M. Askerli). Baku: Minaret, 2000, p. 58
2. Sahin Farzaliyev - Doctor of Historical Sciences, Professor. (2012). Guba khanate: population history and freedom struggle. Elm. p. 336.
3. "Bridge" program (2nd), topic: Who is Nadir Shah Afshar? Publication date: 16.01.2016.

**Rəyçi: dos.D.Hümbətova**

Göndərilib: 02.04.2021 Qəbul edilib: 08.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/120-122

**Sevinc Tofiq qızı Kərimova**
Bakı Slavyan Universiteti
baş müəllim
sevinc.karimova.1985@mail.ru

# SİNTAKTİK FRAZEOLOJİ KONSTRUKSIYALARIN BƏDİİ ƏDƏBİYYATDA ROLU

**The role of syntactic phraseological constructions in fiction**
**Summary**

Speaking about stlyistic opportynities of syntactic phrasaelogical constructions, it is important to learn them with other units identically.

If the speakers speaking in common style apply to the ready language unites without any doubts, in artistic style the syntactic phraseological constructions are exposure to the writer processing. One of the opportunities of syntactical phraseological in artistic style is their performing in the text as artistic tools.

***Key words:*** *syntactic phraseological constructions, common style, writer processing, artistic tools*

Bədii dili zənginləşdirən vasitələr öz rangarəngliyi ilə seçilir. Belə vasitələr sırasında sintaktik vahidlərin də özünəməxsus payı vardır. Hər bir sintaktik vahidin üslubi imkanları onun strukturu, qrammatik xüsusiyyətləri ilə birbaşa bağlıdır. Sintaktik frazeoloji konstruksiyalar da bu baxımdan maraqlı dil elementləri olmaqla yanaşı, həmçinin geniş bədii-üslubi imkanlara malikdir. Bu bədii-üslubi imkanlar istər leksik, istərsə də sintaktik səviyyədə özünü göstərir.

Nəzərə alsaq ki, sintaktik frazeoloji konstruksiyalar məzmunca yüksək emosionallığı, modallığa, fikrin ifadəsində ən kiçik və incə məqamları, məna çalarlarını ifadə etməkdə uyğun və müvafiq dil vahidləridir. O zaman onların bədii üslubda bədii üslubda tez-tez rast gəlinən elementləridir.

Ümumiyyətlə, hər bir frazeologizm bədii dilin ülsubi imkanıdır. Bu üslubi imkanı müəllif tərəfindən məqsədyönlü şəkildə istifadə edilir. Əgər frazeoloji birləşmələr bir leksik vahidin qarşılığı olaraq işlədilirsə və cümlədə bir sözə yeni poetik məna yükü gətirirsə, sintaktik frazeoloji konstruksiyaların cümləyə ekvavalent olması məna və strukturca daha böyük sintaktik vahidlərə qarşılıq ifadə etməsi bədii mətni daha da zəginləşdirmək deməkdir. Hər sintaktik frazeoloji konstruksiyada xalqın milli-mənəvi dəyərləri, düşüncə tərzi, məsələlərə emosional reaksiyası əks olunur ki, bununla da bədii əsərə canlılıq, təbiilik, xəlqilik gətirmiş olur.

Sintaktik frazeoloji konstruksiyanın bədii üslubdakı imkanlarından biri də onların mətn daxilində bədii təsvir vasitələri kimi çıxış etmələridir. Sintaktik frazeoloji konstruksiyalarda məcazın növlərindən bir qismini izləmək mümkündür. Poetik müqayisə məişət və publisistik üslubla müqayisədə bədii üslub üçün daha səciyyəvidir. Çünki "Frazeoloji vahidlərdə poetik müqayisə daha çox iştirak edir. Komponentlərin təmsil etdiyi fikir, obyekt bir-birilə qarşılaşdırılır, adi şəraitdə nəzərə çarpmayan cəhətlər qabarıq şəkildə meydana çıxır, təsvir obyektinin səciyyəvi cəhətləri açılır, əyaniləşir, oxucunun gözləri qarşısında canlanır" (2, 78). Müəllif-yazıçı müqayisə olunan iki obyekti (çox zaman aralarında müqayisə aparılan obyektlərin sayı ikidən artıq olmur) onlara xas olan xüsusiyyətləri sadalamaqla və ya qarşılaşdırmaqla da təhlil edə bilərdi. Lakin sintaktik frazeoloji konstruksiyaların poetik xüsusiyyətləri qısa və lakonik, eyni zamanda kəsərli müqayisə imkanı yaradır. Eyni fikir sintaktik frazeoloji konstruksiyalar vasitəsilə ifadə olunduqda oxucuda maraq doğurur və oxucunun iradəsindən kənar şüuraltı qatda müqayisəyə cəlb olunan obyektlərin əlamət və xüsusiyyəti xatırlanaraq qarşılaşdırılır.

Sintaktik frazeoloji konstruksiyalarda adətən müqayisə olunan obyektlər konstruksiyanın dəyişən komponentləri, müqayisə, əkslik, təzad yaradanlar isə daimi komponentlər olur (3, 67). Bu daimi komponentlər bir-biri ilə antonimlik, çox hallarda isə üslubi antonimlik təşkil edir. Məsələn:

*Deyirdilər, Kolanı hara, belə-belə işlər hara (B.B.)*

*Gəl açıq danışaq, bəyim, könlümü heç özüm də bilmirəm... Bir də ki sən handa, mən handa (Ə.C.)*

Birinci cümlədə obyekt və onun hərəkəti, ikinci də isə iki obyekt qarşılaşdırılır. Hər iki cümlədə birinci qütbdəki "hara?" sual əvəzliyi ilə ikinci qütbdəki "hara?" sual əvəzliyi öz aralarında antonimdir. Omonimlik xüsusiyyətinə malik olmadan bir leksik mənalı sözün öz-özünün antonimi kimi çıxış etməsi əksər hallarda konstruksiya daxilində mümkün olur. Təbii ki, bu hal intonasiyanın köməyi ilə baş verir. İkinci dəfə təkrarlanan "hara?" sual əvəzliyi və ya sintaktik frazeoloji konstruksiyanın daimi komponenti birinci ilə müqayisədə daha qüvvətli deyilir və məntiqi vurğu qəbul etmiş olur.

Bəzən isə müqayisə obyektlər arasında deyil, obyekt ilə onun hərəkətləri, davranışı arasında aparılır və hərəkətin insana uyuşmazlığı, münasib olmaması, uyğunsuzluğu ifadə olunur. Məsələn:

*Muxtarov ola, belə şərtlərə qol çəkə* (M.H.)
*Zübeydə nə idi, camaatın işinə qarışdı nə idi* (Elçin)
*Övrət nə idi, küçəyə çıxıb su gətirdi nə idi* (C.M.)
*Ananın nə borcdur ataynan övladın işinə qarışsın* (C.M.)

Göründüyü kimi, oxşar mənaların yaranmasında müxtəlif konstruksiyalardan istifadə edilmişdir. Birinci nümunə ilə, ikinci və üçüncü nümunələrin yaranma konstruksiyaları müxtəlifdir. Lakin hər iki konstruksiya incə məna çalarları duyulmaqla, oxşar mənaları ifadə edir. Birinci nümunədə şəxs ilə ona xas olmayan hərəkət qarşılaşdırılır, ikinci nümunədə də eyni halı müşahidə edirik. Hərçənd ki, birinci nümunə mənfi, ikinci isə müsbət münasibət ifadə edir. Üçüncü nümunədə isə şəxs ilə onun həyat tərzi – hərəkəti arasında qarşılaşdırma olsa da, bu hal haqqında danışılan şəxsin öz istəyinə bağlı olmayaraq daxili keyfiyyətlərdən qaynaqlanmayaraq baş verir.

"Fikrin bu üslubda ifadə formasından, əsasən, publisistik, bədii və məişət üslublarında təsviri daha canlı və cəlbedici təqdim etmək üçün istifadə edilir". Nəzərə alsaq ki, sintaktik frazeoloji konstruksiyalar xüsusi ekspressivliyə malikdir və bəzən danışanın subyektiv baxışını, ümumilikdə emosiya, hiss və həyəcanı ifadə edir. Bu hallar adətən bədii üslub üçün xarakterikdir, o zaman ki, müəllif oxucunun diqqətini daha çox cəlb etmək istəyir, bu təsvir vasitəsinə müraciət edir və bədii üslubda bu üsuldan istifadə olunur. Məsələn:

1) *Qız deyil, dağ başında kəklikdir* (C.C.).
2) *Arvad deyil, paraxoddur* (C.C.).

Göstərilən hər iki nümunədə təşbehdən istifadə edilmişdir. Bildiyimiz kimi, təşbeh iki obyekti bir-biri ilə müqayisə edir, bənzədir. Bu zaman oxşar əlamət vurğulanır. Bənzəyən, bənzədilən tərəf və əlamət qeyd olunur. Bu bənzətmənin özsü də mənfi və müsbət münasibət bildirə bilər. Birinci nümunədə müsbət keyfiyyəti önə çıxarmaq üçün, danışanın müsbət münasibətini bildirmək üçün təşbehdən istifadə edilib. İkinci nümunədə isə şişirtmə, mübaliğə istehza, kinayə xarakterlidir. Sintaktik frazeoloji konstruksiyalarda məcazın hər hansı bir növünün qeyd olunması, subyektiv səciyyə daşıya bilər. Təbii ki, bu subyektivliyin özündə də xalqın dünyagörüşü, məsələyə yanaşma tərzi, müqayisə apardığıanlayış və məfhumun xalq təfəkküründə yaratdığı assosasiya, münasibətin ifadəsi var. Birinci nümunədə qızın "kəkliklə" müqayisəsi xalqın mental keyfiyyətləri ilə bağlıdır. Kəklik ən uca dağlarda, qayalarda, əlçatmayan, ayaqdəyməyən yerlərdə yaşadığından, çətin ovlandığından, əlkeçməz olduğundan qızın gözəlliyi, toxunulmazlığı, dağ başındakı kəkliyə bənzər olacaq dərəcədə şişirdilir. Bu da xalqımızın qıza, qız övladına, ümumiyyətlə qadına məsum, pak, müəyyən qədər də mühafizəkar yanaşmasından irəli gəlir.

3) *Zübeydə bilməyən şeyə qurd düşər* (Elçin).
*4) Dəryada batan söz deyil* (K.A.)
5) *Axı sizin xozeyinlər milyona pul demirlər.*

"....bilməyən şeyə qurd düşər" ifadəsinin ilk komponenti dəyişəndir və əsasən xüsusi isimlərlə - insan adları ilə, yaxud şəxs əvəzlikləri ilə əvəz olunur. Bu sintaktik frazeoloji konstruksiyaların əvəzlənən komponenti həmin şəxsin yersiz və lazımından artıq marağını, hamıya və hər şeyə müdaxilə etdiyini, məlumat topladığını bildirir. "Hər şeyi bilmək" sintaktik frazeoloji konstruksiyalarda müsbət deyil,mənfi keyfiyyət kimi qiymətləndirir. Sonuncu nümunəyə gəldikdə isə, müəllif tərəfindən yaradılan bu sintaktik frazeoloji konstruksiyalar son dövrün məhsuludur. O səbəbdən də, bədii, nə də xalq danışıq dilində bu ifadənin variantları ilə qarşılaşmadıq. Digər nümunələr dildə əvvəlcədən mövcud olmuş, yazıçı tərəfindən məzmuna uyğun olaraq emal olunmuş, konstruksiyalardır. "Dəryada batan söz deyil" sintaktik frazeoloji konstruksiyası isə müəllif tərəfindən ilk dəfə olaraq işlədilir. Sözə, onun dəyərinə yüksək qiymət verilir. Fikrimizcə, dərya dedikdə, su hövzəsinin dərinliyi ön plana keçir. Ona görə də sözün məna dərinliyi dəryanın dərinliyində batmayacaq qədər də mübaliğə edilir. Gələcəkə haqqında bəhs etdiyimiz konstruksiyanın "söz" komponentinin digərləri ilə əvəzlənməsi halı da mümkündür. Yaxud dilimizdə mövcud olan onlarla sintaktik frazeoloji konstruksiyalar kimi bu konstruksiya da həm dəyişən, həm də sabit tərkibdə paralel olaraq, işlənə bilər. Azərbaycan dilində bu ifadəni xatırladan "Odda yanmaz, suda batmaz" nəzmşəkilli tapmacası vardır. Tapmacanın açmasının "buz" olmasına baxmayaraq, xalq arasında bu deyim tapmaca məqsədilə deyil, qoçaq, diribaş bir insanı xarakterizə edərkən səciyyəvi keyfiyyət kimi işlədilir. "Filankəs elə oğlandır ki, odda yanmaz suda batmaz". İstənilən sintaktik frazeoloji konstruksiyaların etimoloji şərhi təbii ki, subyektiv səciyyə daşıyır, dəqiq bir fikir söyləmək çətin olur və fərziyyələrə əsaslanır. İstənilən halda sintaktik frazeoloji konstruksiyalar da digər frazeoloji vahidlər kimi üslubi baxımdan bədii ədəbiyyata gətirilsə, deməli müəllifin yaradıcı təsirinə məruz qalır. Lakin, sintaktik frazeoloji konstruksiyalar bədii üslubda daha çox transformasiya olunmuş vəziyyətdə işlədilir.

5-ci nümunədə "pula pul demir" ifadəsinin invariantı ilə görürük. Sintaktik frazeoloji konstruksiya "milyona pul demir" şəklində qurulmuşdur. Adətən haqqında danışılan şəxsin olduqca dövlətli olmasını göstərmək üçün, pulun çoxluğundan, pula laqeyd və saymazyana münasibətini ifadə etmək üçün işlədilir.

Məcazın ən geniş yayılmış təzahür formalarından biri də metonimiyadır. Bədii üslubda metonimiyalar ən mühüm və faydalı nitq vahidi, dilin ifadəlilik imkanlarını artıran bədii dil və obrazlılıq axarına salan bədii təsvir vasitələridir. Bu baxımdan sintaktik frazeoloji konstruksiyalar bir çox hallarda obrazlılıq yaradan vasitə kimi xüsusi əhəmiyyət daşıyır və bədii üslubda ona tez-tez müraciət olunur [3, 48]. Məsələn:

*Dəli şeytan deyir...* (C.C.)

*Qəzetlər yazdı, sən də inandın* (M.İ.).

*Bir qulağı orda, o biri qulağı burda (Elçin).*

Birinci cümlədə mücərrəd əşya ilə mücərrəd varlıq – mifik obraz arasında ad dəyişməsi baş vermişdir. Danışan "dəli şeytan" ifadəsini işlətməklə əslində ürəyindən, fikrindən keçənləri nəzərdə tutur. Lakin bu fikri öz dilindən deyil, mücərrəd varlığın dilindən səsləndirir. Təbii ki, bütün bunlar hər bir xalqın mifik dünyagörüşü, dini inancları ilə birbaşa bağlıdır. "Şeytan" anlayışı da islam dinində insanı düzgün yoldan çıxaran, şərə, günaha sövq edən gözəgörünməz qüvvə kimi izah edilir. Bu ona görədir ki, insanlar çox vaxt istənilən səhv addım atdıqca onu şeytanla bağlayır, şeytana lənət deyirlər. "Dəli şeytan" ifadəsində sözün təsir gücü ikiqat artır. Şeytan insan ağlının yol vermədiklərinə sövq edən, normal-sağlam düşüncəyə malik olmayan mənalarının birləşməsindən maraqlı kombinasiya yaranır, üstəlik sintaktik frazeoloji konstruksiyaların komponenti kimi çıxış etdikcə zəngin ekspressiv çalarlığa malik olur. İnsan ağlından keçən, lakin deməyə cəsarət etmədiyi halda bu kimi ifadələrdən istifadə edir və ad dəyişməsi – metanimiya hadisəsi baş verir. Qeyd edək ki, bu kimi hallara folklor nümunələrində, xalq mahnılarında tez-etz rast gəlinir.

*Başında var şal bunun,*
*Yanağında xal bunun,*
*Bir dəli şeytan deyir,*
*Dur qadasın al bunun.*

İkinci nümunədə isə ad dəyişməsi insanla – cansız əşya arasında aparılmışdır. Qəzetlərdə çap olunan məlumatı qəzet deyil, konkret insanlar (jurnalist, müxbir və s.) yazır. Üçüncü nümunədə isə eşitmə orqanı olan qulaq asmaq, dinləmək feili qulaqla əvəzlənmişdir.

İfadəyə kinayə çaları verən intonasiyadır. Lakin kinayə çaları ilə birlikdə sabitləşən. Məzmununda kinayə çaları üstünlük təşkil edən sintaktik frazeoloji konstruksiyalar da vardır. Bunlar müstəqil mənada işlənmir. Lakin bu tipli sintaktik frazeoloji konstruksiyaların ümumi məzmununda haqqında danışılan obyektə müsbət və ya mənfi münasibət öz əksini tapa bilir. Həmin mənaların müəyyənləşdirilməsi isə bilavasitə mətnin ümumi məzmunu ilə mümkün olur. Məsələn:

*Nə qızdır... Vallahi Sərvinaz bunun qabağında aşpazlığa da yaramaz (M.İ.)(müsbət mənada)*

*Nə qızdır heç əlinə su tökməyə yaramaz. (mənfi mənada).*

Gördüyümüz kimi, eyni sintaktik frazeoloji konstruksiya mətnin ümumi məzmunundan və situasiyadan asılı olaraq kinayə çaları da ifadə edə bilir. Eyni sintaktik frazeoloji konstruksiyalar müxtəlif mətnlər daxilində fərqli münasibət bildirir. Məqsəddən asılı olaraq, intonasiyalar əslində bu cümlələrdə müxtəlif cümlə növü kimi formalaşır. "Nə qızdır" ifadəsi enantosemiya hadisəsi kimi də dəyərləndirilə bilər. Aşağıda verilən nümunələrdə isə kinayə intonasiya ilə yanaşı, məzmunun daxilində də ifadə olunmuşdur. Cümlə daxilində bu tip konstruksiyalar öz quruluşunu dəyişə bilir, bəzən onun tərkib hissələri arasına məqsəddən asılı olaraq müəyyən sözlər əlavə olunur. Məsələn:

*Kül o pyesin başına ki, o gicbəsər yazacaqdır*(C.C.)

*A kişi, sən bir səsini kəs, qoy görək, kişinin qızı nə deyir də* (C.C.)

*Kəndxudalıq elə o yırtıq çul-çuxana yaraşır*(C.C.)

## Ədəbiyyat

1. Baylarova A.M. Stylistic figures in Bidii language. Baku, "Nurlan", 2008, 212 pages.
2. Demirchizade A. Stylistics of the Azerbaijani language. Baku, 1962, 270 p.
3. Huseynov M.A. Poetic phraseology. Almaty, Ulagat Publishing House, 2013, 271 pages.
4. Velichko A.V. Syntactic phraseology for Russians and foreigners. Moscow. 1996, 124 p.

**Rəyçi: prof. İ.Qasımov**

Göndərilib: 07.04.2021 Qəbul edilib: 14.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/123-125

**Leyla Eldar qızı Seyidzadə**
Azərbaycan Dillər Universiteti
Azərbaycan, Bakı
leyla.suleymanova.78@bk.ru

# İNGİLİS DİLİNDƏ CAVANLARIN NİTQİNDƏ İSTIFADƏ OLUNAN SLENQLƏRİN XÜSUSİYYƏTLƏRİ

**Açar sözlər:** *cavanlar, slenq, metafor, kontekst, motivləşmə*

**Peculiarities of English slang in youth's speech**
**Summary**
The article deals with youth's slang in English. The author gives information about slang generally. At first the article is considered some peculiarities of slang. Then with the help of context the author explains the slang, studies cognitive features of slang and their metaphoric usage. The author was able to drawn her own conclusions about slang based on the views of researchers like Arnold and Veliyeva. The slang used in the speech of young people is constantly changing because generations and lifestyles change. The author bases the article on dictionaries, textbooks of modern native and foreign authors' novels.
***Key words:*** *youth, slanq, metaphor, context, motivation*

## Giriş

Hər bir dildə mövcud olan bir qrup sözlər vardır ki, bunları slenq adlandırırlar. Bu qrup sözlər adətən bizim dövrümüzdə, xüsusilə gənclər arasında çox istifadə olunur. Uzun müddət ictimai həyatda və şəxsi həyatda müəyyən məhdudiyyətlər olmuşdur. Məhz buna görə də cəmiyyətdə birmənalı şəkildə fikir formalaşmışdı ki, slenqlərdən istifadə etmək savadsızlığın nəticəsidir və digər tərəfdən bu qəbildən olan sözlər – slenqlər ümumi qəbul olunmuş ədəbi danışıq normalarına uyğun gəlmirlər. Söhbət gənclərdən getdikdə isə əksinə həmişə onlar ilk olaraq sosial həyatda baş verən dəyişikliyə daha tez reaksiya verirlər və buna görə də slenqlər gənclər arasında çox məşhurdur.

## Əsas hissə

Slenqlərdən bəhs edərkən İ.V.Arnold yazır ki, slenq sözlər standart ədəbi lüğətlərlə qarşılaşdırılıb, aydınlaşdırılıb müəyyənləşdirilən sözlərdir. Həmin qəbildən olan sözlər bir çox hallarda ironik sözlərdir və yeni sözlər yaratmağa xidmət edir, yeni kreativ adlandırma yaradır və gənclərin diskurslarında tez-tez rast gəlinir. Müəllif slenqlər haqqında dediklərini davam etdirərək qeyd edir ki, bu qrup sözləri məsələn, *money - pul* əvəzinə *beans, brass, dibs, dough, chink, of wads* slenqlərə misal gətirmək olar (I.Arnold/1986:249).

Təbii olaraq müəllifin nümunə kimi gətirdiyi həmin sözlər ayrılıqda paxla, lobya, maş mənasını versə də gənclər həmin *bean* sözünü *sleng* kimi *money* sözünün sinonimi kimi işlədir. Hətta başqa halda müraciətdə *bean* sözü *old* sözü ilə birləşərək *old bean - köhnə dost* kimi işlədilir. Həmin qrupa daxil olan *brass* sözünün leksik mənası latun, bürünc, mis olduğu halda vurğulamaq lazımdır ki, izahlı lüğətdə onun mənalarından biri *money-pul* mənasındadır. *Brass Am.E noun Br.E old fashioned informal money* (Oxford Advanced Learner's Dictionary/2005:140).

Eləcə də *dough* sözünün də ingilis dilinin izahlı lüğətində *fashioned* - amer. variantında pul-para mənasında göstərilmişdir (Oxford Advanced Learner's Dictionary/2005:377).

*Chink* - slanq sözünün izahlı lüğətdə qarşılığı (slenq) *a very offensive word for a chinese person* (Oxford Advanced Learner's Dictionary/2005:204) verildiyi halda başqa bir tərcümə lüğətində mənalarından biri məhz sikkə, pul, metal pul, nağd pul, *chink - dövlətli/varlı/zəngin adam* (Veliyeva, 2017:251).

Həmçinin slenq kimi qeyd olunmuş *wards* sözü də həm izahlı lüğətdə, həm də tərcümə lüğətində *pul - money* kimi göstərilmişdir. İzahlı lüğətdə həmin söz aşağıdakı kimi izah olunub.

*Was – a thick pile of pieces of paper, paper money etc. folded or rolled together.*
*He pulled a thick wad of $10 notes out of his pockets.*
*They had a wad/wads of money (= a large amount).* (Dreizer, 1968:145)
*O cibindən bir paçka 10 dollarlıq pul çıxartdı.*
*Onların çoxlu pulu var idi (= kalan pulu)*
Tərcümə lüğətində də eyni mənada birləşmə şəklində işlədilməsinin şahidi oluruq.
*A ward of money - bir paçka pul*

Biz təhlil etdiyimiz bir slenq-sözün sinonimlərinin hər birinin ayrı-ayrılıqda mənalarından birinin slenq kimi işlədildiyi mənaya malik olması və insanların, gənclərin onları işlətməsi ona dəlalət edir ki, həmin məfhumun (pulun) elə adlandırılması fikrimizcə, birbaşa koqnisiya ilə əlaqədardır, çünki ola bilməz ki, müxtəlif səviyyəli insanların nitqində belə sözlərin işlədilməsi təsadüf olsun.

Bizim vurğuladığımız bu məsələni İ.V.Arnold da xüsusi olaraq qeyd etmiş və gəldiyi qənaəti belə ifadə etmişdir. Bir çox müəlliflər tərəfindən qəbul olunmuşdur ki, slenqlər müəyyən müddət ərzində nitqdə istifadə edilir və onlardan bəziləri ədəbi dilə daxil olur, onlardan *bet, bore, chap, donkey, fun, humbug, mob, odd, pinch, shabby sham, sham, snob, trip* və bəzi Amerikan slenqləri *grafts, hitch-hiker, sawbones* (I.Arnold, 1986:249).

Müxtəlif situasiyalarda insanın fəaliyyəti dairəsində gənclər arasında işlədilən slenqlər vardır, onlardan bəzilərinə diqqət yetirək. İlk növbədə insanın sifəti ilə bağlı gənclər arasında bir neçə sinonim slenqlər mövcuddur. Onu qeyd etmək lazımdır ki, *face-sifət* sözünün aşağıdakı sinonimləri vardır: *smiler, snoot, kisser, dish, mask*. Bu slenq sözləri nəzərdən keçirdikdə bir qədər əvvəl vurğuladığımız kimi həmin sözlərin əsasında əslində tam mənalı sözlərin olduğunu görürük yəni, *smiler - təbəssümlü; snoot - təkəbbürlü, lovğa; kisser - öpən; dish - yemək qabı; mask - maska, örtük* və burda müəyyən dərəcədə metaforlaşma vardır və yumor hissi ilə öz taytuşlarına müraciət edirlər, bir növ zarafatla deyilir və onlar heç zaman bu slenqlərdən incimirlər, bu slenqlər ziyafətdə və kompaniyalarda istifadə edilən slenqlərdir.

Təbii olaraq gənclər arasında həmişə lider olmaq istəyənlər vardır ki, bu zaman *ahead of the game - ən yaxşı olmaq,* birinci olmaq kimi slenqi işlədilir. Əslində bu birləşmənin komponentlərinin mənaları müəyyən mənada qorunub və kalka etsək oyunun başında olmaq, oyunu idarə etmək mənasındadır və bir qədər metaforlaşma olmuşdur və gənclərin nitqində slenq kimi işlədilmişdir.

Əslində cavanların işlətdiyi slenqləri öyrənmək o qədər çətin deyil. Bunun üçün onların arasında daima olmaq və onlarla ünsiyyət qurmaq, lazım olan slenqləri eşitmək və mənalarını asanlıqla anlamaq mümkündür. Bütün hallarda hər bir şəxs üçün qrammatikanı yaxşı bilmək vacib şərtlərdəndir, eləcə də dildə sözlərin metaforlaşaraq işlədilməsini dəqiq bilməsi lazımdır. Bizə elə gəlir ki, slenqləri mənimsəmək müxtəlif nitq üslublarını anlamaq deməkdir, eləcə də həmin slenqləri lazım olan halda və lazımi yerdə işlətmək bacağırına malik olmaq deməkdir. Bunun üçün hər bir insanın öz nitqinə məhşur adamların deyimlərini, bədii ədəbiyyatdan və bədii filmlərdən olan ifadələri daxil etməsi vacibdir. Çünki indi elə bir zamandır ki, slenqə hər yerdə rast gəlmək olar, onu hər yerdə eşitmək olar. Məsələn,

*"Did you see Harry last night?" said the girl at her left, addressing her neighbour.*

*"No".*

*"You ought to have seen the tie he had on. Gee, but he was a mark.*

*-Sən dünən Harrini gördün? – deyə Kerrinin sol tərəfində oturan qız qonşusundan soruşdu.*

*-Yox.*

*-Sən onu yeni qalstukda görəydin! Ah, o nə qədər gözəl idi.*

Misal gətirdiyimiz bu cümlələrdə kontekst daxilində *he was a mark* slenqdir. Əgər biz onun tərcüməsinə diqqət yetirsək görə bilərik ki, həmin ifadənin mənası tamamilə metaforlaşmış bir cümlədir və kontekstdən məlumdur ki, həmin semantika orada özünü göstərir, çünki ondan əvvəlki cümlədə *You ought to have seen the tie he had on. - Sən onu yeni qalstukda görəydin!"* fikri həmin metaforlaşmanı yaradıb və onun da əsasında həmin slenq formalaşıb və nitqdə istifadə olunub.

Həmin əsərin başqa bir hissəsində digər bir slenqin işlədilməsinə diqqət verəndə görürük ki, ingilis dilində işlədilən slenqlər Azərbaycan dilinə fərqli tərcümə olunur.

*A youth with tan-coloured hair, that needed clipping very badly, came shuffing along between the machines, bearing a basket of leather findings under his left arm, and pressed against his stomach. When near Carrie, he stretched out his right hand and gripped one girl under the arm.*

*"Aw", let me go, she exclaimed angrily. "Duffer"* (Dreizer, 1968:61).

*Başı çox tüklü olan gənc, uca boylu, kürən bir oğlan, içərisində dəri qırıntıları olan səbəti qarnına sıxaraq ayaqlarını sürüyə-sürüyə maşınların arası ilə keçirdi. Kerriyə yaxınlaşarkən o, əlini cəld uzadıb qızlardan birinin dirsəyindən tutdu.*

*-Əl çək! – deyə qız hirslə qışqırdı, axmaq!*

Əslində altından xətt çəkdiyimiz *"Aw"* nidası nədənsə narazı qalmaq, nəyəsə acığı tutmaq ifadə edir. Lakin onun qarşılığı ana dilimizə tamamilə başqa cür yəni, *"əl çək"* kimi tərcümə olunub, lakin cümlənin sonunda Azərbaycan dilində jarqon hesab edilən *"axmaq"* sözü də işlədilib.

Bütövlükdə biz abzasın hamısını verməsəydik həmin slenqi kontekstdən kənarda tam anlamaq olmazdı, çünki, qəbul olunmuş bir qayda vardır ki, hər bir sözün, söz birləşməsinin və cümlənin semantikasının tam başa düşülməsi yalnız və yalnız kontekst daxilində mümkündür.

*I have managed to look the best seats at the theatre for us this weekend!*

*Wicked! Thank you. I'm really excited!*
*Hörmətli insan, çox sağ ol, məni həqiqətən duyğulandırdın!*
*Bu həftə sonu bizim üçün teatrda iki yer sifariş etmək mənə müyəssər oldu.*

Əlbəttə bu kontekstdə *wicked* sözü heç də "şeytan" və yaxud "pis" mənasını ifadə etməyib.

Bu kontekstdə həmin *wicked* sözü-slenqi "brilyant" və yaxud "çox hörmətə layiq, ehtiramlı, hörmətli" mənalarını ifadə etmişdir ki, informasiyanı verənin hərəkətlərinin həddindən artıq lütvkarlığını, hörmətə layiq olmağını təqdir edir və *wicked* slenqini işlədir. Halbuki həmin sözün lüğətdə qeyd etdiyimiz mənaları yoxdur.

Dilçilik ədəbiyyatlarında da qeyd olunduğu kimi slenqlər jarqonun bir növüdür ki, müxtəlif kiçik qrup insanların nitqində istifadə olunur, onların söhbətləri, ünsiyyətləri zamanı həmin sözlər işlədilir, onların özləri üçün müəyyən mənaya malik olur və bu sözlər metaforlaşır, dəyişir və slenq olur. Bizim misal gətirdiyimiz *wicked* sözü məhz belə sözdür, çünki onun lüğətdəki mənası müsbət olmadığı halda, verilmiş kontekst daxilində isə bu söz tamamilə əks bir mənanını ifadə etmişdir, əlbəttə buna sübut bu sözü işlədənin ona verdiyi dərin semantika oldu, ona görə ki, birinci cümlənin nəticəsi kimi *wicked* həmin metaforlaşmış semantikanı ifadə etmişdir. Güman edirik ki, ingilis dilinin öyrənilməsində çətin aspektlərdən biri slenqlərdir, ona görə ki, müxtəlif kiçik şəhərlərdə bu dildə danışılarkən slenq işlədilir, bir çox ölkələrdə ingilis dilli əhali vardır ki, onların da öz nitqlərində fərqli slenq-sözlər işlətmələri təbiidir. Bir məqam da vardır ki, insanlar slenq sözləri az işlədirlər və bu onların daha rahat yolla ünsiyyət qurmalarına şərait yaradır.

İngilis dilinin izahlı lüğətlərində həmçinin tərcümə lüğətlərində *mate - dost, yoldaş.* Lakin aşağıdakı cümlədə həmin söz, xüsusilə gənclər arasında slenq kimi işlədilir.

*I'm going to the cinema with my <u>mates</u> tonight.*

İzahlı lüğətdə *mate* sözü *friend, chum, pal or buddy* deməkdir. Məhz bu misal gətirdiyimiz cümlədə həmin mənaları: dost, səmimi dost, yoldaş dost, əlbəttə, həmin sözlər də təxminən Azərbaycan dilinə eyni sözlərlə tərcümə edilir, lakin bizə elə gəlir ki, işlənmə yerinə görə, kontekstə görə fərqlənir, çünki orijinal variantda misal gətirdiyimiz cümlədə həmin söz *mate* slenqdir. Azərbaycan dilində bizə elə gəlir ki, hətta *mate – pal* mənasında kontekst daxilində həmin xüsusiyyəti özündə əks etdirir.

*We are great pals. - Biz çox yaxın dostuq.*
*Now look here pal, you're asking for trouble.*
*Bura bax dost/dostum, deyəsən sənin/sizin başınız/başın gicəlir.*

Bəzən danışıq zamanı nəsə kiminsə xoşuna gəlmir və bu zaman metaforlaşmış slenq işlədilir.

*I don't really like this sort of music. It is just <u>not my cup of tea</u>.*
*Mən bu növ/tip musiqini həqiqətən xoşlamıram. Bu mənim zövqümə uyğun deyil.*
*Hi Sarah! What a surprise to see you here. I haven't seen you <u>in donkey's years</u>! How have you been?*
*Salam Sara! Səni burada görmək necə sürprizdir. Mən səni çoxdandır ki, görməmişəm. Sən nə işlə məşğul olmusan? Haralarda idin?*

Altından xətt çəkdiyimiz *in donkey's years* slenqi uzun müddət bir kəslə görüşməmək mənasını ifadə edir. Təbii olaraq burada motivləşmə və metaforlaşma mövcuddur və bu kontekstdən asılıdır.

Bəzən bir nəfər başqasından problemin həll olunmasını soruşarkən, eləcə də hansısa məsələni həll edib qurtara bildinmi ifadəsini soruşarkən *get it sorted* işlədilir.

*What is happening about that roof leak then?*
*Oh that is <u>sorted</u> now. I found a really good builder to do the job.*
*Sizin damınızın su buraxması nə yerdədir, təmir etdiniz?*
*Oh, indi o məsələ həll olmuşdur. Mən həqiqətən yaxşı bir iş görən tapdım, o işi həll etdi.*

Cümlələrin tərcüməsindən, eləcə də orijinal varianta görə qeyd etmək istərdik ki, məqalənin əvvəlində vurğuladığımız kimi slenqlər bəzən ümumişlək sözə keçə bilir, bəzən isə tərsinə. Axırıncı mısalda *get it sorted* - nəsə çeşidlənmişdir, məsələ çözülmüşdür, həll edilmişdir mənalarını ifadə edir və tamamilə təbii olaraq işləndiyi kontekstdən asılı olaraq metaforlaşma hadisəsi baş vermişdir.

**Nəticə**

Beləliklə, yuxarıda deyilənləri nəzərə alaraq belə bir nəticəyə gəlmək olar ki, nə qədər insan cəmiyyəti mövcuddur, yeni slenqlər yaranacaq və nitqdə istifadə olunacaq.

**Ədəbiyyat**

1. Arnold I.V. The English word. Moscow., Vyssh.Shkola, 1986. - 296 p.
2. Oxford Advanced Learner's Dictionary. Oxford University Press, 2005. - 1539 p.
3. Valiyeva N.Ch. Azerbaijani-English-Russian Idiomatic Dictionary. Baku, Mutarcim, 2017. - 764 p.
4. Dreiser Th.H.A. Sister Carry. Moscow., Higher School, 1968. – 596 p.

**Rəyçi: f.f.d.A.Seyidova**

Göndərilib: 012.04.2021 Qəbul edilib: 14.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/126-129

**Gülənbər Rza qızı Abbasova**
Bakı Dövlət Universitetii
dissertant
gulenbermuslumova@yahoo.com

# AZƏRBAYCAN VƏ İNGİLİS DİLLƏRİNDƏ FONOLOJİ PARALELİZMLƏRİN YARANMASINDA ÖLÇÜNÜN ROLU

***Açar sözlər:*** *fonoloji parallelizm, ölçü, linqvopoetik xüsusiyyətlər, poeziya, dil*

**The role of metre in creating phonological parallelism in Azerbaijan and English**
**Summary**

The article deals with the role of metre in forming linguopoetic features of parallelism in the Azerbaijan and English languages. Phonological parallelism plays a crucial role in forming of linguopoetic features of parallelism. Being the basic rhythmic structure of a verse or lines in verse metre is one of the main ways of forming phonological parallelism in both languages.

In the research of metre literary texts have been considered by linguistic scholars of both languages and in these texts the most common types of metres and their frequency of use have widely been investigated. In both languages approaches to the issue of metre are quite various and thereby we observe the possibilities of different linguopoetic features in poetic samples of stated languages. In the literary texts of both languages we witness that metre is one of the main requirements of determining prosodic- phonological structure of poems.
***Key words:*** *phonological parallelism, metre, linguopoetic properties, poetry, language*

Poeziyada ölçü dedikdə şeirdə və ya şeir misraları arasında əsas qafiyəli quruluş nəzərdə tutulur. Bir çox ənənəvi şeir formaları müəyyən sırada növbələşən ölçünün xüsusi quruluşu və ya ardıcıllığı ilə xarakterizə olunur. Azərbaycan və ingilis poeziyasında ölçünün müxtəlif formaları, növləri və quruluşu var. Azərbaycan dilində heca, əruz və sərbəst vəznindən istifadə olunduğu və onların isə öz növbəsində müxtəlif bölgü, təqti, qafiyə və formaları olduğu halda ingilis dili aksentual dil olduğu üçün o tamam başqa metrik quruluşa əsaslanır.

Azərbaycan poeziyasında  şeirin forması onun vəzni və şəkli ilə xarakterizə olunur. Vəzn sözü bəzən ölçü, bölgü, təqti, durğu sözləri ilə də ifadə olunur. Vəzn əsasən şeir misralarının bölgülənmə qaydasını, metro-ritmik quruluşunu və onun uzunluğunu (misrada olan hecaların sayını) müəyyən edir. Misraların qafiyələnmə qaydasını, misraların uzunluqlarını və şeirin bəndlərə ayrılma qaydalarını şeirin şəkli müəyyən edir. Azərbaycan poeziyasında məsnəvi, qoşma, qəsidə, bayatı, rübai, gəraylı, qəzəl, qitə, mürəbbe, divani, müxənnəs, tərkibənd və başqa şeir şəkilləri mövcuddur. İngilis poeziyasında ölçülü (və ya metrik) şeirdə misranın prosodik fonoloji quruluşu ölçü ilə idarə olunur. Fərqli ədəbiyyatlarda ölçü yaratmağın müxtəlif növləri var. Bəzi ədəbi ənənələrdə (məs., uels, irland, fransız) vurğulu heca misradakı hecaların sayını idarə edir. Başqa ədəbi ənənələrdə (məs., qədim ingilis dili) aksentual vəzn misralarda güclü vurğusu olan (aksentli) hecaların sayını idarə edir. İngilis dilində ədəbi poeziyanın vəznlərin çoxu iki əsas şeyə diqqət yetirir- hecaların sayına və vurğulu hecaların uyğun yerləşdirilməsinə - bu ikili funksiyaya ikili ad verərək, yəni aksentual-sillabik vəzn adlandırılır.

Azərbaycan və ingilis poeziyasında ölçü və onun növləri haqqında danışmazdan əvvəl dünya xalqlarının şeirində istifadə olunan əsasən 3 növ vəzn haqqında danışmaq yerinə düşərdi:

**– Sillabik vəzn** – misralarda heca saylarının bərabərliyinə əsaslanır. Əksər dünya xalqlarının (türk, fars, rus, fransız, italyan və s.) şeirində işlənmişdir. Hazırda bir çoxlarında bu gün də bu vəzndən istifadə olunmaqdadır.

**– Tonik vəzn** – şeir misralarında vurğulu (daha yüksək tonlu) hecaların müəyyən qayda ilə düzülüşüdür. Bəzi xalqların şeirində, o cümlədən rus, fransız şeirində istifadə olunur. Türk dilində isə vurğulu açıq hecalarda belə sait uzanmır, həmçinin şəkilçi qəbul etməmiş sözlərdə həmişə, şəkilçi qəbul etmiş sözlərdə isə əksərən vurğu sonuncu hecaya düşdür. Ona görə də bu dildə vurğu böyük əhəmiyyət kəsb etmir. Bu səbəbdən tonik vəzn türk dilinə xas deyil.

**– Metrik (metro-ritmik) vəzn** – uzun və qısa hecaların misralarda müəyyən ardıcıllığına əsaslanır. Qədim yunan, ərəb, fars, türk, hind və başqa xalqların şeirində istifadə olunmuş və olunmaqdadır. Metrik şeirdə bütün misralar eyni ölçü ilə idarə oluna bilər; onda şeirin mətninin izometrik olduğu deyilir. Əksər ingilis poeziyası izometrikdir, belə ki, şeirdə başdan sona eyni ölçü olur. Ancaq müxtəlif ölçülərlə idarə olunan fərqli misraları da görmək mümkündür və əgər belə bir şey baş verərəsə, bu zaman şeirin mətni heterometrik adlanır. Heterometrik şeirə ingilis dilində nadir hallarda rast gəlinir və mövcud olduğu yerdə eyni şeir daxilində daha uzun və daha qısa hecalara artma verərək misrada hecaların sayı baxımından (hecanın yerini dəyişməkdən çox) ölçüləri dəyişməyə

meyilli olur. M.Montqomeri həmmüəlliflərlə birlikdə yazdığı “İngilis ədəbiyyatı öyrənən tələbələr üçün təkmilləşdirilmiş oxuma bacarıqları” kitabında Vordvorsun “Intimations of Immortality from Recollections of Early Childhood” şeirindən aşağıdakı misraların heterometrik olduğunu deyərək nümunə gətirir: (1. s.117)

| misra sayı | | |
|---|---|---|
| 1 | Our birth is but a sleep and a forgetting: | 11 |
| 2 | The Soul that rises with us, our life's Star, | 10 |
| 3 | Hath had elsewhere its setting, | 7 |
| 4 | And cometh from afar: | 6 |
| 5 | Not in entire forgetfulness, | 8 |
| 6 | And not in utter nakedness, | 8 |
| 7 | But trailing clouds of glory do we come | 10 |
| 8 | From God, who is our home: | 6 |

1 və 2-ci sətirlərdə iambik pentameter, 3 və 4-cü iambik trimeter, 5 və 6-cı iambik tetrameter, 7-ci iambik pentameter, 8-ci misra iambik timeterdir. (Qeyd etmək lazımdır ki, 1 və 3-cü misralardakı əlavə hecalar “ekstrametriklik” nümunəsi kimi müzakirə oluna bilər).

İngilis dildə metrik sistemlərin sayı isə tam razılaşdırılmamışdır. Əsas dörd növü – aksentual şeir, aksentual-sillabik şeir, sillabik şeir və kuvontitativ (kəmiyyət) şeirdir. Qədim ingilis dilinin alliterativ şeiri də bu siyahıya əlavə oluna bilər. Aksentual şeir sətirdəki vurğuların sayına fokuslanır və vurğusuz hecaları gözardı edir. Aksentual sillabik şeir həm şətirdəki hecaların ümumi sayına, həm də vurğuların sayına diqqəti yönəldir. Sillabik şeir təkcə sətirdəki hecaların sayına əsaslandığı halda kuvontitativ şeir uzun və qısa hecaları tənzimləyir.

İngilis dilində şeirin mətninin prosodik fonoloji quruluşu müəyyən mənalarda sabitdir, ancaq bəzən səsləndirərkən dəyişdirilə bilir. Sabit şeir mətninin aspektləri (polisillabik) sözlər daxilində vurğu ahəngləşməsi və mətndəki hecaların sayıdır. Bu ən çox ölçü ilə idarə olunan mətnin iki sabit aspektidir. Səsləndirərkən dəyişdirilə bilən ingilis dilindəki şeir mətnlərinin prosodik fonoloji quruluşunun əsas aspektləri bunlardır: (a) bütün tələffüz boyunca vurğuların paylanması və uyğun gücü; (b) hecaların uzunluğu (genişlənə və sıxıla bilər); (c) hecaların zirvəsi (pik) (dəyişdirilir, məsələn, melodiyanı oxuyanda). Bu dildəki şeir mətnlərinin bu aspektləri ölçü ilə normal tənzimlənmədikdə onlar digər yollarla tənzimlənir. Əvvəlcədən mövcud olan musiqili qafiyə və melodiyaya uyğunlaşdırılmış mətn buna misal ola bilər.

İngilis dilində ən çox istifadə olunan ölçü iambik pentameterdir yəni uyğun olaraq bir-birini izləyən vurğulu və vurğusuz hecalarından ibarət olan 5 iambik fit və ya iamblara əsaslanır. John Miltonun “İtirilmiş cənnət” (*Paradise Lost)* və bir çox sonnetləri bu ölçüdə yazılmışdır. Qədim Azərbaycan dilli poeziya fars ənənələrində güclü təsirləndiyi və əsasən əruz vəznində yazılmış poeziyaya malik olduğu halda ənənəvi Azərbaycan poeziyası daha çox heca və sərbəst vəzndə qələmə alınmışdır.

Aksentual-sillabik ölçü misradakı hecaların sayına və həmçinin misradakı vurğulu hecaların bəzilərinin yerləşməsinə nəzarət edir. Şekspirin aşağıdakı 40-ci sonetinə (1609) nümunə üçün nəzər salaq:

Take all my loves, my love, yea, take them all:
What hast thou then more than thou hadst before?
No love, my love, that thou mayst true love call—
4 All mine was thine **before** thou hadst this more.
Then if for my love thou my love **rec*ei*vest**,
I **c*a*nnot** blame thee for my love thou ***u*sest**;
But yet be blamed if thou **thyself dec*ei*vest**
8 By **w*i*lful** taste of what **thyself ref*u*sest**.
I do **forg*i*ve** thy **r*o*bbery, g*e*ntle** thief,
**Alth*ough*** thou steal thee all my **p*o*verty**;
And yet love knows it is a **gr*ea*ter** grief
12 To bear love’s wrong than hate’s known ***i*njury**.
**Lasc*i*vious** grace, in whom all ill well shows,
Kill me with spites, yet we must not be foes.

İlk öncə sətirlərin xarakteristikasını qeyd edək. Hər sətir ölçü ilə idarə olunur; sətirlərin sonunda fasiləyə meyillilik var və burada cümlələr sonlanarkən sərbətlik yaranır; və əlbəttə sətirlərdə çap olunur.

Burada ölçü iki funksiyanı həyata keçirir. İlk öncə hər sətirdə on heca olmağı tələb edir. Buna görə də, 1-4-cü və 10-14-cü sətirlərdə 10 heca var. 5-8-ci sətirlərdə 11 heca var. Bu ektrametriklik adlanan ümumi anlayışdır. Sətirlərin bəzi hissələri - adətən sətrin məhz sonunda ölçü nəzarətdən kənara düşür (yəni, ektra-metrik olur) ; sanki ölçü qalıq buraxaraq şeirin sətrini qənaətbəxş şəkildə idarə edə bilmir.

Ölçünün həyata keçirdiyi ikinci funksiya xüsusi vurğulu hecaların yerləşməsini idarə etməkdir. İambik ölçüdə vurğulu hecaların sətirdə cüt mövqelərdə olması ilə bağlı bir ümumi tendensiya var (məs., burada biz 2, 4, 6, 8 və 10-cu mövqelərdə vurğulu hecaların olmasını gözləyə bilərik). Bu o mənanı vermir ki, hər cüt mövqe vurğulu heca ilə doldurulacaq amma bu o mənanı verir ki, biz vurğulu hecaların cüt mövqedə olmasını gözləyə bilərik. Bu fərqlənməyən vurğu ahəngləşməsinin olduğu sözlərə baxdıqda daha aydındır- bu polisillabiklikdir. Əgər biz şeirdə (tünd verilmiş) polisillabik sözlərə baxsaq, görə bilərik ki, çoxhecalılar içərisindəki vurğulu hecalar (əyri kursivdə) hamısı cüt mövqelərdədir – 6, 8, 10, 13- cü sətirlərdə ikinci, 9-cu sətirdə dördüncü, 4 və 9-cu sətirlərdə altıncı, 7, 8, 9, 11, 12-ci sətirlərdə səkkizinci, 5, 6, 7-ci sətirlərdə onuncudur. Belə bir sual ortalığa çıxır: "Tekhecalılar necə olur?" Şeirdəki rolundan asılı olaraq çoxhecalılar vurğulu ola da, olmaya da bilir: bu o mənanı verir ki, ölçünün onlar üzərində az nəzarəti var, ancaq yenə də cüt hecalara azca meyili olan vurğulu təkhecalıların sərbəst ahəngləşməsi var. Yuxarıda nümunə gətirilən şeirdə çoxhecalı sözlərdəki bütün vurğular dəqiqliklə ölçünün olacağına uyğunlaşır. Amma sətirin əvvəlində olan ümumi variasiya var: burada ilk hecada olan (yəni cüt hecada deyil) polisillabik sözdə vurğulu heca olmağı mümkündür. Bu anlayış troxaik inversiya adlanır və Şekspirin aşağıdakı misralarında görünür:

**Bearing** the **wanton burthen** of the prime

Bu misrada 2-ci və 3-cü çoxhecalıların cüt mövqelərdə öz vurğulu hecaları var, ancaq ilkin çoxhecalının tək mövqedə vurğulu hecası var. Troxaik inversiya misranın əvvəlində ölçünü biraz sərbəst anlamaya cəlb etmə kimi görünür; ölçünün əvvəldə sərbəst olması faktı dünya üzrə bütün ölçülü şeirlərdə ümumi haldır (ektrametriklik effektlərində olduğu kimi) və psixoloji səviyyədə ölçülü quruluş və anlamın işləmə tərzi haqqında nəyəsə təsir edə bilir.

Təkhecalıların hesabına çoxhecalılığa çox diqqət yetirdik. Təkhecalılar ölçünün heca sayılan hissəsi ilə hesablanır, ancaq onların daxili vurğu ahəngləşməsi olmadığı üçün ölçünün vurğu hissəsi ilə idarə oluna bilinməyi azdır. Cüt mövqelərdə olan mühüm monosillabik sözlər üçün ümumi tendensiya var, ancaq bu əsas metrik fakt ola bilməz çünki sözlərin prosodik fonoloji xarakteristikasına əsaslanmır. Bu azca fərqli olmağın nəticəsidir, yəni cüt hecalarda daha böyük vurğunu yerləşdirərək daimi qafiyə ilə sətirlərdə rol oyanmaq tendensiyasıdır (ölçü çoxhecalıların cəlb olunduğu hallarla qurulur). Amma qeyd etmək yerinə düşər ki, icrada qafiyənin hər hansı bir daimiliyi ölçü ilə dəstəklənməməklə yanası özü ölçünün tələbi deyil. Ölçü təkcə mətnin quruluşuna yox, onun necə fəaliyyət göstərdiyinə də nəzarət edir.

Azərbaycan poeziyasında müstəqil vəzn kimi heca və əruz vəznlərindən və onlarla şeir şəklindən istifadə olunur. Həmçinin, ayrıca sərbəst şeir forması da vardır ki, o da özündə xüsusi vəzni və şəkli ehtiva edir.

Misralarda heca saylarının bərabərliyinə, diləyatımlı, ahəngdar bölgülənməyə və bu bölgülənmənin bütün misralarda qismən eyniliyinə (təkrarına) əsaslanan şeir vəzni heca vəznidir. İndiyədək heca vəzninin ritmik xüsusiyyəti yalnız bölgülənmə və heca sayı baxımından araşdırılmışdır. Amma Şirvani Ədilli "Azərbaycan şeirində forma məsələləri" kitabında bu vəznin ritmik xüsusiyyətinin məhz uzun və qısa hecalar (metrik) baxımından araşdırılmasının vacibliyini vurğalayaraq demişdir: "Əruz vəznində uzun və qısa hecaların dəyişməz ardıcıllığı tələb olunduğu halda, heca vəznində uzun və qısa hecalarla bağlı başqa tələblər var. Heca vəzninin uzun və qısa hecalar baxımından ritmik xüsusiyyəti (metro-ritmik xüsusiyyəti) ondan ibarətdir ki, bu vəzn misranın bölgüləri daxilində uzun və qısa hecaların bərabərliyini – balansını tələb edir. Belə ki, misraların bölgüləri daxilində uzun hecalar nəzərə çarpacaq dərəcədə azlıq təşkil etdikdə, qısa hecalarda saitlər məcburi uzadılır və bununla da bölgü daxilində uzun və qısa hecaların say fərqi minimuma endirilir. Yəni təqribi də olsa bərabərlik təmin edilir. Bu hal 7-hecalı şeirdə özünü daha çox göstərir." (4. s.39)

Azərbaycan ədəbiyyatında əruz vəzni isə uzun və qısa hecaların müəyyən birləşmələrində ritm yaradan ardıcıllığının bütün misralarda dəqiqliklə gözlənilməsi ilə müəyyən olunan şeir vəznidir. Uzun hecalara qapalı hecalar və saiti uzanan açıq hecalar, qısa hecalara isə saiti uzanmayan açıq hecalar aiddir. Əruzda misraların uzunluğunu, ritmik quruluşunu (uzun və qısa hecaların düzülüşünü) və bölgülərini əvvəlcədən tərtib olunmuş qəliblər müəyyən edir. Tarixdə ilk dəfə ərəb filoloqu Xəlil İbn Əhməd (718-792) qəlibləri göstərir. Onun irəli sürdüyü qəliblərdə bölgüləri təfilələr (ərəbcə "fə'ələ" feilindən yaranmış müxtəlif ifadələr), uzun və qısa hecaların yerini isə təfilələrdəki uzun və qısa hecalar müəyyən edir. Əruz vəznində sözlərin bölgülərdə parçalanması mümkündür. Bu kimi digər halları da nəzərə aldıqda əruz sillabik-metrik vəzn hesab etmək olur. Əruz vəzninin sadələşdirilmiş qəlibləri və müxtəlif bəhrləri və onların hər birinin fərqli təfilələri mövcuddur.

Yuxarıda qeyd olunan bütün halları nəzərə alaraq deyə bilərik ki, Azərbaycan və ingilis dillərində ölçü fonoloji parallelizmlərin yaranmasına xidmət edir. Hər iki dil müxtəlif metrik quruluşa və ölçü sisteminə malikdir və bu isə özlüyündə fonoloji paralelizmlərin yaranmasında rol oynayan heca və vurğunun öyrənilməsinə gətirib çıxarır. İngilis dilindəki aksentual olduğu üçün ölçü vurğulu və vurğusuz hecaların növbələşməsi əsasında yarandığı halda Azərbaycan dilində mövcud olan üç vəzn və onların şəkilləri bu baxımdan fərqləndirilir. Bu

xüsusiyyətlər ölçünün növlərini və onların işlənmə məqamlarını, şəkillərini tədqiq edərək hər iki dildə olan fonoloji parallelizmləri öyrənməyə kömək etmişdir.

**References**

1. Martin Montgomery, Alan Durant, Nigel Fabb, Sarah Mills, 2000, Ways of Reading: Advanced Reading Skills for Students of English Literature, London and NewYork / 2nd edition.
2. MCMAHON A., HEGGARTY P., MCMAHON, R., & MAGUIRE, W. (2007). The sound patterns of Englishes: Representing phonetic similarity. English Language and Linguistics, 11 (1), 113-142. doi: 10.1017 / S1360674306002139
3. Pascual, Rafael J. "Alliterative Metre and Medieval English Literary History." Atlantis. Journal of the Spanish Association for Anglo-American Studies 40.2 221–230. Web.
4. Shirvani Adilli. Issues of form in Azerbaijani poetry, Baku, 2014, 144 pages, "Science and Education".
5. https://www.researchgate.net/publication/256619060_Linguistic_prosody_and_musical_meter_in_song

**Rəyçi: prof. Ə.Rəcəbli**

Göndərilib: 07.04.2021 Qəbul edilib: 08.04.2021

istintaqdan, işə məhkəmədə baxılmasından və apellyasiya icaatından ibarətdir (4,s. 253). Qeyd olunan yanaşmalarda müəyyən fərqlilik olsa da, prinsip etibarı ilə sadalanan təsnifat Statutun cinayət işlərinin təqibi üzrə müəyyən etdiyi ardıcıllığa söykənir.

Statutun 34-cü maddəsindən göründüyü kimi Məhkəmənin təşkilati strukturuna aid olan həlqələrdən biri də İlkin icraat şöbəsidir. Lakin qüvvədə olan Statutda hər üç şöbənin statusu müəyyən edilməmişdir və həmin şöbələrin Məhkəmə çərçivəsində funksiyalarını onun palataları: İlkin icraat palatası, Məhkəmə palatası və Apellyasiya palatası həyata keçirir. 39-cu maddəyə müvafiq olaraq, hakimlərin seçilməsindlən sonra mümkün qədər tez Məhkəmə öz tərkibində şöbələr təşkil edir. Apellyasiya şöbəsi sədr və 4 hakimdən, Məhkəmə şöbəsi və İlkin icraat şöbəsi isə azı 6 hakimdən ibarət olur. Hakimlərin şöbələrin tərkibinə təyin olunması hər bir şöbənin üzərinə qoyulan funksiyaların xarakteri, hər bir şöbədə cinayət hüququ və cinayət prosesi və beynəlxalq hüquq sahəsində mütəxəssis olan optimal sayda hakimin ola bilməsi üçün seçilmiş hakimlərin səriştəsi və təcrübəsi nəzərə alınmaqla həyata keçirilir. İlkin icraat şöbəsi və Məhkəmə şöbəsi əsasən cinayət işləri üzrə məhkəmə araşdırmalarının aparılması sahəsində təcrübəyə malik olan hakimlərdən ibarət olur. Eyni zamanda, Məhkəmənin işinin həcmini, onun səmərəli fəaliyyətinin zəruriliyi yarandığı hallarda Statut iki və ya daha çox İlkin icraat palatalarının və ya Məhkəmə palatalarının yaradılması imkanına yol verir (13, p.876).

BCM-in təşkilinin struktur həlqələrini milli məhkəmə instinsiyalarının həlqələri ilə müqayisə etsək, onda İlkin icraat şöbəsi və Məhkəmə şöbəsini və onların funksiyalarını həyata keçirən palataları birinci instansiya məhkəmələri, Apellyasiya şöbəsini isə yuxarı instansiya məhkəməsi kimi xarakterizə etmək olar. İlkin icraat şöbəsi və onun simasında fəaliyyət göstərən palatalar, o cümlədən Prokuror dəftərxanası Məhkəmənin üzərinə qoyulmuş yükün əsas daşıyıcısıdırlar. Biz bunu həmin həlqələrin cinayət işinin başlanması, təqibi və məhkəmə baxışında həyata keçirdikləri fəaliyyətlərində də görə bilərik.

Beynəlxalq Cinayət Məhkəməsində cinayət işlərinə aidiyyatı üzrə baxılması özünün prosessual təbiətinə görə bir neçə mərhələdən ibarət mürəkkəb bir prosesdir. Statutun beşinci və altıncı hissələrində Məhkəmənin predmet yurisdiksiyası altına düşən cinayətlərin istintaqı, cinayət təqibi və məhkəmə baxışı ilə bağlı məsələlərin hüquqi tənzimlənməsi təsbit olunmuşdur. İş üzrə istintaq tədbirləri Statutun tələblərinə müvafiq olaraq Prokuror tərəfindən aparılır və o, istintaqın başlanması üçün kifayət qədər əsasların olması qərarına gələrsə xahişini əsaslandıran toplanmış materillarla birgə İlkin icraat palatasına təqdim edir və istintaqın aparılmasına razılıq verilməsini xahiş edir (53-54-cü mad).

İlkin icraat palatası Prokuror tərəfindən təqdim olunmuş müraciət və onu əsaslandıran materialları öyrəndikdən sonra cianyət işinin Məhkəmənin yurisdiksiyası altına düşməsi və istintaqın başlanması üçün lazımi əsasların olması nəticəsinə gələrsə o, Məhkəmənin yurisdiksiyasına və işin icraata qəbul oluna bilməsinə dair sonradan qərarlarına xələl gətirmədən istintaqın başlanmasına razılıq verir. Lakin, ola bilər ki, Məhkəmə işi icraata qəbul etməsin və bu aşağıdakı hallarda mümkündür: a) dövlət istintaq aparmaq və lazımi tərzdə cinayət təqibinə başlamaq iqtidarında olmadığı və bunu arzulamadığı hallar istisna olmaqla, eyni iş üzrə yurisdiksiyaya malik olan dövlət tərəfindən istintaq aparıldıqda və ya cinayət təqibi başlanmış olduqda; b) qəbul edilmiş qərarın dövlətin lazımi tərzdə cinayət təqibinə başlamaq iqtidarında olmaması və bunu arzulamamasının nəticəsi olmaması halları istisna olmaqla, iş ona dair yurisdiksiyaya malik dövlət tərəfindən istintaq edilikdə və dövlət bu işin aid olduğu şəxsə qarşı cinayət təqibinə başlamamaq qərarına gəldikdə; c) işin aid olduğu şəxş ərizənin predmeti olan hərəkətə görə mühakimə elilmişdirsə, yəni qadağan olunmuş hərəkətə görə digər Məhkəmə tərəfindən mühakimə edilmişdirsə; d) əgər iş Məhkəmənin sonrakı hərəkətləri doğruldacaq qədər ciddi deyildirsə. Bütün bu yuxarıda göstərilən hallarda iş Məhkəmənin icraatına qəbul edilmir.

Burada bir məsələyə aydınlıq gətirmək lazımdır ki, əslində Beynəlxalq Cinayət Məhkəməsi cinayət işinin istintaqı və cinayət təqibinin milli cinayət ədliyyə orqanlarının icraatında olmasında maraqlıdır. Birincisi, bu onun milli cinayət ədliyyə orqanlarına münasibətdə komplementarlıq prinsipi əsasında fəaliyyət göstərməsi ilə, ikincisi isə o, bu vəziyyətdə neqativ komplementarlıq vəziyyətinə (çəkinmə) daha çox üstünlük verməsi ilə, üçüncüsü isə milli cinayət ədliyyə orqanlarının fəaliyyətinin son nəticəsini gözləməsi ilə bağlıdır. Əgər törədilən beynəlxalq cinayətlərin istintaqı və cinayət təqibi ilə bağlı milli cinayət ədliyyə orqanlarının müəyyən köməyə ehtiyacı yaranarsa, o, belə olan halda öz köməyini və dəstəyini həmin orqanlara təklif edir. Lap dəqiq ifadə etsək, BCM pozitiv komplementarlığa getməkdən imkan dərəcədə yan durmağa çalışır, lakin bununla belə qanunçuluğun və ədalətin təmin olunmasında bütün hallarda maraqlıdır.

Əvvəldə vurğulandığı kimi BCM-in struktur həlqələri cinayət işlərinin istintaqı və cinayət mühakimə icraatında qarşılıqlı fəaliyyət göstərirlər. Xüsusən bu özünü işlərin istintaqı zamanı Prokuror və İlkin icraat palatasının fəaliyyətlərində daha çox biruzə verir. Prokuror öz fəaliyyətini İlkin icraat platası ilə birlikdə həyata keçirir. Belə ki, İlkin icraat palatası Məhkəmə ardıcıllığının və səmərəliliyinin təmin ediməsi üçün aşağıdakı müvafiq tədbirləri görə bilər: a) əməl edilməli olan prosedurlara münasibətdə təklif və sərəncamların verilməsi; b) işin icraatına aid protokolların aparılması barədə göstərişlərin verilməsi; c) kömək göstərilməsi üçün ekspert təyin

edilməsi; d) Məhkəmənin əmri ilə həbs edilmiş və Məhkəməyə gəlmiş şəxsin müdafiəçisinə baxışda iştirak etməyə razılıq verilməsinin, yaxud həbs baş tutmamışdırsa və ya çağırılmış şəxs gəlməmişdirsə, yaxud müdafiəçi müəyyən edilməmişdirsə baxışda iştirak etmək və müdafiənin maraqlarını təmin etmək üçün digər müdafiəçinin təyin elilməsi; e) öz üzvlərindən birinə, yaxud ehtiyac olarsa İlkin icraat şöbəsi, yaxud Məhkəmə şöbəsinin hakiminə sübutların toplanılması və saxlanılması və şəxslərin dindirilməsinə dair təklif, sərəncam vermək və müşahidəni həyata keçirmək üçün tapşırıqlar verilməsi; f) sübutların toplanılması və saxlanılması üçün zəruri olan bu kimi dəgər hərəkətləri həyata keçirmək səlahiyyətinə malikdir (56-cı maddə).

Roma Statutunun V Hissəsində İlkin icraat palatasının funksiya və səlahiyyətlərinin dairəsi müəyyən olunub. Bu palatanın funksiyalarına və səlahiyyətlərinə aydınlıq gətirməzdən öncə bir məsələyə toxunmaq istərdik ki, BCM ümumdünya məhkəmə praktikasının varislik prinsipinə əsaslanmaqla, istər dövlətdaxili qanunvericilikdə, məsələn, AR-ın qüvvədə olan cinayət-prosessual qanunvericiliyində, istərsə də beynəlxalq müqavilələrdə (məs, 1948-ci il İnsan Hüquqlarının Ümumi Bəyənnaməsində, 1966-cı il Mülki və siyasi hüquqlar haqında Beynəlxalq Paktda, 1950-ci il Avropa İnsan Hüquqları Konvensiyasında və b.) ədalətli məhkəmə araşdırmasının əsas prinsipləri kimi tanınmış: ədalət mühakiməsinin yalnız məhkəmələr tərəfindən həyata keçirilməsi, qanunçuluq, humanizm, şəxsiyyətin şərəf və ləyaqətinə hörmət etmə, şəxsiyyətin toxunulmazlığı, cinayət mühakimə icraatında insan və vətəndaşın hüquq və azadlıqlarının qorunması, təqsirsizlik prezumpsiyası, tərəflərin çəkişməsi, sübutların qiymətləndirilməsində azadlıq, prosessual hərəkətlərdən və qərarlardan şikayət verilməsi kimi prinsipləri özünün prosessual fəaliyyətinin əsası kimi tanımış və onları öz Statutunun müvafiq maddələrində təsbit etmişdir.

Hətta Məhkəmə onun icraatına verilmiş *Tomas Lubanqi işində* Apellyasiya onun məsuliyyətə cəlb olunmasının əsaslarına qiymət verərkən qeyd etmişdi ki, ən çətin vəziyyətdə belə sübutların əldə olunması zamanı ədalətli məhkəmə araşdırması prinsipinin əsaslarına mütləq əməl olunmalıdır, əks təqdirdə məhkəmənin ədalət mühakiməsini həyata keçirmək kimi məqsədi gölgə altına alına bilər. Palata öz qərarında qeyd etmişdi ki, ittiham olunan şəxsin hüquqlarının qorunmasının mümkünlüyü və zəruriliyi təkcə Məhkəmənin Statutunun müddəaları ilə deyil, həmçinin Avropa İnsan Hüquqları Məhkəməsinin və Yuqoslaviya Beynəlxalq Cinayət Tribunalının praktikası nəzərə alınmaqla təmin olunmalıdır. Ona görə ki, cinayət prosesində ədalətin təmin olunması prosesdə ittiham olunan şəxsin və onun müdafiəçisinin ən çox diqqət yetirdiyi və arzuladığı nəticədir. Məhz bu zaman məhkəmənin əsas məqsədi ədalətli məhkəmə araşdırması prinsipinin əsaslarını təmin etməkdən ibarət olmalıdır (8, p. 807-817).

Statutun 57-ci maddəsinə əsasən İlkin icraat palatası aşağıdakılara münasibətdə: a) Prokurorun xahişinə əsasən istintaqın aparılması məqsədi ilə zəruri ola bilən order və sərəcamların verilməsi; b) Statuta əsasən həbs olunmuş və ya əmrə əsasən gəlmiş şəxsin xahişi ilə müəyyən sərəncamlar vermək, yaxud şəxsin müdafiəsinin təşkil olunmasında ona kömək etmək üçün zəruri ola biləcək əməkdaşlıq yaratmağa kömək etmək; c) zəruri olduğu hallarda zərərçəkmişlər və şahidlərin şəxsi həyatının toxunulmazlığı və qorunması, sübutların qorunması, həbs olunmuş, yaxud əmr üzrə gəlmiş şəxslərin müdafiəsi və bilavasitə milli təhlükəsizliyə aid olan məlumatların qorunmasını təmin etmək; d) əgər İlkin icraat palatası mümkün qədər müvafiq dövlətlərin rəyini nəzərə alaraq, konrket hal üzrə dövlətin Statutun IX hissəsinə uyğun olaraq əməkdaşlıq haqqında xahişinin yerinə yetirilməsi üçün zəruri olan hər hansı orqanının yaxud, onun məhkəmə sisteminin elementinin olmaması səbəblərindən açıq-aydın yerinə yetirə bilməməsini müəyyən etmişdirsə, Prokurora iştirakçı-dövlət ərazisində bu dövlət tərəfindən Roma Statutunun IX hissəsinin müvafiq olaraq əməkdaşlığa razılıq alanmadan istintaqa dair xüsusi tədbirlərin həyata keçirməyə razılıq vermək. İlkin İcraat Palatası məlumatın dinləmələr üçün açılması barədə sərəcam vermək və bu kimi funksiya və səlahiyyətlərə malikdir (1, s. 289-290).

58-ci maddəyə görə, İlkin icraat palatası Prokurorun müraciəti əsasında, istintaqın başlanmasından sonra istənilən vaxt Prokuror tərəfindən təqdim olunmuş bu müraciət və sübutları, yaxud digər məlumatları nəzərdən keçirərək aşağıdakıları müəyyən edirsə bu və ya digər şəxsin həbsinə order verir; a) həmin şəxsin Məhkəmənin yurisdiksiyası altına düşən cinayəti törətməsini güman etməyə məntiqi əsaslar vardır; və b) həmin şəxsin həbs edilməsi aşağıdakılara görə zəruridir. i) onun məhkəmə baxışına gəlməsini təmin etmək üçün; ii) bu şəxsin istintaq, yaxud məhkəmə baxışı üçün hədə-qorxu, yaxud maneçilik törətməməsini təmin etmək üçün; iii) müvafiq hallarda şəxs tərəfindən bu cinayətin davam etdirilməsinin, yaxud onunla bağlı olan, Məhkəmənin yurisdiksiyası altına düşən və eyni hallarla əlaqədar olan cinayətin törədilməsinin qarşısının alınması üçün. Statutun 60-cı maddəsi isə İlkin icraat palatasında işin başlanması ilə bağlı məsələləri tənzim edir.

İlkin icraat palatasının Statutla müəyyən olunmuş funksiya və səlahiyyətlərinin dairəsinə nəzər yetirdikdə onun şahidi oluruq ki, Məhkəmənin fəaliyyət sistemində bu palata bir növ həm Prokurorla qarşılıqlı müstəvidə cinayət işlərinin istintaqının həyata keçirilməsində, həm də məhkəməyə qədər icraatın həyata keçirməsində mühüm rola və səlahiyyətə malikdir. Başqa sözlə desək, BCM-də işlə bağlı həyata keçiriləcək sonrakı prosessual fəaliyyətlər məhz İlkin icraat palatasından asılıdır və onun süzgəyindən keçməlidir. Tədqiqatçı alim E.N.Trikoz Məhkənin təşkilati strukturunda İlkin icraat palatasının rolunu belə qiymətləndirir ki, bu Palatanın rolu Statutun

60-cı maddəsinə əsasən səlahiyyəti şəxsin həbs edilməsi və təhvil verilməsinin qanuniliyini, məhkəmə baxışının başlanmasına qədər onun həbsdən müvəqqəti azad edilmə haqqında vəsatət vermək hüququ da daxil olmaqla, onun başqa hüquqları barədə məlumatlandırılmasını təmin etməkdən ibarətdir. Müəllif sonra vurğulayır ki, bu Palatanın məhkəməyə qədər həyata keçirdiyi prosedur *habeas corpus* kimi tanınan anqlo-sakson prosedurunun oxşarıdır (7, s.209).

Beləliklə, onu qeyd edə bilərik ki, İlkin icraat palatası tərəfindən həyata keçirilən prosedur istintaqın aparılması mərhələsində prosesin çəkişmə modelinin təzahürüdür və bu prosedurun çəkişmə xarakterli olması Məhkəmənin sübutetmə və prosedur Qaydalarının 121-ci qaydasında da öz təsbitini tapmışdır. Orada qeyd olunur ki, İlikin icraat palatası Prokurorla Məhkəməyə təhvil verilməsi və ya gəlməsi zəruri olan şəxs arasında informasiyanın açıqlanmasına dair qərar qəbul etmək səlahiyyətinə malikdir (6,s.230-231). Statutun 57-ci maddəsinin məzmunu isə belə bir nəticə çıxarmağa imkan verir ki, bu Palata həm həlledici funksiyanı (sübutların toplanmasına köməklik göstərmə, şahidlərin və zərər çəkmiş şəxslərin və onların ailə üzvlərinin təhlükəsizliyinin təmin edilməsi), həm məcburiyyət tədbirlərinin tətbiqi funksiyasını (həbs edilmə haqqında order vermə, məhkəməyə gəlmə haqqında əmr vermə, müttəhimin mühafizə altında olması haqqında qərarın mütəmadi olaraq yoxlanılması), həm də məhkəmə nəzarəti (cinayət təqibinin və istintaqın başlanılmasına dair Prokurorun qərarları) funksiyasını yerinə yetirir. Məsələn, 14 oktyabr 2005-ci ildə Məhkəmənin 2-ci İlkin icraat palatası Uqandanın Allahın müqavimət ordusunun 5 liderinə qarşı: Cozef Koni, Vinsenta Otti, Okota Odhiamba, Dominika Onqvena və Raski Lykviyə qarşı Prokurorun həbs etməyə dair orderini təsdiq etmiş və həmin şəxslərə qarşı insanlıq əleyhinə cinayətləri törətməyə görə cinayət işi qaldırılmışdır. Məhkəməyə verilmiş iki iş (Venesuela və İraq) kifayət qədər əsaslı məlumatları əks etdirmədiyi üçün icraata qəbul edilməmişdir.

## References

1. Statute of the International Criminal Court. Collection of international documents. Volume 1 Baku. GISO Enterprise KRINB. 2005
2. Huseynov L.H. International law. Textbook. Baku. Qanun publishing. 2012
3. Mammadov R.K. International criminal law and criminal legislation of the Republic of Azerbaijan. Monograph. Baku.NATCoMMC, 2012
4. Ilyutchenko NV Implementation of the Roman Statute of the International Criminal Court: criminal-procedural aspects // International law. 2007. №1, c. 249- 253
5. Kasinyuk OV Criminal-procedural nutrition of inter-ethnic criminal courts: dissertation. candidate of law. Science: 12.00.11: "International law". Kharkiv, 2005
6. International criminal court. Collection of documents. Kazan. Center for Innovative Technologies. 2004
7. Tricose E.N. The first criminal investigations in the practice of the International Criminal Court // International Law. 2007. №, c. 201-211
8. Amman D.M. Prosecutor v. Lubanga // American Journal of International Law, 106, 2012, p. 809-817.
9. Cassese A. International Criminal Law. Dordrecht-Boston-London, 2001
10. Cassese A, Gaeta P, Baig L, Fan M, Gosnell C and Whiting A. International Criminal Law. Oxford University Press. Oxford. 2008
11. Damgaard Ciara. Individual Criminal Responsibility for Core International Crimes: Selected Perinent Issues. Spinger-Verlag and Heidelberg Gmbh and CoK Berlin, 2008
12. Stephen Ch. IIC Launch Bolsters Human Rights Cause // Institute for War and Peace Reporting, February, 2003.p 25-36
13. Schabas A.William.The International Criminal Court: A Commentary on the Rome Statute. Oxford University Press.Oxford, 2010

**Rəyçi: prof. F.M.Abbasova**

Göndərilib: 12.04.2021 Qəbul edilib: 13.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/253-256

**Səadət Mahir qızı Məmmədbağırova**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
Seadet_mb@outlook.com

# VERGİ PLANLAŞDIRMASI VƏ ONUN İQTİSADİ SUBYEKTLƏRİN MALİYYƏ VƏZİYYƏTİNƏ TƏSİRİ

***Açar sözlər:*** *vergi planlaşdırması, iqtisadi subyekt, maliyyə prosedurları, müəssisə startegiyaları, müasir etodlar*

## Tax planning and its impact on the financial situation of economic entities

**Summary**

Taxes, which play the most important role in the financing of public services, create an additional burden for taxpayers trying to maximize their benefits. In an environment of globalization and increasing competition, enterprises in particular may be able to implement some strategies to minimize the tax burden. Some businesses use illegal methods, while others try to reduce the tax burden by applying a tax plan. In this regard, it is very important to study the topic at a modern level.
***Key words:*** *tax planning, economic entity, financial procedures, enterprise strategies, modern methods*

## Giriş

Məqalədə hər bir müəssisə üçün danılmaz bir əhəmiyyətə sahib olan və müəssisələri vergi planlaşdırmasına yönəldə biləcək vergi prosedurunun nəzəri çərçivəsi təqdim edilmişdir; Burada vergi qanunvericiliyinin sadəliyi və anlaşıqlığı, vergi inzibatçılığı və vergi yoxlamasının səmərəliliyi, vergi cərimələrinin dayandırılması, mühasibat və məsləhət xidmətləri, dövlət idarəetməsinin səmərəliliyi, vergi etikası və məlumatlılığı, vergi amnistiyalarının olmaması müasir və təsirli bir vergi sisteminin qurulması vergi ödəyicilərinə verilən dəyərlər müzakirə olunur.

## Vergi planlaşdırmasına ümumi baxış

Vergi planlaşdırması, vergi qanunvericiliyi ilə müəyyən edilərək sahibkarlıq subyektlərinin vergilərə və uyğunluq proseslərinə qarşı cavablarını idarə edərək vergi yükünü minimuma endirmək məqsədi ilə vergi qənaətinin təmin edilməsidir. Vergi ödəyiciləri vergi qanunları ilə onlara verilmiş hüquqlardan istifadə nəticəsində az vergi ödəməklə vergini minimuma endirə bilər.

Vergiyə cəlb edilməməsi şəklində iş davranışı, bəzən verginin demokratikləşməsi prosesində problemlərin meydana çıxmasına səbəb olmuş və nəhayət, demokratik, sosial və qanunun aliliyində vergi planlaması şəklində qanuniləşdirilmişdir. Beləliklə, vergi ödəyicilərinin vergiyə reaksiya və müqavimət göstərməsinin ən uyğun yolu qanunun aliliyi ilə təmin edilmiş və qanuni mühitdə tətbiq olunan qanuni davranış tərzi olan vergi planlaşdırmasıdır.

## Vergi planlaşdırmasının əhəmiyyəti

Vergi planlaşdırması vergi öhdəliklərinin azaldılması və daha az vergi ödəmə imkanları baxımından bütün müəssisələr üçün vacibdir. Maliyyə planlaşdırması çərçivəsində planlı vergi rəhbərliyini həyata keçirən müəssisələr ticarət əməliyyatlarında alternativ siyasət və strategiyalar yaradır və bunlardan istifadə etmək imkanına sahib olur.

Şirkətlər planlı vergi rəhbərliyi sayəsində heç bir cəza ilə qarşılaşmadan vergi yüklərini minimuma endirə bilərlər (M.Məcidov 2013: 144). Vergi qanunvericiliyi çərçivəsində, vergi yükünü qanuni yollarla minimuma endirmək üçün müəssisələrin institusional vəziyyətə gətirilməsi, peşəkar şəxslərdən və təşkilatlardan bəzi təkliflər alması və ya vergi planlaması barədə məlumatlı olması lazımdır.

Məsələn, eyni fəaliyyət çərçivəsində məhul istehsal edən iki müəssisədən biri, qanun tərəfindən vahid plan çərçivəsində verilən hüquqlardan istifadə edərək daha az vergi ödəyir, digər müəssisə isə heç bir plan olmadan qanuni hüquqlarından istifadə edə bilmədiyi üçün daha çox vergi ödəyir.

## Müəssisələrin vergi planlaşdırması

Vergi ödəyiciləri və vergi məsulları, müəyyən mənada, iqtisadi və maliyyə imkanları ilə ödəməli olduqları vergi arasındakı əlaqəni təyin edərkən ödəməli olduqları vergini minimuma endirməyə çalışırlar.

Müəssisə rəhbərləri vergi qanunlarında göstərilən fürsətlərdən bəhrələnmək, vergiyə cəlb olunan əməliyyatları həyata keçirməmək, azadolma daxilindəki müraciətlərdən faydalanmaq və vergi yaradan məsələlərə səbəb olmadan vergi yükünü azaltmağa çalışan vergi planlaşdırma hüququna sahibdirlər.

Vergi planlaşdırması, təşviqlər və vergi qanunları ilə təmin olunan üstünlüklərdən istifadə edərək ödənilməsi lazım olan vergi məbləğini azaltmaqdır. Buna nail olmaq üçün müəssisələrin ciddi bir vergi idarəçiliyi etməsi lazımdır və bu vəziyyət nəticəsində vergi planlaması meydana çıxır.

Müəssisələrin vergi planlaması etməsinə səbəb olan bir çox məqam var. Bunlardan bəziləri; vergi qanunvericiliyinin sadəliyi və anlaşıqlığı, vergi inzibatçılığı və vergi yoxlamasının səmərəliliyi, vergi cərimələrinin dayandırılması, mühasibat və məsləhət xidmətləri, dövlət idarəetməsinin səmərəliliyi, vergi etikası və məlumatlılığı və vergi amnistiyalarının olmaması.

Vergi məsələsinə müəssisələr baxımından nəzər yetirdikdə qeyd etmək lazımdır ki, vergi planlaşdırmasının məqsədi şirkətin maksimum dəyərini müəyyənləşdirməkdir. Vergi planlaşdırmasının mərkəzləşdirilməsi tələbdən asılı olaraq şirkətlərin idarəetmə strategiyasında və ümumi investisiyalarında qoyulmuş bütün hədəflərə cavab verməlidir.

Ən əlverişli həll yolu, fərqli seçimlər olduqda maksimum fayda təmin edən bir həlldir. Firmalar bunu nəzərə almalı, məntiqi qərarlar qəbul etməli və eyni zamanda vergi planlaşdırması üçün bütün firmaların inkişaf hədəfləri arasındakı davamlılığa diqqət yetirməlidirlər (M.Məcidov 2013: 127).

Bununla birlikdə, şirkət vergi planlaşdırma hədəfinə çatmaq üçün idarəetmə proqramına biganə qala bilməz. Beləliklə, şirkət vergi planlaşdırmasının mənasını başa düşməklə yanaşı, onu vergi planlamasının inkişafına kömək edən təsirli bir vasitə halına gətirə bilər.

Korporativ vergi strukturlaşdırılması üçün verginin düzgün hesablanması vacibdir:

✓İT şöbələrinə dəqiq məlumatları qiymətləndirməyə və açıqlamağa kömək edir.

✓Məhkəmə və vergi itkilərini azaldır.

✓Mövcud vergi qanunları və dəyişikliklər barədə məlumatsızlığı azaldır.

✓Gələcəkdə dəyişə biləcək daha yaxşı iş planlarını qiymətləndirməyə kömək edir.

Dövlət özəl müəssisələrin iqtisadi mühitdə sərbəst hərəkət etmələri üçün müxtəlif təşəbbüslərdən istifadə edir. Bu təşəbbüslər də dövlət tərəfindən qanunla təmin edilir.

Bununla birlikdə, 20% və ya daha az olan vergilər iqtisadi səmərəlilik, bərabərlik və ədalət üçün zərərli ola bilər. Buna görə dövlətə məxsus müəssisələrin qorunması prinsipindən qaçınmaq lazımdır. Bundan əlavə, məşğulluğun artırılması məqsədilə şirkət vergilərinin azaldılması vergitutmada ədalət prinsipinə zidd bir vəziyyət yaradacaqdır.

## Vergi qanunvericiliyinin sadəliyi

Vergilər dövlət xərclərinin həyata keçirilməsində ən vacib gəlir mənbəyidir. Yaxşı bir vergi sisteminin qurulması dövlətlər üçün vacib məsələlərdəndir. Bu baxımdan, müvəffəqiyyətli bir vergi praktikasını qurmaq üçün vergitutmada riayət edilməli olan qaydaları özündə cəmləşdirən vergi prinsipləri hazırlanmalıdır (Y.A.Kəlbiyev, R.B.Məhərrəmov, P.Q.Rzayev 2013: 321).

İdeal vergi sisteminin vacib prinsiplərindən biri olan sadəlik prinsipi dedikdə vergi qanunvericiliyinin hazırlanmasında və həyata keçirilməsində vergitutma tərəflərinin düzgün başa düşmələri, sadə olmaları və aşağı vergi xərclərinə sahib olmaları başa düşülür.

Digər bir vergi prinsipi, əminlik prinsipidir: Verginin dəqiq və aydın şəkildə ödənilməsini bilmək və vergi qanunları haqqında kifayət qədər izahat vermək deməkdir. Sadəlik prinsipinə uyğun hərəkət etməmək, başqa sözlə, vergi qanunvericiliyinin mürəkkəb, anlaşılması çətin və problemli olması bir sıra çıxılmaz hallara səbəb ola bilər:

✓Vergi tərəfləri üçün yüksək idarəetmə və uyğunluq xərcləri yarada bilər;

✓Vergidən yayınmaq üçün imkanlar təqdim edə bilər, vergi qanunlarının ədalətsiz olduğuna inam yarada bilər;

✓Qərarların alınmasını önləyərək müəssisələrin əhəmiyyətli itki etməsinə səbəb ola bilər;

✓Vergi idarəsinin şəxsi məxfiliyinin pozulmasına səbəb ola bilər.

Bu səbəbdən qanunlar ilk növbədə sadə olmalı və vergi sistemlərində davamlı dəyişiklik edilməməlidir.

Vergi qanunvericiliyinin mürəkkəb və qeyri-müəyyən quruluşu vergi ödəyicisi və rəhbərlik üçün müəyyən xərclərə səbəb ola bilər. Bu vəziyyət vergi qərarını da təsir etsə də, maliyyələşdirmə ehtiyacı, vergi tənzimləmələrində xəzinənin faydasını ön plana çəkərək verginin qanuniliyi prinsipinin zədələnməsinə səbəb ola bilər.

Vergi sisteminin mürəkkəbliyi, vergi ödəyicilərinə qanunların effektiv şəkildə tətbiq oluna bilməyəcəyi və pozuntuların izlənilməsi və aşkarlanması imkanlarının zəif olduğu təəssüratını verməklə və məhkəmə qərarlarının daha əlverişsiz olmasına səbəb olmaqla vergi uyğunluğuna təhrifedici təsir göstərə bilər.

Məlum olduğu kimi vergi planlaması, könüllü vergi uyğunluğu üçün bir vasitə olaraq istifadə edilərək vergi uyğunsuzluğuna yol verməyən bir iş sahəsidir. Bu mənada demək olar ki, vergi planlaşdırma strategiyaları vergiyə müqavimət göstərməməklə könüllü olaraq vergi ilə uyğunluğun təmin edilməsinə yönəldilmişdir (Y.A.Kəlbiyev, T.M.Hümbətov 2018: 28).

Nəticədə, ölkələrdə tətbiq olunan vergi qanunvericiliyi sadə, asan və başa düşülən bir quruluşdan uzaqdırsa və daim dəyişdirilərsə, yəni vergi sadəliyi prinsipi nəzərə alınmırsa, vergiyə uyğunluq get-gedə azalacaqdır. Vergi qanunvericiliyinin mürəkkəbliyi vergi ödəyicilərində bəzi problemlərə səbəb ola bilər.

Buna görə vergi ödəyicisinin vergi uyğunluğunu təmin etmək üçün vergi qanunvericiliyini sadələşdirərək qanunvericilikdəki qarışıqlığı azaltmaq vacibdir.

Vergi ödəyicilərinin qanuna uyğun hərəkət etmə qabiliyyəti, qanunların anlaşılan, tətbiq oluna bilən və açıqlığıyla sıx bağlıdır. Vergi sistemimizi nəzərə alsaq, davamlı qanun dəyişiklikləri hazırda qeyri-kafi və təsirsiz olan vergi qanunvericiliyini daha da mürəkkəbləşdirə bilər.

Yuxarıda göstərilən düzəlişlərə əlavə olaraq, Nazirlər Kabinetinin qərarları, əsasnamələr, bildirişlər və digər ikinci dərəcəli qanunvericilik aktları ilə tətbiq olunan müxtəlif qaydalar və təcrübələr nəticəsində vergi qanunvericiliyinin anlaşılması çətinləşir. Bu baxımdan uzunmüddətli vergi siyasətlərini planlaşdırmaq, strateji hədəfləri seçmək və siyasətlərin həyata keçirilməsi üçün tənzimləmələr etmək vacibdir.

## Vergi cərimələrindən yayınma

Vergi ödəyicilərinin və vergi işçilərinin vergi qanunlarında nəzərdə tutulmuş vəzifələrini yerinə yetirmələri səbəbindən dürüst vergi ödəyicilərinin hüquqlarını qorumaq və kifayət qədər dürüst davranmayanların cəzalandırılması üçün cinayət müddəaları qəbul edilmişdir.

Ədalətsizlik yaradan qanunsuz hərəkətlərə tətbiq olunan sanksiyalar kimi təyin olunan vergi cərimənin məqsədi vergi ödəyicilərinin vergi itkiləri və yayınmalarına müraciət etmələrinin qarşısını almaq və vergi yığımının ən az itki ilə həyata keçirilməsini təmin etməkdir (Y.A.Kəlbiyev, T.M.Hümbətov 2018: 11).

Bunun üçün vergi ödəyicilərinin vergi öhdəliklərini yerinə yetirməsi üçün qanunlara daxil olan vergi cinayətləri və cəzaları yaxşı müəyyənləşdirilməli və vergidən yayınma cəmiyyətə qarşı digər cinayətlər kimi qiymətləndirilməli və güzəştə getmədən tətbiq edilməlidir.

Güzəştə getmədən və effektiv şəkildə tətbiq olunan vergi cərimələri vergi ödəyicilərini düzgün bəyannamələr verməyə və qanuni məhdudiyyətlər daxilində vergi planlaşdırmasına yönəldəcəkdir.

Əks təqdirdə, vergi cərimələri eyni vəziyyətdə olan hər kəsə ədalətli və eyni dərəcədə tətbiq edilmirsə, cəza sanksiyaları təsirli və inandırıcı deyilsə, vergitutma ilə könüllü riayət edən müəssisələr, xərcə düşdüklərini düşünərək könüllü vergitutmadan imtina edə, beləliklə vergidən yayına bilərlər. Əsas etibarı ilə, vergi cərimələrinin mülayimliyi və effektiv tətbiqi vergi itkilərinin və yayınma hallarının azalmasına səbəb olacaqdır.

## Nəticə

Vergi planlaşdırması, vergi qanunvericiliyi ilə müəyyən edilmiş hədlərdə sahibkarlıq subyektlərinin vergilərə və uyğunlaşma proseslərinə qarşı cavablarını idarə edərək vergi yükünü minimuma endirmək məqsədi ilə vergi qənaətinin təmin edilməsidir. Vergi ödəyiciləri vergi qanunları ilə müəyyən edilmiş hüquqlardan istifadə nəticəsində az vergi ödəməklə vergini minimuma endirə bilərlər.

Vergi planlaşdırması, qanunla ziddiyyət təşkil etməyən tənzimləmələrdən faydalanma nəticəsində vergi ödəyicilərinə vergi yükünü azaltmaq üçün göstərilən səylər olaraq təyin olunur və şirkətlərin vergi vəziyyətlərinə dair qərar verəcəyi bir müddətə işarə edir.

Müəssisələr vergi planlaması nəticəsində əldə ediləcək mənbələrdən fəaliyyətlərində yenidən istifadə edə bilərlər. Bundan əlavə, vergi planlaması edərək digər müəssisələrə qarşı rəqabət üstünlüyü təmin edərək prestij yolunda irəlidə ola bilərlər. Bəzi müəssisələr qanunsuz metodlardan istifadə edərkən, bəziləri vergi planını tətbiq etməklə vergi yükünü azaltmağa çalışırlar.

Müəssisələrin öz ləyaqətlərinə və institusionalizmlərinə xələl gətirməmələri və heç bir cinayət hadisəsi ilə qarşılaşmamaları vacibdir. Bu baxımdan, müəssisələri vergi planlaşdırmasını həyata keçirməyə yönəldə biləcək tətbiqetmələr inkişaf etdirilməlidir.

Vergi qanunvericiliyi sadə və başa düşüləndir, vergi inzibatçılığı və effektiv vergi yoxlamasının effektiv quruluşu, vergi cərimələrinin çəkindirici xüsusiyyəti, mühasibat və məsləhət xidmətlərinin yayılması, dövlət idarəetməsinin effektivliyi, vergi etikası və məlumatlılığı müəssisələrə çatdırmaq və bunun qarşısını almaqdır.

## References

1. Kalbiyev YA, Humbatov TM, (2018) "Tax calculations", Baku, "Science and education", 325 pages.
2. Kalbiyev YA, Maharramov RB, Rzayev P.Q. (2013) "Tax system of foreign countries". Textbook. Baku, "University of Economics" Publishing House, 555 pages.
3. Majidov M. (2013) "Tax system", Baku, "Science", 269 pages.
4. Mammadov A. (2014) "Introduction to tax", Shamakhi, "Marif" 418 pages.
5. Skvortsov OV (2018) Execution of tax accounting and tax planning in the organization: textbook / Skvortsov O.V. -Moscow: KnoRus, -194 p.

**Rəyçi: prof. Y.Kəlbiyev**

Göndərilib: 14.04.2021 Qəbul edilib: 15.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/257-260

**Səbinə Rizvan qızı Abdullayeva**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
sebine_abdullayeva_2015.mail.ru

# İNKİŞAF ETMƏKDƏ OLAN ÖLKƏLƏRDƏ VERGİ YIĞIMININ EFFEKTİV QURULMASI

***Açar sözlər:*** *vergi, vergi yığımı, vergi auditi, qanunvericilik, cərimə, vergidən yayınma, vergi sistemi, dövlət siyasəti*

**Establishing the effective tax collection in the developing countries**
**Summary**

İn the contemporary condition one of the main the way which leads to the social and economical development is the correctly organized tax system. For this reason tax which is the main profit center for the government should be checked by the tax audit in order to provide budget for state. Specially during the last years modern organized and integrated world practice which brings new technology to the system is observed in the developing countries. Development of the economy is directly depend on the correct and timely collection of the tax payments. Lacks in the tax legislation, tax collection and tax audit which was indicated in the article are affecting to the economy of the developing countries. Government should give strong efford to eloborate the barriers and work attentively for this challenge.
***Key words:*** *tax, tax collection, tax audit, tax legislation, fine, tax sistem, government policy*

## Giriş

Bu məqalə bəzi ölkələrin vergi qanunlarına nə dərəcədə əməl etdiklərinin təcrübəsini şərh edir və xüsusi ilə də vergi yayınması yüksək dərəcədə olan ölkələrin vergi sistemini inkişaf etdirmək üçün ümumi qaydalar təklif edir. Vergi qanunvericiliyinin məqsədlərindən biri vergi ödənməsini vaxtında və tez bir şəkildə həyata keçirməkdir. Vergidən yayınma üçün cərimələr təyin etmək və ya vergi ödəyicisinin hüquq pozuntusu vergi qanunvericiliyinin meqsədlərinə aid deyil.

## Effektiv qurulan vergi qanunvericiliyi

Könüllü şəkildə vergi qanunvericiliyinə riayət etmək vergi ödəyiciləri arasında ruhlandırıla bilər.Əgər qanunvericilik vergiyə riayət etməməyin müəyyən olunması və düzgün şəkildə cərimələnməsi üçün effektiv yol tapsa könüllü vergiyə riayət etməni stimullaşdıra bilər. Effektiv qurulan vergi qanunvericiliyi səmərəli vergi qanunvericiliyi ilə qarışdırımamalıdır. (11.s, 26) Vergi yığımının xərci aşağı olduğu təqdirdə vergi idarə edilməsi effektiv hesab oluna bilir. Effektiv idarə etmənin məqsədi yalnız könüllü vergiyə əməl etmək dərəcəsi deyil, əsas faktor yüksək dərəcədə vergidən yayınmanın aradan qaldırılması və  müvafiq həll yolu tapılmasıdır.

## Dövlət və onun siyasətinə inam

Müxtəlif səbəblər vergidən yayınmaya gətirib çıxara bilər, onlardan biri də cəmiyyətin qurumların dövlət və onun iqtisadi siyasətinə nə dərəcədə dəstək olmağıdır. Deyə bilərik ki, vergi ödəyicilərinin dövlət və onun siyasətini qəbul etmə müstəqilliyinin verilməsi vergiya əməl etməyə gətirib çıxara bilər. Bəzi təcrübədə müşahidə etdiyimiz ölkələr var. Vergi ödəyicilərini vergi ödəməyə ruhlandıran amillərdən biri də onların dövlət və onun siyasətinə inanmağıdır. İnanmaq dedikdə sahibkar olan bir şəxs özünün müəssisəsində olan maliyyə çətinlikləri ilə bağlı dövlətdən dəstək ala biləcək, o təqdirdə ki, bu şəxs gələcəkdə gəlir əldə edə bilmə ehtimalını müvafiq hesablamalar və təxminlərlə sübüt edə biləcək. Bu halda əgər sahibkar gəlir əldə etməyə nail olsa, bu həm də dövlət üçün gəlirli olacaq, çünki həmin şəxs vergi ödəyərək dövlətin gəlirini artırmış olacaq. Bəzi aşağıda sadalanan təcrübədə olan misalları bu məqaləyə əlavə edə bilərik. (6.s, 22) 1970-ci illərdə Çilidə hərbi hökümətin az xalq dəstəyi olduğundan bu ölkədə həmin vaxt könüllü vergiyə əməl etmək aşağı səviyyədə idi. Lakin bunun əksi olaraq, Argentina ictimayyətə tam olaraq dəstək göstərsə belə 1980-1990-cı illərdə ən aşağı dərəcəli vergi qanunverciliyinə əməl etmə müşayət edilmişdir. Həmin vaxtlarda Boliviyada demokratik hökumətin dəyişməsi vergi idarə edilməsində inkişafa gətirib çıxarmışdı. Şübhəsiz ki, vergi idarə edilməsinin effektiv təşkili vergiyə əməl olunma ilə müəyyən olunmur. Burada makroiqtisadi dəyişikliklərə daxil olan faiz dərəcələri və inflasiyanı vergi yığımında olan mənfi təsirlər kimi misal göstərmək olar.

## Vergi idarə edilməsində çatışmazlıqlar

Qanunverciliyin və prosedurların sadəliyi vergi idare edilməsində vergi ödəyicilərinə göstərilən xidmətin keyfiyyəti vergi yığımı proseduruna təsir edir. İnkişaf etməkdə olan bir çox ölkələrdə yüksək dərəcəli vergidən yayınma halı olduqda vergi idarəsi effektiv şəkildə müvafiq cərimələr müəyyən edərək vergi ödəyicisinin hərəkətlərini formalaşdıra bilər. (5.s, 40) Neticə olaraq aşağıdakı çatışmazlıqlar aradan qaldırılarsa effektiv vergi idarə edilməsinə nail olmaq olar:

1. **Qeydiyyatdan keçməmiş vergi ödəyiciləri.** Birinci çatışmazlıq potensial vergi ödeyiciləri və qeydiyyatdan keçmiş vergi ödəyiciləri arasında fərq yaradır.
2. **Dayanan vergi ödəyicisi.** İkinci çatışmazlıq qeydiyyatdan keçmiş vergi ödəyiciləri və ödənilən məbləğ arasındakı fərqi əks etdirir.
3. **Vergidən yayınma.** Üçüncü çatışmazlıq vergi ödəyicisinin hesabladığı və potensial vergi məcəlləsinə uyğun hazırlanmış vergi məbləği.
4. **Vergi ödəyicisinin hüquq pozuntusu.** Dördüncü və ən son çatışmazlıq vergi ödəyicisinin borclu olduğu məbləğ və vergi orqanları tərəfindən hesablanıb müəyyən edilmiş ödənilən məbləğ.

Vergi yığımı prosesini inkişaf etdirmək üçün vergi orqanları effektiv hərəkət edib bu çatışmazlıqları aradan qaldırmalıdır. Yuxurıda sadalanan çatışmazlıqların hər birini aradan qaldırmaq üçün obyektiv məlumatlar seçilməlidir. Qeydiyyatdan keçməmiş vergi ödəyicisini müəyyən etməyin ilkin şərti kimi vergi ödəyicisinin vahid reyestri olması əsas şərtlərdən hesab olunur. Vergi ödəyicisinin vahid reyestri vergi ödəyicisinin eyniləşdirmə nömrəsi və bununla bağlı məlumatlardan ibarət olur. Vergi ödəyicisinin eyniləşdirmə nömrəsinə ad, soyad, kommersiya biznes adı, ünvan, biznes fəaliyyəti və vergi ödəyicisinin ödəyəcəyi verginin növü kimi məlumatlar daxildir.

İqtisadi baxımdan nəzar yetirsək, gəlirləri az olan ölkələrin Ümum Daxili Məhsulunda vergi gelirlərinin payı 10-20% təşkil etdiyi halda inkişaf etmiş ölkələrdə bu təxmini 40% təçkil edir. Bu inkişaf etməkdə olan ölkələrin fundamental xarakterlərindən yəni aşağı dərəcəli inkişaf etmiş bank sistemi və ya yayılmış olan qeyri-qanuni işçi və bazar münasibətindən qaynaqlana bilər. İnkişaf etmiş ölkələr gəlir yığımı zamanı xeyli məhdudiyyələr ilə rastlaşırlar. İnkişaf etməkdə olan ölkələri vergi yığımı zamanı geri qoyan səbəblərə iki əsas problemi qeyd etmək olar. (8.s, 31) Bunlar inkişaf etmiş informasiya və telekominikasiya sistemlərinə və avadanlıqlarına beynəlxalq səviyyəli qeydiyyatlarının olmaması və bu sahədə işləyə biləcək təcrübəli mütəxəsislərin çatışmazlığıdır. Misal olaraq inkişaf etməkdə olan ölkələrdən olan Uqanda dövlət gəlirlərinin yığılmasında yığım idarəetmə və toplanmış məlumat informasiya sistemində böyük çətinliklərlə üzləşir. Başqa bir problem kimi iqtisadiyyatın nağd pul sistemi ilə işləməsidir və bu da öz növbəsində əməliyyatların düzgün nəzarət edilməsində maneələr yaradır. Qabiliyyətli işcilərin olamağı inkişaf etməkdə olan ölkələrin onları düzgün şəkildə dəyərləndirə bilməsindən aslıdır. Əks təqdirdə beyin axını baş verir və ölkə qabilliyyətli təcrübəli işçilərin azlığı problemi ilə üz-üzə qalır.

## Vergi yığımında olan maneələr

Beynəlxalq şirkətlər və xarici investorların inkişaf etməkdə olan ölkələrdə fəaliyyəti vergi yığımı prosesinə təsir edən xarici siyasi faktor hesab olunur. Ölkələrdə yerli şirkətlərin yaxşı fəaliyyət göstərməməsi xarici şirkətlərlə işləmək üçün səbəb yaradır və bu da öz növbəsində vergidən gələn gəlirlərdə ciddi azalma ilə özünü biruzə verir. Vergi yığımında olan maneləri aşağıdakı kimi sadalaya bilərik:

1. **İkitərəfli vergi münasibətləri və dövlətin beynəlxalq şirkətlərə qarşı hüququnu itirməsi**
2. **Beynelxalq ticarətdə vergidən yayınma**
3. **Xarci investorlar üçün vergidən azad olamalar və vergi güzəştlərinin tətbiqi**

İkitərəfli vergi münasibətləri inkişaf etmiş ölkələrin gəlirlərinin azalmasına səbəb olan faktorlardan hesab olunur . Bəs ikitərəfli vergi münasibətləri nə demekdir və məqsəd nədir? Ölkələr beynelxalq şirkətlərlə ikitərəfli müqavilə imzalayırlar və bunun nəticəsində və bu şirkətlər həmin ölkələrin sərhədləri daxilində fəaliyyət göstərməyə başlayırlar. Bəs bunun inkişaf etmiş faydası nədir? Bu ölkələrin iqtisadiyyatları zəif olduğundan vergi gəlirlərində azalma olamasına baxmayaraq onlar bu sazişə daxil olurlar. (9.s, 12)

## Vergi auditində olan maneələr

Vergitutma proseduru inkişaf etmiş ölkələrdə inkişaf etməkdə olan ölkələrdə praktikada fərqli həyata keçirilir. Ona görə inkişaf etmiş ölkələrdə vergi araşdırması kontekstləşdirmə tələb edir. İki region arasında olan ən böyük fərqlərdən biri praktiki vergi auditidir. İnkişaf etmiş ölkələrdə vergi auditi ehtimalı vergidən yayınmadan çəkindirmə rolunu oynayır lakin bu inkişaf etmiş ölkələrdə belə deyil. Bu tədqiqatda müəyyən olunur ki inkişaf etməkdə olan ölkələrdə vergi audti üç ölçülü prosedurdan ibarətdir audit ehtimalı müəyyən etmə və sanksiya. Bu elmi tədqiqata görə bu sadalanan üç prosedur fərqlidir lakin ayrılmazdır və vergi auditi prosedurunun effektiv

həyata keçirilməsi üçün birlikdə işlənməlidir. Məsələn audit prosedurundan sonra aşkarlanma həyata keçirilməlidir. Əks halda bütün prosedur qeyri-effektiv olacaq. Vergi auditi nəticəsində hər hansı vergidən yayınma halı aşkarlandıqdan sonra müvafiq olaraq vergi qanunvericiliyinə uyğun şəkildə sanksiya tətbiq olunur. Sanksiya tətbiq olunmamış aşkarlanma bütün proseduru qeyri-effektiv göstərməyə səbəb olur. İnkişaf etməkdə olan ölkələrdə audit vergidən yayınma halı aşkarlanmadan həyata keçirilir ya da aşkarlanan halda sanksiya tətbiq olunmur. Çünki vergidən yayınanlar kompromisə girərək rüşvət və korrupsiya ilə bütün qurulmuş sistemi dağıdırlar. Vergi auditi sistemində iştirak edən vergi orqanları nümayəndələri dünyanın bir çox inkişaf etmiş ölkələrində yüksək təcrübə əldə etmiş bacarıqlı mütəxəsislərdir. Onlar mütamadi normal olaraq indivualların şirkətlərin və başqa vergi ödəyicilərinin vergi öhətliklərinə düzgün əməl etnələrini yoxlayan zaman maliyyə göstəricilərini əməliyatlarını və qeydlərini əsas götürürlər Lakin vergi orqanlarının nümayəndələri vergi auditi zamanı aşkar edilən tipik rüşvət və karrupsiya hallarının göstəricilərindən xəbərsiz ola bilərlər. Vergi orqanları nümayəndələri öz şübhələrinə əsasən aşkar etdiyi rüşvət və karrupsiya hallarına uyğun vergi qanunverciliyinə müraciət edirlər. Vergi orqanları nümayəndələri ölkənin vergi qanunvericiliyinə dövlət siyasətinə və prosedurlara yaxşı bələd olmalı və rüşvət və vergidən yayınma halları ilə üzləşdiyi zaman öz təcrübə və biliklərini yaxşı nümayiş etdirməyi bacarmalıdır. Rüşvət və karrupsiya hallarını gizlətmək üçün vergi ödəyiciləri eyni üsullardan istifadə edirlər onlardan biri də gəlirlərini gizlərmək. Vergi nümayəndələrinin sorğu zamanı istənilən araşdırma real olaraq vergi ödəyicisinin vergi öhtəliklərini düzgün müəyyən etməkdir. Şübhələrə əsasən toplanılan dəlillər nəticəsində cinayət işinin açılması vergi nümayəndələrinin yox hüquq mühafizə orqanlarının vəzifəsi hesab olunur. Rüşvət də daxil olmaqla karrupsiya əməliyyatları vergi auditi zamanı şirkətin və ya şəxsin maliyyə hesablarında aşkarlana bilər və ya başqa şübhələrə əsasən müəyyən oluna bilər. Çox zaman vergi orqanları nümayəndələri vergi auditi zamanı karrupsiya hallarının göstəricilərini vergi ödəyicisinin kitabda olan maliyyə hesabatlarına baxış zamanı müəyyən edirlər. Ümumi olaraq şirkətin maliyyə hesabatlarını yoxlamaq vergi orqanlarının nümayəndələri üçün əlavə olaraq iş hesab olunmur və normal fəaliyyətindən biridir. Maliyyə hesabatlarına əsasən yoxlanış zamanı vergi ödəyicisinin gəlirlərini müəyyən etmək və bu gəlirlərə əsasən gəlir vergisini, vergiyə cəlb olunan və olunmayan xərclərin dəqiqliyini yoxlamaq vergi auditi procedurunun mütamadi etdiyi fəaliyyətdir. Vergidən yayınma hallarını müəyyən etmək üçün vergi auditini həyata keçirən şəxslər eyni analitik bacarıqlardan treyninqlərdən istifadə etməli və nəticə olaraq öz mühakimələrinə əsasən vergidən yayınma halını müəyyən etməlidir. Vergi auditini həyata keçirən vergi orqanları nümayəndələrini və auditorları karrupsiya hallarının müəyyən olunmasında dəstək olamq üçün vergi idarələri 3 pilləyə əsaslanan riskə əsaslanan yanaşma qəbul edirlər. Bəhs etdiyimiz 3 pillə aşağıdakılardan ibarətdir

1. Zəka
2. Şüur
3. Təlim

Planlama audit nümayəndələri üçün vacib mərhələ hesab olunur və burada onlar dəqiq düzgün məlumatı haansı mənbədən əldə edə bilərlər deyə düşünürlər. Daxili audit və media hesabatları internet infarmasiya əldə olunmasında dəyərli mənbə hesab olunur. (10. s, 11) Bazar qiymətləri üçün faktlara əsasən yığılmış məlumatlar vergi ödəyicisinin pozisiyasini biznes normaları ilə müqayisə etməkdə yardımçı olardınız. Lazımlı və müvafik məlumatların yığılması üçün vergi auditini yoxlanış planında aşağıdakı meyarlar nəzərə alınmalıdır:

1. Əgər hansısa bir istinad gizlədilmiş korporativ məbləğə gətirib çıxarırsa bu zaman daxili audit hesabatları və ona uyğun sənədlər yenidən yoxlanışa götürülür.
2. Başqa tənzimləyici dövlət orqanları tərəfindən doldurulan hesabatların sürətiə baxış olmalıdır.
3. Xarici müəssisələr ilə fəaliyyət müqavilələr qiymət razılaşmaları transfer olunmuş məbləğin detalları nəzərə alınır.
4. Daxili və başqa açıq mənbələrə baxış olmalıdır.

## Nəticə və təkliflər

Müasir şəraitində sosial-iqtisadi inkişafa nail olmağın əsas yollarından biri də düzgün qurulmuş vergi sistemidir. Məhz buna görə də dövlətin əsas gəlir mənbəyi olan vergi düzgün şəkildə yığılmalı və vergi orqanları nümayəndələri tərəfindən audit olunmalıdır. Xüsusən də son dövrlərdə düzgün, müasir təşkil olunmuş, daha çox yeni texnologiya ilə birlikdə inkişaf etmiş ölkələrdən götürülmüş praktikaya əsaslanan vergi auditi vergi ödəyicilərinin və vergi orqanları nümayəndələrinin işini rahatlaşdırmışdır. Bunun başlıca səbəbi ölkənin qlobal iqtisadi sistemə inteqrasiyanın güclənməsi ilə bağlıdır. İqtisadiyyatın normal inkişafı vergi yığımı prosesinin düzgün və vaxtında həyata keçirilməsindən çox aslıdır. Məqalədə sadaladığımız vergi idaredilməsində, vergi yığımında, vergi auditində olan çatışmazlıqlar hamısı bir başa inkişaf etməkdə olan ölkələrin iqtisadi inkişafına bir başa təsir edir. Dövlət bu məqsədlə əlindən gələni edib hər bir çatışmazlıq üzərində diqqətlə çalışıb aradan qaldırmağa nail olmalıdır.

## References

1. Linnea Mills- Barriers to increasing the tax revenue in developing countries -2017
2. Richard Bird-8 İmproving Tax Complience-1992
3. Timothy Besley -Why do developing countries tax so little ? –2014
4. Niu Yongzhi (2010)- Tax audit impact on voluntary compliance
5. Nyakamba Daniel Mirera (2011)- The effects of tax audit on revenue collection-case of Kenya Revenue Authority
6. Jean Bosco Harelimana- The effects of tax audit on revenue collection in Rwanda
7. The dynamic effects of tax audits- William Elming
8. Tax evation and inquality (2017)- Gabriel Zucman
9. Progressive wealth taxation (2019)- Emmanuel Saez
10. Audit quality research report (2013)- Jimmy Bing
11. Audit reporting for going-concern uncertainty (2013)- Elizabeth Carson

**Rəyçi: dos. M.Həsənov**

Göndərilib: 16.04.2021 Qəbul edilib: 17.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/261-264

**Emin Teymur oğlu Məmmədov**
Bakı Dövlət Universiteti
magistrant
eminmmdv98@gmail.com

# İNFORMASİYA SİSTEMLƏRİNİN TƏNZİMLƏNMƏSİ ÜZRƏ TƏCRÜBƏ VƏ HÜQUQİ BAZANIN MÜQAYİSƏLİ TƏHLİLİ: MÖVCUD PROBLEMLƏR

***Açar sözlər:*** *informasiya sistemləri, informasiya sistemlərinin tənzimlənməsi, informasiya qanunvericiliyi, milli informasiya siyasəti, milli-hüquqi təcrübə*

## Comparative analysis of experience and legal basis on regulation of information systems: existing problems

**Summary**

Information systems are one of the objects of public relations regulated by information-legal norms. An information system is a regulated set of information technologies and documents. The existence of an appropriate legal framework for the regulation of information systems is important. After gaining independence, one of the main goals and objectives of the state was to form an appropriate legislative framework in this area. The formation and development of information systems is one of the important components of national information policy. This article examines information systems, national legal practice in regulating information systems, comparative analysis of the legal framework as part of national information policy and current issues.

***Key words:*** *information systems, regulation of information systems, information legislation, national information policy, national legal practice*

## Giriş

"İnformasiya, informasiyalaşdırma və informasiyanın mühafizəsi haqqında" Azərbaycan Respublikası Qanununun 2-ci maddəsinə müvafiq olaraq, informasiya sistemi – informasiya texnologiyaları və sənədlərinin təşkilati və texniki qaydada, o cümlədən hesablama texnikasından istifadə edilməklə, nizamlanmış məcmusudur. İnformasiya sistemi dedikdə, informasiyanın yaradılması, yığılması, işlənməsi, saxlanması, axtarışı, yayılması zamanı, hesablama və rabitə texnikasını tətbiq etməklə istifadə edilən üsul və vasitələr sistemləri ilə sənədlərin nizamlanmış məcmusu başa düşülür. İnformasiya sistemi informasiya texnologiyaları və sənədlərinin nizamlanmış məcmusudur. İnformasiya sistemi anlayışını formalaşdırmaq üçün bu nizamlanma təşkilati və texniki qaydada olmalı, eyni zamanda hesablama texnikası kimi ənənəvi sınanmış üsullarla yanaşı, digər müasir vasitələrdən istifadə edilməlidir. Kitabxanalar, arxivlər, məlumat bankları və s. özlüyündə ayrıca informasiya sistemləridir, təşkilati - texniki qaydada, müasir texnoloji vasitələrdən istifadə edilməklə informasiya daşıyıcılarının məcmusunu idarə edir. İnformasiya sistemləri qanunvericilikdə müəyyən olunmuş qaydada təşkil olunur, informasiya ehtiyatlarından səmərəli istifadə məqsədilə elmi-texniki və digər informasiya sistemləri, arxivlər, başqa müəssisələrlə birgə fəaliyyət proqramları və müqavilələr əsasında qarşılıqlı əlaqəyə malik olur. (3, s. 232)

İnformasiya sistemlərinin tənzimlənməsi üzrə hüquqi baza və milli təcrübənin öyrənilməsi üçün milli informasiya siyasətinin inkişaf dinamikasına nəzər yetirmək məqsədəuyğun olardı. Azərbaycan Respublikasında milli informasiya siyasətinin həyata keçirilməsində şərti olaraq üç dövr ayırmaq olar: 1) Müstəqillik əldə olunduqdan Azərbaycan Respublikasının inkişafı naminə informasiya və kommunikasiya texnologiyaları üzrə 2003-2012-ci illər üçün Milli Strategiyanın qəbuluna qədər olan dövr; 2) 2003-cü ildən 2014-cü ilə qədər, yəni Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün Milli Strategiyanın qəbuluna qədər olan dövr; 3) 2014-cü ildən bu günə qədər davam edən dövr.

Birinci dövrdə müstəqilliyin yenicə əldə olunduğu bir dönəm olduğu üçün respublika daxilində bütün sahələrdə olduğu kimi, informasiya sahəsində də boşluqlar mövcud idi. Belə bir şəraitdə insan hüquq və azadlıqlarının normal təminatından söhbət gedə bilməzdi. Ona görə də hər şeydən əvvəl, keçmiş SSRİ-nin qalıqlarının təmizlənməsinə xüsusi diqqət ayrılırdı. "Azərbaycan Respublikasında söz, fikir və məlumat azadlığının təmin edilməsi sahəsində əlavə tədbirlər haqqında" 6 avqust 1998-ci il Azərbaycan Respublikası Prezidentinin Fərmanı ilə dövlət orqanlarına bu sahədə tapşırıqların verilməsi, senzuranın ləğvi, müvafiq qanunvericilik aktlarının ("Məlumat azadlığı haqqında", "İnformasiya, informasiyalaşdırma və informasiyanın mühafizəsi haqqında" və s. Azərbaycan Respublikası Qanunlarının) qəbul edilməsi kimi tədbirlər ölkədə məlumat azadlığının təmin olunmasına istiqamətlənmişdi. Tədricən milli layihələr işlənib hazırlanmağa başlandı və bu

layihələrdə İKT-nin tətbiqinə geniş yer verilirdi. Demək olar ki, respublika ərazisini bütünlüklə əhatə edən mobil telefon şəbəkəsi formalaşdırıldı və rabitə kanallarının rəqəmsal rejimə keçirilməsinə dair layihələr işlənib hazırlandı. Lakin bütün bunlara baxmayaraq, respublikada cari vəziyyəti mənfi xarakterizə edən bir çox amillər hökm sürürdü: 1) ölkədə informasiya və kommunikasiya texnologiyalarından istifadə ilə bağlı aparılan işlərin istiqamətlərini və onların prioritetlərini təyin edən, görülən işlərin əlaqələndirilməsini təmin edən məqsədyönlü dövlət siyasətinin hələlik tam müəyyən edilməməsi; 2) informasiya və kommunikasiya texnologiyalarından istifadə ilə əlaqədar yaranan münasibətləri tənzimləyən hüquqi normativ bazanın tam işlənilməməsi; 3) bir tərəfdən ölkənin keçid iqtisadiyyatı dövrü yaşaması, digər tərəfdən isə Ermənistan Respublikası tərəfindən Azərbaycan Respublikası ərazisinin 20%-nin işğal olunması nəticəsində bir milyondan çox qaçqının və məcburi köçkünün mövcud olması ilə əlaqədar, informasiya və kommunikasiya texnologiyalarının tətbiqinə hökumətin yetərincə maliyyə vəsaitləri ayırmaq imkanlarının olmaması; 4) ölkənin keçid iqtisadiyyatı dövrü yaşaması ilə əlaqədar olaraq inkişaf etmiş ölkələrə "beyin axınının" mövcudluğu; 5) informasiya və kommunikasiya texnologiyalarının imkanları və üstünlükləri barədə geniş əhali kütlələrinin az məlumatlı olması; 6) informasiya və kommunikasiya texnologiyaları sahəsində yüksək səviyyəli mütəxəssislərin çatışmazlığı; 7) ölkə miqyasında kompüterləşdirmənin səviyyəsinin aşağı olması; 8) təhsilin bütün səviyyələrində informasiya və kommunikasiya texnologiyaları ilə əlaqədar olan fənlərin tədrisinin müasir dövrün tələblərinə cavab verməməsi; 9) informasiya və kommunikasiya texnologiyalarının inkişaf səviyyəsinə görə şəhər və rayonlar arasında kəskin fərqin olması; 10) Azərbaycan dilinin informasiya və kommunikasiya texnologiyaları sahəsində geniş istifadə olunmasında ciddi problemlərin olması; 11) İKT sahəsində Azərbaycan dilində ədəbiyyatın azlığı; 12) ümummilli informasiya resurslarının formalaşması prosesinin həddən artıq ləng getməsi; 13) Respublikanın informasiya və kommunikasiya texnologiyaları sahəsində bir çox beynəlxalq inteqrasiya yönümlü layihələrdə fəal iştirak etməməsi; 14) Respublikada qüvvədə olan telekommunikasiya tariflərinin informasiya və kommunikasiya texnologiyalarının tətbiqinə maneələr yaratması; 15) telekommunikasiya sahəsində innovasiyaların tətbiqini ləngidən və azad rəqabətə mane olan dövlət inhisarının mövcudluğu. (1)

Sadalanan bütün bu problemlərin aradan qaldırılması məqsədilə 2003-2012-ci illər üzrə Milli Strategiyanın Azərbaycan Respublikasının Prezidenti tərəfindən təsdiq olunması əsas etibarilə, ikinci mərhələnin başlanğıcı oldu. Bununla da, ölkə daxilində milli informasiya siyasətinin əsas istiqamətləri sürətlə icra olunmağa başlandı. Bu Strategiyada əks olunan məqsəd və vəzifələr, habelə prioritet istiqamətlər "Azərbaycan Respublikasında rabitə və informasiya texnologiyalarının inkişafı üzrə 2005-2008-ci illər üçün Dövlət Proqramı (Elektron Azərbaycan)" və "Azərbaycan Respublikasında rabitə və informasiya texnologiyalarının inkişafı üzrə 2010-2012-ci illər üçün Dövlət Proqramı"nda (Elektron Azərbaycan) nəzərdə tutulmuş tədbirlərlə ardıcıl şəkildə həyat keçirildi. Üçüncü mərhələdə artıq formalaşmış informasiya cəmiyyətinin daha da inkişaf etdirilməsi və müasir vətəndaşın cəmiyyətin aktiv üzvünə çevrilməsi müşahidə olunur. 2014-2020-ci illər üçün Milli Strategiya və onun icrası üçün qəbul edilmiş "Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair Milli Strategiyanın həyata keçirilməsi üzrə 2016–2020-ci illər üçün Dövlət Proqramı" mərhələlərlə icra olunmaqda davam edir.

Milli Strategiyaların informasiya sahəsində qanunlarla müqayisəsinə əsasən, belə bir nəticəyə gəlmək olar ki, Strategiyalarda müəyyən edilən fəaliyyət istiqamətləri "İnformasiya, informasiyalaşdırma və informasiyanın mühafizəsi haqqında" Azərbaycan Respublikası Qanununun 3-cü maddəsində nəzərdə tutulan dövlət siyasətinin əsas istiqamətləri ilə uzlaşır. Bu istiqamətlərdən bir neçəsinə ayrı-ayrılıqda nəzər yetirmək məqsədəmüvafiqdir.

*Milli informasiya fəzasının və milli informasiya ehtiyatlarının formalaşdırılması.* Milli informasiya fəzası (məkanı) dedikdə, informasiya ehtiyatlarının, informasiya sistemlərinin və informasiya texnologiyalarının, habelə bütövlükdə informasiya infrastrukturunun məcmusu başa düşülür. Mülkiyyət və ya məkan xüsusiyyətlərinə görə dövlət orqanlarının informasiya sistemləri (onların mülkiyyətində olan informasiya ehtiyatları, proqram-texniki, şəbəkə və idarəetmə vasitələri, informasiya xidmətləri və s.), özəl müəssisələrin informasiya sistemləri, ictimai təşkilatların informasiya sistemləri, ayrı-ayrı şəxslərin informasiya ehtiyatları və s. fərqləndirilir. Təyinat sahəsi xüsusiyyətlərinə görə milli informasiya məkanında: elm, təhsil və mədəniyyət; maliyyə və iqtisadiyyat; səhiyyə və ekologiya; rabitə və nəqliyyat; sənaye, tikinti və aqrar təsərrüfat; hüquq-mühafizə, hərbi və s. tərkib elementləri ayrılır. Zaman xüsusiyyətlərinə görə aktual və arxiv informasiya sistemləri olur. Daxil olma növünə, mühafizə və ya hüquqi rejiminə görə milli informasiya məkanında açıq və qapalı informasiya sistemləri fərqlənir. (2, s. 71-72)

2003-2012-ci illər üçün Milli Strategiyada milli informasiya ehtiyatları istiqaməti üzrə nəzərdə tutulan bütün tədbirlər milli informasiya məkanının formalaşdırılması məqsədilə müəyyən olunmuşdur: 1) vahid milli elektron informasiya məkanının formalaşdırılması; 2) elektron informasiya məkanında Azərbaycan dilinin geniş istifadəsinin təmin olunması; 3) milli tarixi, ədəbi və mədəni irsin qorunub saxlanması və təbliğində, o cümlədən kitabxana, muzey və arxiv işlərində informasiya və kommunikasiya texnologiyalarının geniş tətbiq olunması; 4) milli azlıqların mədəni inkişafına xidmət edən informasiya resurslarının formalaşdırılmasına şərait yaradılması; 5) milli informasiya resurslarının beynəlxalq aləmə çatdırılması üçün onların ümumdünya elektron informasiya

məkanına inteqrasiyası; 6) Azərbaycan diasporuna elektron informasiya dəstəyinin təmin olunması; 7) internetin Azərbaycan seqmentinin genişləndirilməsi, milli axtarış saytlarının inkişaf etdirilməsi; 8) Azərbaycan dilli proqram təminatının yaradılması və inkişaf etdirilməsi.

*Dövlət hakimiyyəti və yerli özünüidarə orqanlarının, təşkilati-hüquqi və mülkiyyət formasından asılı olmayaraq bütün müəssisə, idarə və təşkilatların, vətəndaşların hüquqlarının təmin olunması, habelə onların müvafiq informasiya ilə təmin olunması üçün şərait yaradılması.* İnformasiya və kommunikasiya texnologiyalarının tətbiqi ilə təhsilin təkmilləşdirilməsi, İKT sahəsində milli kadrların hazırlanması və ölkədə minimal İKT savadlılığının təmin olunması, informasiya və kommunikasiya texnologiyalarından istifadə etməklə sosial yönümlü sahələrin inkişaf etdirilməsi, elektron hökumətin formalaşdırılması və inkişaf etdirilməsi kimi istiqamətlər informasiya cəmiyyətinin qurulduğu ilkin dövrlərdə cəmiyyət üzvlərinin aktivliyini artırmaq məqsədi daşıyırdı (2003-2012-ci illər üçün Milli Strategiya). Sonradan 2014-2020-ci illər üçün Milli Strategiyada öz əksini tapmış e-təhsil, e-səhiyyə, e-vətəndaş istiqamətləri bilavasitə insanların müxtəlif sahələr üzrə hüquqlarının təminatına yönəlmişdir.

*İnformasiya iqtisadiyyatının inkişaf etdirilməsi.* İnformasiya sahəsində dövlət siyasətinin istiqamətləri sırasında informasiya ehtiyatları, sistemləri, texnologiyaları və onların təminat vasitələri üzərində mülkiyyətin bütün formalarının inkişafına, informasiya məhsulları və xidmətləri bazarının formalaşmasına yardım edilməsi, informasiya məhsulları və xidmətləri bazarında informasiya münasibətlərinin subyektləri, o cümlədən xarici subyektlər tərəfindən inhisar fəaliyyəti və haqsız rəqabətin qarşısının alınması və yol verilməməsi xüsusi mövqeyə malikdir çünki yalnız azad bazar rəqabətinin olduğu bir şəraitdə informasiya sahəsinin inkişaf etdirilməsi real ola bilər. Ona görə də 2003-2012-ci illər üçün Milli Strategiya elektron iqtisadiyyat istiqaməti üzrə elektron ticarətin həyata keçirilməsi, elektron ödənişlərin geniş miqyasda istifadəsi üçün əlverişli şəraitin yaradılması, informasiya xidmətləri sahəsinin inkişaf etdirilməsi üçün əlverişli mühitin yaradılması, informasiya və kommunikasiya texnologiyalarının iqtisadiyyatın dövlət və özəl sektorlarında geniş tətbiq olunmasının stimullaşdırılması və biliklərə əsaslanan iqtisadiyyata keçid üçün şəraitin yaradılması tədbirlərinin icrasını zərurət kimi müəyyənləşdirir.

*İnformasiya sahəsində dövlət siyasətində elmi inkişafa üstünlük verilməsi.* İnformasiyalaşdırma mühitində elmi-texniki və istehsal siyasətinin formalaşdırılması və həyata keçirilməsi, habelə informasiyalaşdırma layihələri və proqramlarının dəstəklənməsi, onların işlənməsi və həyata keçirilməsi üçün investisiyaların cəlb olunması sisteminin və stimullaşdırma mexanizminin yaradılması istiqamətləri müvafiq qanunun 3-cü maddəsində əks olunmuşdur. Bunun əsasında Strategiyalarda elmi-texniki və istehsalat potensialının yüksəldilməsinə, yüksək texnologiyalar üzrə elmi-texniki potensialın gücləndirilməsinə, o cümlədən kadr hazırlığına yönəlmiş fəaliyyət istiqamətləri üzrə tədbirlər planlaşdırılmışdır. Müasir dünyada rəqabətə tab gətirmək üçün, ilk növbədə, təhsilə, zəngin biliklərə, informasiya texnologiyalarına arxalanmaq lazımdır. Elmtutumlu informasiyanın yaradılması, əldə edilməsi, istehsal prosesinə praktik tətbiqi təkcə sosial-iqtisadi inkişafın deyil, həm də qlobal rəqabətin mühüm şərtidir. İnformasiya cəmiyyətinin əsas kapitalı bilik, informasiya və bu informasiyanın daşıyıcısı olan şəxs olub, yeni keyfiyyətli biliyə əsaslanan iqtisadiyyatın yaranmasını, mükəmməl innovasiya siyasətinin həyata keçirilməsini tələb edir. (5, s. 129-130)

İnnovasiya infrastrukturunu təşkil edən əsas elementlərdən biri İKT-profilli texnoparklardır. "Azərbaycan Respublikasında 2009-2015-ci illərdə Elmin inkişafı üzrə Milli Strategiya"da innovasiya fəaliyyəti infrastrukturunun inkişaf etdirilməsi, o cümlədən texnoparklar, texnoloji mərkəzlər, biznes inkubatorları şəbəkəsinin genişləndirilməsi bir vəzifə kimi qarşıya qoyulmuşdur. Texnoparkların əsas məqsədləri: innovativ məhsulların kommersiyalaşdırması; müvafiq sferada iqtisadi artımın stimullaşdırılması; elmi-texniki potensialdan istifadə intensivliyinin artırılması; regionun sosial-iqtisadi fəaliyyətinin səmərəliliyinin artırılması və s. (4, s. 71-72)

Bundan başqa, Elmin inkişafı üzrə Milli Strategiyada deyilir ki, Azərbaycan Respublikasında elmin informasiya təminatının inkişaf etdirilməsi üçün ölkə kitabxanalarının elmin müxtəlif sahələrinə aid ədəbiyyatla təmin olunmasının yaxşılaşdırılması, informasiya mübadiləsi üçün qabaqcıl telekommunikasiya infrastrukturunun yaradılması, müasir informasiya texnologiyalarından, elektron jurnallardan, telekonfranslardan və s.-dən istifadənin inkişaf etdirilməsi, elmin müxtəlif sahələrində kompüter vasitəsilə sınaqların aparılması, fənlərarası yanaşma çərçivəsində elmi modellərdən və göstəricilərdən ibarət Milli İnformasiya Bankının təşkili, elmin təşkilini, idarə olunmasını və alınmış elmi nəticələrin tətbiqini gücləndirmək məqsədi ilə "elektron elm" modelinin hazırlanması və yeni informasiya texnologiyalarının tətbiqinə diqqət yetirilməlidir.

Bu istiqamətlərin həyata keçirilməsi sahəsində müxtəlif hüquqi, texniki və təşkilati tədbirlər müəyyənləşdirilmiş və hal-hazırda da icra olunmaqda davam edir. Məsələn, "Azərbaycan Respublikasında kitabxana-informasiya sahəsinin 2008-2013-cü illərdə inkişafı üzrə Dövlət Proqramı" yuxarıda sadalanan bir neçə istiqamətin həyata keçirilməsi məqsədilə təsdiq edilmişdir.

Müasir dövrdə informasiya mədəniyyətinin aşağı səviyyədə olması informasiya sahəsində hüquqların realizəsində ən böyük maneələrdən biridir. Ona görə də İKT sahəsinin inkişaf hədəfləri nəzərə alınmaqla, sektorun tələbatına uyğun təhsilin müxtəlif səviyyələri üzrə yüksək ixtisaslı kadrların hazırlanması milli informasiya siyasətinin əsas istiqamətləri sırasında xüsusi çəkiyə malikdir.

## Nəticə

Milli informasiya məkanının formalaşdırılması istiqamətləri ayrı-ayrılıqda milli-mədəni irsin qorunub saxlanmasını əhatə edir. Lakin mədəni dəyərlərin bəşəriyyət üçün son dərəcə vacib olduğunu nəzərə alaraq, informasiya sahəsində milli informasiya siyasətinin ayrıca bir istiqaməti kimi milli kontentin inkişaf etdirilməsinə xüsusi önəm verilməlidir. Bu istiqamət eyni zamanda, Azərbaycan xalqının dünyada tanınmasına xidmət edir. Məsələn, 2014-2020-ci illər üçün Milli Strategiyada nəzərdə tutulan bəzi tədbirlər - Azərbaycan tarixi, vətənpərvərlik mövzuları, ədəbi və mədəni irs üzrə internet resurslarının (rəqəmli arxivlərin) yaradılması və inkişaf etdirilməsi, milli-mədəni nailiyyətlərə, yerli xalqların və milli azlıqların adət-ənənələrinə həsr olunmuş elektron resursların formalaşdırılması və s. milli-mədəni irsin qorunub saxlanmasında əvəzsiz rola malikdir.

## References

1. “National Strategy on Information and Communication Technologies for the Development of the Republic of Azerbaijan (2003-2012)” approved by the Order of the President of the Republic of Azerbaijan No. 1146 dated February 17, 2003 http://www.e-qanun.az / framework / 1969
2. Aliyev E.A. Architecture and segmentation model of the national information space. // Problems of information society, 2014, №2, p. 71-72.
3. Aliyev A.I., Rzayeva G.A., Ibrahimova A.N., Maharramov B.A., Mammadrzali Sh.S. Information Law: Textbook. Baku, 2019, 447 p.
4. Aliyev A.G., Shahverdiyeva R.O. Issues of comprehensive assessment of the effectiveness of ICT-technoparks. // Problems of information society, 2011, №2, p. 71-72.
5. Hüseynova İ. The end of the transition period in the economic sphere makes it necessary to develop Azerbaijan on a scientific basis. // Strategic analysis, Azerbaijan's domestic and foreign policy, analytical journal on international relations, 2011, № 1 (2), p. 129-130.

**Rəyçi: h.f.d A.İbrahimova**

Göndərilib: 15.04.2021 Qəbul edilib: 16.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/265-267

**Seymur Firdovsi Huseynov**
Baku State University
master
seymurhuseynov7@gmail.com

# THE ENVIRONMENT OF ELECTRONIC COMMERCE LEGAL AND TAX ISSUES

## Summary

The growth of e-commerce in world trade has been so rapid that the legal systems of states and societies have been unprepared for the challenges that have arisen. These problems were not only related to the protection of consumer rights in the electronic environment, but also other legal, ethical and taxing issues. This article analyzes the legal and taxing problems posed by e-commerce, the conditions under which they arise, and the legislative techniques provided for in EU legislation in relation to the solution of these problems.
***Key words:*** *e-commerce, taxation problems, legal problems, European value added tax*

## Introduction

Businesses that operate on the Web must comply with the same laws and regulations that govern the operations of all businesses. If they do not, they face the same penalties—including fines, reparation payments, court-imposed dissolution, and even jail time for officers and owners — that any business faces. Businesses operating on the Web face two additional complicating factors as they try to comply with the law. First, the Web extends a company's reach beyond traditional boundaries. Second, the Web increases the speed and efficiency of business communications (1, p.25). Companies that do business on the Web expose themselves, often unwittingly, to liabilities that arise from today's business environment. That environment includes laws and ethical considerations that may be different from those with which the business is familiar. In this article, we will analyze the issues of borders, legal and ethical issues that arise when the Web is used in the commission of crimes, terrorist acts, and even the conduct of war, jurisdiction, and Web site content and how these factors affect a company's ability to conduct electronic commerce.

**Borders and Jurisdiction.** Territorial borders in the physical world serve a useful purpose in traditional commerce: They mark the range of culture and reach of applicable laws very clearly. Legal rules, languages, currency, and cultural customs differ from one country to another. In the physical world, geographic boundaries almost always coincide with legal and cultural boundaries. The limits of what constitutes acceptable behavior and the laws that are adopted in a geographic area are both influenced by that area's dominant culture (2, p.34). The geographic boundaries on culture are logical; for most of our history, slow methods of transportation and conflicts among various nations have prevented people from traveling great distances to learn about other cultures. Both restrictions have changed in recent years, however, and now people can travel easily from one country to another within many geographic regions. One example is the European Union (EU), which allows free movement within the EU for citizens of member countries (3, p.27). Most of the EU countries (Great Britain being a notable exception) now use a common currency (the euro) instead of their former individual currencies.

**Copyright Issues.** A copyright is a right granted by a government to the author or creator of a literary or artistic work. The right is for the specific length of time provided in the copyright law and gives the author or creator the sole and exclusive right to print, publish, or sell the work (4, p.43). Creations that can be copyrighted include virtually all forms of artistic or intellectual expression—books, music, artworks, recordings (audio and video), architectural drawings, choreographic works, product packaging, and computer software. In the United States, works created after 1977 are protected for the life of the author plus 70 years. Works copyrighted by corporations or not-for-profit organizations are protected for 95 years from the date of publication or 120 years from the date of creation, whichever is earlier (8, p.34). The idea contained in an expression cannot be copyrighted. Only the particular form in which an idea is expressed creates a work that can be copyrighted. If an idea cannot be separated from its expression in a work, that work cannot be copyrighted. For example, mathematical calculations cannot be copyrighted. A collection of facts can be copyrighted, but only if the collection is arranged, coordinated, or selected in a way that causes the resulting work to rise to the level of an original work (9, p.97). For example, the Yahoo! Web Directory is a collection of links to URLs. These facts existed before Yahoo! selected and arranged them into the form of its directory. However, most copyright lawyers would argue that the selection and arrangement of the links into categories probably makes the directory a copyrightable expression of the facts. The common practice of copying files from music CDs and placing those files on a portable music device, a smartphone, or a computer raises some interesting legal issues (5, p.67). This

type of copying is governed in the United States by the fair-use provisions of the copyright laws, which you learned about earlier in this chapter. The fair-use provisions as they relate to copying music tracks are, at best, unclear and difficult to interpret. Some lawyers would argue that a person has the right under the fair-use provisions to make a backup copy of a music CD track, but other lawyers would disagree (6, p.124). A person who makes one copy for a portable music device, a second copy for a computer, and a third copy on a CD for backup purposes would be less likely to be protected under the fair-use provisions, but some lawyers would argue that all three uses should be protected. Music that is purchased in digital form (as MP3 files, or through the Apple iTunes Store, for example) is often sold with specific restrictions on copying and sharing (7, p.13). Be sure to read and understand the terms under which you have purchased any digital music product before making copies, even for your own use.

**Patent Issues.** A patent is an exclusive right granted by the government to an individual to make, use, and sell an invention. In the United States, patents on inventions protect the inventor's rights for 20 years (11, p.143). An inventor can decide to patent the design of an invention instead of the invention itself, in which case the patent protects the design for 14 years. To be patentable, an invention must be genuine, novel, useful, and not obvious given the current state of technology. In the early 1980s, companies began obtaining patents on software programs that met the terms of the U.S. patent law. However, most firms that develop software to use in Web sites and for related transaction processing have not found the patent law to be very useful. The process of obtaining a patent is expensive and can take several years. Most developers of Web-related software believe that the technology in the software could become obsolete before the patent protecttion is secured, so they rely on copyright protection. One type of patent has been of special interest to companies that do business online. A U.S. Court of Appeals ruled in 1998 that patents could be granted on "methods of doing business." The business process patent, which protects a specific set of procedures for conducting a particular business activity, is quite controversial (13, p.57). In addition to the Amazon. com patent on its 1-Click purchasing method (which you read about in Chapter 4), other Web businesses have obtained business process patents. The Priceline.com "name your own price" price-tendering system, About.com's approach to aggregating information from many different Web sites, and Cybergold's method of paying people to view its Web site have each received business process patents.

**Trademark Issues.** A trademark is a distinctive mark, device, motto, or implement that a company affixes to the goods it produces for identification purposes. A service mark is similar to a trademark, but it is used to identify services provided. In the United States, trademarks and service marks can be registered with state governments, the federal government, or both (12, p.98). The name (or a part of that name) that a business uses to identify itself is called a trade name. Trade names are not protected by trademark laws unless the business name is the same as the product (or service) name. They are protected, however, under common law. Common law is the part of British and U.S. law established by the history of court decisions that has accumulated over many years. The other main part of British and U.S. law, called statutory law, arises when elected legislative bodies pass laws, which are also called statutes (10, p.87). The owners of registered trademarks have often invested a considerable amount of money in the development and promotion of their trademarks. Web site designers must be very careful not to use any trademarked name, logo, or other identifying mark without the express permission of the trademark owner. For example, a company Web site that includes a photograph of its president who happens to be holding a can of Pepsi could be held liable for infringing on Pepsi's trademark rights. Pepsi can argue that the appearance of its trademarked product on the Web site implies an endorsement of the president or the company by Pepsi.

**Import Tariffs**. All countries in the world regulate the import and export of goods across their borders. In many cases, goods can only be imported into a country if a tariff is paid. A tariff, also called a customs duty or duty, is a tax levied on products as they enter the country (1, p.56). Countries have many reasons for imposing tariffs, and a complete discussion of tariffs and the role they play in international economics and foreign trade policy is beyond the scope of this book. Goods that are ordered online are subject to tariffs when they cross international borders. Even products that are delivered online (such as downloaded software) can be subject to tariffs (9, p.234). Many online shoppers have been surprised when an item they ordered from another country arrives with a bill from their government for the tariff.

**European Union Value Added Taxes.** The United States raises most of its revenue through income taxes. Other countries, especially those in the EU, use transaction taxes to generate most of their revenues. The Value Added Tax (VAT) is the most common transaction tax used in these countries. A VAT is assessed on the amount of value added at each stage of production. A product that goes through five different companies on its way to the ultimate consumer would have VAT assessed on each of the five sales. In most countries, VAT is calculated at the time of each intermediate sale and remitted to the country in which that sale occurs. The EU enacted legislation concerning the application of VAT to sales of digital goods that became effective in 2003 (8, p.99). Companies based in EU countries must collect VAT on digital goods, no matter where in the EU the products are sold. This

legislation has attracted the attention of companies based outside the EU that sell digital goods to consumers based in one or more EU countries. Under the law, non-EU companies that sell into the EU must now register with EU tax authorities and levy, collect, and remit VAT if their sales include digital goods delivered into the EU (7, p.43). In 2015, new VAT rules became effective that require non-EU sellers to collect VAT at the rate levied in the buyer's country. There are currently 28 countries in the EU and most of them have different VAT rates, ranging from 17 percent (Luxembourg) to 27 percent (Hungary). Also, just as with U.S. sales taxes, many EU countries have multiple classifications of goods (such as food, medicine, and books) subject to the VAT at different rates (4, p.67). These multiple rates and categories can create an administrative nightmare for non-EU firms wishing to do business in the EU. EU-based firms, however, have the right to sell to customers anywhere in the EU and charge only the VAT rates applicable in the seller's country. This has prompted many non-EU firms to sell their digital goods to an EU distributor who then resells the products to EU customers.

## Conclusion

To many people, the term "electronic commerce" means shopping on the part of the Internet called the World Wide Web (the Web). However, electronic commerce (or e-commerce) also includes many other activities, such as businesses trading with other businesses and internal processes that companies use to support their buying, selling, hiring, planning, and other activities. Some people use the term electronic business (or e-business) when they are talking about electronic commerce in this broader sense. For example, IBM defines electronic business as "the transformation of key business processes through the use of Internet technologies." Most people use the terms "electronic commerce" and "electronic business" interchangeably.

In this article, the term electronic commerce (or e-commerce) is used in its broadest sense and includes all business activities that use Internet technologies. Internet technologies include the Internet, the World Wide Web, and other technologies such as wireless transmissions on mobile telephone networks. Companies that operate only online are sometimes called dot-com or pure dot-com businesses to distinguish them from companies that operate in physical locations (solely or together with online operations); however, online business activity has become so integrated with everyday life in much of the world that few people worry about these distinctions any longer.

E-commerce seems to be everywhere these days. You can't go online without seeing article after article proclaiming that e-commerce is destroying brick-and-mortar stores. It can be difficult to decipher accurate information from manipulated data being spewed by alarmists on the internet. However, there is some truth to these overly apocalyptic statements. Studies predict that 65% of internet users will be digital buyers by the end of 2021. Not farfetched given how the data has been trending in recent years.

## References

1. Alan Davidson, The law of Electronic Commerce, Cambridge University press, 2009 (T3)
2. Christopher T. Marsden, Internet Co Regulation: European law, regulatory governance and legitimacy in cyberspace, 2011. (i10)
3. Kenneth C. Laudon, Carol Guercio Traver, E-commerce, Pearson 3rd edition, 2017, (e5)
4. Iris Benohr, EU Consumer law and human rights, Oxford University press, 2013 (E32)
5. Andrej Savin, EU Internet Law, Elgar European Law, 2013 (E34)
6. Gary P. Schneider, Electronic Commerce, Course Technology ninth edition, 2010 (E16)
7. Sanjay Mohapatra, E-Commerce Strategy: Text and Cases, Springer, 2013 (E12)
8. Dimitrios Tsolis, Lambros Drossos, Spyros Sioutas, Theodore Papatheodorou University of Patras, Greece Digital rights management for e-commerce systems, Information science reference, 2009 (D1)
9. Stefania Bariatti, Cases and Materials on EU Private International Law, Hart Publishing, 2011 (C1)
10. Elena Anatolyevna Kirillova, The Principles of the Consumer Right Protection in Electronic Trade A Comparative Law Analysis, International Journal of Economics and Financial Issues, Vol 6, 2016.
11. M.M.Lehamann, Electronic Commerce and Consumer Protection in Europe, Santa Clara High Technology Law Journal, Vol 17, 2001.
12. Irina von Wiese, European Union: EU adopts directive on e-commerce, International Financial Law Review: London Vol. 19, Iss. 7, 2000.
13. Anja Rösnera, Justus Haucapa, Ulrich Heimeshoff., Consumer protection in digital ages: Causal Evidence From the European Union, Düsseldorf Institute for Competition Economics (DICE), 2019

**Rəyçi: h.f.d N.Fərziyeva**

Göndərilib: 12.04.2021 Qəbul edilib: 13.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/268-271

**Aysel Qurban qızı Süleymanova**
Bakı Dövlət Universiteti
magistrant
Ayselsuleyman7@yahoo.com

# SƏHLƏNKARLIQ CİNAYƏTİNİN AZƏRBAYCAN RESPUBLİKASI QANUNVERİCİLİYİNDƏ TƏSBİTİ VƏ ÖZÜNƏMƏXSUS XÜSUSİYYƏTLƏRİ

**Summary**

The article describes how the crime of negligence is defined in our modern legislation and what its disposition is. Thus, as one of the crimes committed by officials, the act of negligence is independently established in Article 314. However, in the history of our legislation, there are differences in the legal definition of this act. The article clarifies what these differences are.

***Key words:*** *negligence, official, dishonest and careless approach, indifference*

## Giriş

Hər bir dövlətdə istər onun rəsmi qurumları, istərsə də digər təşkilat və müəssisələrdə müəyyən səlahiyyətlərə malik olan şəxslərin fəaliyyətinin düzgün formalaşdırılması və vəzifə öhdəliklərinin qanunauyğun həyata keçirilməsinin böyük əhəmiyyəti vardır. Məhz buna görədir ki, Azərbaycan Respublikası Cinayət Məcəlləsində dövlət orqanları və digər qurumların normal fəaliyyəti, buradakı vəzifəli şəxslərin fəaliyyəti ilə bağlı münasibətlərin tənzimlənməsinə xüsusi bölmə və fəsillər ayrılmışdır.

Səhlənkarlıq cinayəti Azərbaycan Respublikası Cinayət Məcəlləsinin “Dövlət Hakimiyyəti Əleyhinə Olan Cinayətlər” bölməsinin, “Korrupsiya Cinayətləri Və Qulluq Mənafeyi Əleyhinə Olan Digər Cinayətlər” fəslində 314-cü maddədə təsbit edilmiş vəzifəli şəxs tərəfindən törədilən cinayətlərdən biridir. Bu maddənin dispozisiyasına əsasən, səhlənkarlıq vəzifəli şəxsin işə vicdansız və ya laqeyd münasibəti nəticəsində öz xidməti vəzifəsini yerinə yetirməməsi və ya lazımi qaydada yerinə yetirməməsidir. Bu əməl o halda cinayət əməli hesab edilir ki, fiziki və ya hüquqi şəxslərin hüquqlarına və qanuni mənafelərinə və ya dövlətin və ya cəmiyyətin qanunla qorunan mənafelərinə mühüm zərər vurulmasına səbəb olsun. (1)

Səhlənkarlıq cinayətinin ictimai təhlükəliliyi onunla səciyyələnir ki, bir vəzifəli şəxsin xidmətə qarşı ədalətsiz və ya səhlənkar münasibəti nəticəsində vəzifələrini yerinə yetirməməsi və ya lazımınca yerinə yetirməməsi yalnız dövlət qulluğu və yerli özünüidarəetmə orqanlarında xidmətin mənafelərinin əhəmiyyətli dərəcədə pozulması ilə deyil, həm də vətəndaşlara, təşkilatlara və ya dövlətə böyük ziyan vurulması ilə müşayiət edilir (2, s.349)

Təqsirkarın bu maddə ilə məsuliyyət məsələsi həll edilərkən əsas diqqət edilməli olan məsələlərdən biri onun öz vəzifələrini yerinə yetirməsi üçün real obyektiv və subyektiv şəraitin mövcud olmasıdır. Obyektiv amillərə bir məmurun rəsmi fəaliyyətini həyata keçirdiyi xarici şərtlər daxildir. Bunlar real istehsal şərtləri, icazə verilən maksimum iş miqdarı, inventar əşyalarının düzgün qorunması və qorunmasını təmin etmək və sairədir. Subyektiv amillər bir məmurun şəxsi keyfiyyətlərini, yəni təhsili, ixtisası, peşə təcrübəsi, rəsmi funksiyaların təkbaşına yerinə yetirilməsini təmin etmək bacarığını ehtiva edir.

## Təhlil və müqayisə

Maraqlısı budur ki, bugün müstəqil Respublikamızın Cinayət qanunvericiliyində bir maddədə toplanan bu əməl 1922-ci il Azərbaycan İctimai Şura Cümhuriyyətinin Cəza Məcəlləsində ayrı-ayrı maddələrdə təsbit edilmişdi. Belə ki, Cəza Məcəlləsinin Xüsusi hissəsində “Vəzifə (qulluq) cinayətləri” adlandırılan II Fəsildə ilk öncə 107-ci maddədə belə qeyd olunur: “Vəzifədə fəaliyyətsizlik göstərmək, yəni vəzifəli şəxs tərəfindən öz qulluq vəzifəsinə görə yerinə yetirilməsi lazım gələn işləri yerinə yetirmək-bir ilədək müddətə azadlıqdan məhrumetmə və ya vəzifədən kənar etməklə məcbur işlərlə cəzalandırılır. (3) Bu hərəkətlər xüsusilə ağır nəticələrə səbəb olmuş və ya vəzifəli şəxs tərəfindən tamah və ya sair şəxsi məqsədlərlə edilmişsə- ciddi təcridlə bir ildən az olmayan müddətə azadlıqdan məhrumetmə ilə cəzalandırılır”.

Qeyd edilən maddənin 17 noyabr 1923-cü il redaksiyasında isə əməl belə təsbit edilmişdir: “Vəzifədə fəaliyyətsizlik göstərmək, yəni vəzifəli şəxs tərəfindən öz qulluq vəzifəsinə görə yerinə yetirilməsi lazım gələn işləri yerinə yetirməmək, 105-i maddədə göstərilmiş nəticələrə səbəb olmuşsa, yəni xüsusilə ağır nəticələrə səbəb olmuş və ya vəzifəli şəxs tərəfindən tamah və ya sair şəxsi məqsədlərlə edilmişsə-bir ilədək

müddətə azadlıqdan məhrumetmə və ya vəzifədən kənar etməklə məcbur işlərlə və ya ciddi təcridlə bir ildən az olmayan müddətə azadlıqdan məhrumetmə ilə cəzalandırılır".

Bununla yanaşı, səhlənkarlıq ifadəsi 108-ci maddədə əks olunmuşdur: "Qulluğa səhlənkarlıqla yanaşmaq, yəni işlərin süründürülməsinə, yubanmasına, iş icraatında və hesabatda qaydasızlığa, yaxud qulluqda sair nöqsanlara səbəb olan üzərinə qulluq vəzifəsinə görə qoyulmuş vəzifələrə diqqətsiz və layeqd yanaşma- bir ilədək müddətə azadlıqdan məhrumetmə və ya vəzifədən kənar etməklə məcbur işlərlə və ya ciddi təcridlə bir ildən az olmayan müddətə azadlıqdan məhrumetmə ilə cəzalandırılır".

Həmin maddənin 17 noyabr 1923-cü il redaksiyasında isə əməl belə təsbit edilmişdir: "Qulluğa səhlənkarlıqla yanaşmaq, yəni üzərinə qulluq vəzifəsinə görə qoyulmuş vəzifələrə diqqətsiz, laqeyd və ya açıqdan-açığa vicdansızcasına yanaşmaq- bir ilədək müddətə azadlıqdan məhrumetmə və ya vəzifədən kənar etməklə məcbur işlərlə və ya ciddi təcridlə bir ildən az olmayan müddətə azadlıqdan məhrumetmə ilə cəzalandırılır".

16 aprel 1927-ci il tarixli Qərarla maddənin yeni redaksiyada verilmiş mətni isə belədir: "Qulluğa səhlənkarlıqla yanaşmaq və bürokratizm, yəni qulluqda işlərin və hesabatın süründürülməsinə, yubanmasına və ya qulluqda sair nöqsanlara səbəb olan etinasızlıq və ya vəzifəyə vicdansızlıqla və ya rəsmiyyətçiliklə yanaşmaq, bir ilədək müddətə azadlıqdan məhrumetmə və ya vəzifədən kənar etməklə məcbur işlərlə və ya ciddi təcridlə bir ildən az olmayan müddətə azadlıqdan məhrumetmə ilə cəzalandırılır".

Azərbaycan Azərbaycan İctimai Şura Cümhuriyyətinin 1927-ci il Cəza Məcəlləsində də eyni tendensiya nəzərə çarpır. (4) Belə ki, maddə 145-də vəzifədə fəaliyyətsizlik göstərmək əməli belə təsbit edilmişdir: "Vəzifədə fəaliyyətsizlik göstərmək, yəni öz qulluq vəzifəsinə görə yerinə yetirilməsi lazım gələn işləri yerinə yetirməmək - üç illik müddətə qədər azadlıqdan məhrum etməyə səbəb olur (maddənin sanksiyasının ilkin mətni) və ya üç illik müddətə qədər azadlıqdan məhrum etmayə vo ya intizam qaydası ilə tənbehə səbəb olur (1930-cu il 15 iyul tarixli qərarla sanksiyanın yeni redaksiyada verilmiş mətni).

Səhlənkarlıq ifadəsinin təsbit edildiyi 146-cı maddə isə belədir: "Qulluğa səhlənkarlıqla yanaşmaq və bürokratizm, yəni qulluqda işlərin və hesabatın süründürülməsinə, yubanmasına və ya qulluqda sair nöqsanlara səbəb olan etinasızlıq və ya vəzifəyə vicdansızlıqla və ya rəsmiyyətçiliklə yanaşmaq, 143-cü maddə ilə nəzərdə tutulmuş əlamətlər mövcud olduqda – üç illik müddətə qədər azadlıqdan məhrum etməyə səbəb olur.

Daha ağır nəticələrə səbəb olan eyni əməllər- bir ildən az olmayan müddətə qədər azadlıqdan məhrum etməyə səbəb olur (1930-cu il 25 mart tarixli qərarla əlavə edilmiş 2-ci hissə nin mətni).

Azərbaycan SSR Cinayət Məcəlləsi 1948-ci il təfsirində də "səhlənkarlıq" cinayətinin bugünkü dizpozisiyası iki ayrı maddədə təsbit edilmişdir. Belə ki, maddə 145-ə əsasən, hökumət nümayəndəsinin fəaliyyətsizliyi dedikdə-vəzifədə fəaliyyətsizlik göstərmək, yəni öz qulluq vəzifəsinə görə yerinə yetirilməsi lazım gələn işləri yerinə yetirməmək nəzərdə tutulur ki bu da, ya üç illik müddətə qədər azadlıqdan məhrum etməyə və ya intizam qaydası ilə tənbehə səbəb olur. (5) Bu əməldə zərərli nəticələrin baş verməsi tələbi mövcuddur. Fəaliyyətsizlik əməlinə görə məsuliyyətin müəyyən edilməsi üçün bu əməllə (hərəkətsizlik) baş verən nəticə arasında səbəbli əlaqə olmalıdır.

146-cı maddədə isə qulluğa səhlənkarlıqla yanaşmaq və bürokratizm əməlinin dispozisiyası göstərilir: qulluqda işlərin və hesabatın süründürülməsinə, yubanmasına və ya qulluqda sair nöqsanlara səbəb olan etinasızlıq və ya vəzifəyə vicdansızlıqla və ya rəsmiyyətçiliklə yanaşma– üç illik müddətə qədər azadlıqdan məhrum etməyə səbəb olur. Daha ağır nəticələrə səbəb olan eyni əməllər – bir ildən az olmayan müddətə qədər azadlıqdan məhrum etməyə səbəb olur.

Hər iki maddədə vəzifədə soyuqluq məfhumu mövcuddur, lakin burada cüzi fərqlər vardır. (6, s.737) Belə ki, 145-ci maddəyə əsasən vəzifəli şəxsin işə soyuq yanaşması və ya bürokratizm, xidmət vəzifəsinə qayğısız, vicdansız və ya rəsmiyyətliklə yanaşmasından ibarətdir. Qayğısız və soyuqluq məfhumu demək olar ki, eyni bir mənanı verir; ola bilsin ki, soyuqluq qayğısızlığa nisbət bir qədər daha geniş dairədə olan hərəkətləri əhatə edir. Qayğısızlıq haqqında 146-cı maddədə bəhs edilir ki, bunda da yalnız qayğısızlıq deyil, eyni zamanda işə vicdansız yanaşılması qeyd edilir.

Adətən vicdansızlıq göstərildikdə qəsd hərəkətinə yol verildiyi, daha dürüst, qəsdən cinayətkarlıq nəticəsinə yol verildiyi nəzərdə tutulur. Lakin soyuqluq qəsdən zərər vurmaq kimi qiymətləndirilə bilməz.

Vicdansız və qayğısız yanaşma məfhumları arasındakı fərqin dəqiqlə.dirilməsinin mühüm əhəmiyyəti vardır. Qayğısızlıqda vəzifəli şəxs müəyyən bir səhv buraxır, yəni burada təqsirin ehtiyatsızlıq forması nəzərdə tutulur. Vicdansız yanaşmada isə, vəzifəli şəxs öz təqsirini başa düşür, lakin bəzi səbəblərə görə bu əməli edir. Lakin bu məsələyə verilən təfsir belədir ki, hər iki halda həm vəzifəyə qayğısız, həm də vicdansız yanaşdıqda təqsirkarın qəsdi cinayətkar nəticəyə (əmlak zərəri, ictimai qaydanı pozmaq və i. a.) yönəldilə bilməz. Buna görə vəzifəyə soyuq yanaşmaq tərkibi həmişə yalnız ehtiyatsızlıqdan əmələ gəlir. Əgər vəzifəli

şəxs idarənin işinə qəsdən əngəl törədirsə və ya öz vəzifəsini ifa etməyə qəsdən qayğısız yanaşırsa, o zaman başqa müvafiq şərtlər olduqda onun hərəkətləri vəzifəyə qayğısız yanaşmaq həddini aşaraq əks-inqilabi cinayət (sabotaj) şəklini alır. Əgər heç bir təqsir yoxsa, o zaman cinayət də yoxdur; təqsir olmadıqda baş verən zərərli nəticələrə 146-cı maddə ilə məsuliyyət nəzərdə tutula bilməz.

Azərbaycan SSR 1948-ci il təfsirində daha sonra SSRİ təcrübəsindən misallar gətirilməklə bu məsələlər aydın izah edilir. Belə ki, SSRİ Ali Məhkəməsi Plenumunun 1940-cı il 29 yanvar tarixli R. və B.-nin işinə dair çıxardığı qərarında göstərilmişdir:

«Mühakimə edilən, görülməsi ondan asılı olmayan tədbirləri görməmək üçün məsuliyyət daşıya bilməz. İşin materiallarından görünür ki, R. və B. birincisi – rayon sənaye malları ticarəti idarəsinin 1 №-li maqazinin müdiri, ikincisi isə onun müavini vəzifəsində işləyərkən istirahət günlərində bank bağlı olduğundan və rayon sənaye malları ticarəti idarəsində bu pulları saxlamağa yer olmadığına görə həmin günlərdə maqazin satışından hasil olan pulları gecə maqazində saxlamışlar. Beləliklə, 1937-ci il iyunun 30-da gündüz satışdan hasil olan 18.100 manat pul bir gecəlik maqazində piştaxtanın altında saxlanmışdır. İyulun 1-də maqazin açılan zaman aşkar olmuşdur ki, maqazinin dal divarında iki taxta sındırılıb pullar oğurlanmışdır. Bununla əlaqədar olaraq R. və B. məhkəmə tərəfindən RSFSR CM-nin 111-ci maddəsi (Azərbaycan SSR CM-nin 146-cı maddəsi) üzrə ona görə müqəssir hesab edilmişlər ki, onlar vəzifələrində soyuqluq edərək pulların saxlanması üçün tədbir görməmiş və pulların saxlanmasını qaydaya salmaq haqqında rayon sənaye malları ticarət idarəsi qarşısında ciddi məsələ qoymamışlar. İşdən görünür ki, istirahət günlərində gündüz satışından hasil olan pullar gecə maqazində saxlandığı rayon sənaye malları ticarəti idarəsinə bildirilmişdir, lakin idarə pulların saxlanması üçün tədbir görməmişdir. Beləliklə, pulların R. və B.-dan asılı olmayan səbəblərə görə maqazində saxlaması iş üzrə müəyyən edildiyinə görə SSRİ Ali Məhkəməsi sədrinin protestinə əsasən Plenum hökmü ləğy etmiş və işə xitam vermişdir".

SSRİ Ali Məhkəməsinin cinayət işləri üzrə məhkəmə kollegiyasının 1941-ci il 12 noyabr tarixli qərarı düzgün göstərir: «K. ona görə məhkum edilmişdir ki, o rayon səhiyyə şöbəsinin müdiri olarkən öz xidmət vəzifəsini ifa etməkdə soyuqluq göstərmişdir. Onun soyuqluğu bundan ibarət olmuşdur ki, tibb feldşeri Kotovanın şəxsi şeylərinin saxlanmasını təmin etməmişdir. K-nın hərəkətlərində cinayət tərkibi yoxdur. Çünki Kotovanın şəxsi şeylərinin saxlanmasının rayon səhiyyə şöbəsi müdiri olan K-nın vəzifəsi ilə heç bir əlaqəsi yoxdur. Kotova öz şeylərini K-ya bir səhiyyə şöbəsi müdiri kimi yox, ancaq xüsusi bir şəxs kimi saxlamağa vermişdir. Çünki Kotova K. ilə bir idarədə bərabər işləyirmişlər. Cinayət işləri üzrə məhkəmə kollegiyası itən şeylər haqında məsələnin K.-nın haqqında ancaq mülki qayda ilə həll edilməli olduğunu nəzərə alaraq Zaonşqa rayon xalq məhkəməsinin hökmünü və Karel-Fin SSR Ali Məhkəməsinin qərarını ləğv etmiş və K.-nın haqqında işin cinayət qaydası ilə icraatını xətm etmişdir".

Vəzifəyə soyuq yanaşmağın müəyyən halları. Təqsirkarın cinayət hərəkətlərini 146-cı maddə üzrə tövsif edərkən vəzifəni ifa etdikdə soyuqluq göstərilməsinin müəyyən hallarını göstərməyin əhəmiyyəti vardır. Moskva vilayətinin İstra rayonu 1-ci nahiyə xalq məhkəməsi tərəfindən 1939-cu il martın 27-də məhkum edilmiş K-nın işinə dair SSRİ Prokurorluğunun protestində cinayətin K.-nın soyuqluğundan ibarət olduğu dürüst göstərilmişdir. Protestdə deyilir ki, K.-nın hərəkətlərində şübhəsiz ona tapşırılan vəzifəyə soyuq yanaşmaq əlamətləri vardır: o, çadırı lazımınca bağlamaq qayğısında olmamışdır, özünün istirahət günü olan iyulun 31-də çadırda olmadığını qabaqcadan keşikçi Z.-ya xəbər vermiş, kassanın əvvəlki gündən yığılmış pullarını saymadan çadırda qoymuşdur, gündüzlər və istirahət günlərində çadırın mühafizə edilməsi haqqında Moskva vilayət ticarət idarəsi müdiriyyəti qarşısında məsələ qoymamışdı. Bütün bu hallar K-nin hərəkətlərini 111-ci maddə üzrə (Azərbaycan SSR CM-nin 146-cı maddəsi) tövsif etməyə əsas verir.

Burada bir digər məsələ budur ki, xidmət vəzifəsinə soyuq yanaşılmasının müəyyən halları göstərilmədikdə belə hərəkətləri 146-cı maddə üzrə tövsif etmək əsassızdır. SSRİ Ali Məhkəməsi Plenumunun 1942-ci il 22 may tarixli qərarı ilə 146-cı maddə ilə hökm ləğv edilmişdir. Çünki "istintaq və məhkəmə orqanları K-nı vəzifəsinə soyuq yanaşmaqda təqsirləndirərək bu soyuqluğun nədən ibarət olduğunu qəti göstərməmişlər".

## Nəticə

Azərbaycan cinayət qanunvericiliyinin keçdiyi inkişaf yolunda müəyyən fərqlərlə təsbit olunmasına baxmayaraq, səhlənkarlıq cinayəti bugün də öz aktuallığını qoruyub saxlamaqdadır. Həm dövlətin, həm də ayrı-ayrı qurumların nüfuzu, vətəndaşların mənafelərinin qorunması baxımından bu cinayətin aşkar edilməsi və qarşısının alınması olduqca mühüm bir məsələdir. Bunun üçün isə vəzifə bölgüsü, peşəkarlıq səviyyəsi, kadr seçimi və yerləşdirilməsi, məmurların fəaliyyətinə daxili və şöbə uçotu və nəzarəti, məmurların rəsmi fəaliyyətlərinin dəqiq hüquqi tənzimlənməsi, vəzifəli şəxslər tərəfindən qəbul edilmiş qərarların əhəmiyyətini, əxlaqi və psixoloji deformasiyanın nədən ibarət olması və tənzimlənməsi mühüm məsələdir.

**Ədəbiyyat**

1. Criminal Code of the Republic of Azerbaijan: with all additions and changes made before March 1, 2020
2. A.I. Rarog. Commentary to the Criminal Code of the Russian Federation. Moscow: Prospect, 2015.945 c.
3. Penal Code of the Republic of Azerbaijan Public Council. 1922
4. Penal Code of the Republic of Azerbaijan Public Council. 1927
5. Interpretation of the Criminal Code of the Azerbaijan SSR of 1948
6. Almanac Code of Criminal Law. 1920-2000. Baku. Huquq publishing house. 2014 p. 1184 s.
7. Soviet Justice, 1940, №5

**Rəyçi: prof.İ.Ağayev**

Göndərilib: 13.04.2021 Qəbul edilib: 14.04.2021

qəhrəmanının yaradıcılığına diqqət yetirib. Portretin alt hissəsində yerləşən vərəqin üzərində şairin adı "Cabir Novruz" verilib. Sağ aşağı tərəfdə mürəkkəb qabı və lələk isə onun peşəsini vurğulayan digər detallardır.

Heykəltəraşın Cabir Novruza həsr etdiyi əsər haqqında aparılan elmi tədqiqatda bildirilir ki, "Şairin portretinin fonunda təsvir olunmuş kitablarının adından da göründüyü kimi o, insanları yüksək mənəviyyata səsləyən yaradıcılığa və yüksək bəşəri mənəvi dəyərlərin tərənnüm edən bədii irs sahibidir. Elə bu cür qiymətli irsin sahibi olması da onun xatirəsinə olan bədii - heykəltəraşlıq münasibətini şərtləndirmişdir. Cabir Novruzun belə bir zəngin fonda yerləşdirilmiş portreti kürsülərda gənclik hərarətiylə şeirlər deyən və bu hərarəti dinləyicilərinə sona kimi qətrə - qətrə çatdıran bir şairin zahiri görkəminin əksidir. Ümumilikdə isə görkəmli söz xiridarı olan şairin haqqında söz açdığımız xatirə lövhəsi Cabir Novruz şəxsiyyətinə və yaradıcılığına "obrazlı güzgü" tutan yaddaqalan sənət nümunəsidir." (2, 42)

Azərbaycanın görkəmli ictimai xadimi Nəsrulla Nəsrullayevin memorial lövhəsi sadə kompozisiyaya malikdir. Natiq Əliyev qara qranit fonda Nəsrullayevin ağ mərmər sol tərəfdən profil portretini yerləşdirib. Olduqca zəhmli təsvir olunan Nəsrullayevin obrazında heykəltəraşın yaradıcılığına xas olan dolğun psixoloji tutumu görmək mümkündür.

Natiq Əliyevin yaradıcılığının maraqlı nümunələrindən biri olan Azərbaycan şairi və publisisti Zeynal Cabbarzadənin memorial lövhəsini (2007) qeyd etmək lazımdır. Qara qranit fonda buruşdurulmuş kağız vərəqlərin üzərində şairin portreti yerləşdirilib. Cabbarzadənin üzü sağ tərəfə aşağıya baxır. Sağ qolu sol əlinə dirsəklənib və əli ilə çənəsini tutur.

Xalq yazıçısı İsmayıl Şıxlının memorial lövhəsi (2011) qara qranitin ekspressiv həlli ilə seçilir. Qranitin alt hissəsi cilalanıb və burada yazıçı haqda məlumat verilib. Yuxarı hissə isə cilalanmayıb və burada yazıçının portret barelyefi yerləşir. Sanki yazıçı canlanıb barelyefdən çıxmağa "can atır". Bu da heykəltəraşın istedadını bir daha əyani şəkildə sübut edir.

2012-ci ildə Natiq Əliyev Abdulla Şaiqin obrazına yenidən müraciət edir. Bu dəfəki memorial lövhə isə şairin mənzil muzeyinin fasadı üçün hazırlanmışdır. Birinci lövhədən həm kompozisiya, həm də material olaraq fərqlənirdi. Qara qranitin fonunda şairin bürünc portreti təsvir olunub. Mülayim, səmimi gülümsəməsi ilə müəllif tamaşaçıda əsərinin qəhrəmanına qarşı rəğbət yaradır.

## References

1. Aliyev Z. Stages of development of Azerbaijan sculpture in the XX century. Baku. Science and Education. 2016. S. 190
2. Gasimov F. The work of People's Artist Natig Aliyev in the context of modern Azerbaijani sculpture. Philosophy of Art Criticism. Doc. Dissertation. Baku. 2014. S. 132
3. Gasabova I. Image of Justice of People's Artist Natig Aliyev.// "Palitra" gas. 2018, 20 November. S. 13
4. Nazarova E. Maybe we will meet again.// "Gobustan" art collection. 1987. №3 p.54-58

**Rəyşi: sənət.f.d. G.Seyidəhmədli**

Göndərilib: 15.04.2021 Qəbul edilib: 16.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/293-296

**Ləman Fəxrəddin qızı Qasımzadə**
Bakı Dövlət Universiteti
magistratı
miss.esgerova@mail.ru

# YETKİNLİK YAŞINA ÇATMAYANLARIN CİNAYƏT MƏSULİYYƏTİ PROBLEMLƏRİ

***Açar sözlər:*** *yetkinlik yaşına çatmayan, cinayət, cəza, məsuliyyət*

## Problems of criminal liability of minors

**Summary**

In the article: The inexperience, fear and incompetence of teenagers are among the reasons why group crime is more common among them. The reasons for juvenile delinquency, their responsibilities and prevention, which have become a topical and wide-ranging topic of discussion in modern times, are explained, as well as the activities of the Commission for the Protection of the Rights and Affairs of Minors.
***Key words:*** *minor, crime, punishment, responsibility*

## Giriş

İnsan, onun həyatı, səhhəti, hüquq və azadlıqları Azərbaycan Respublikasının Konstitusiyası ilə ali dəyərlər olduğu bəyan edilir, belə dəyərlərin qorunması dövlətin ən başlıca vəzifəsi kimi təsbit edilir. İnsan hüquqları üzrə Ümumdünya Konfransının materiallarında (1993-cü il, Vyana) qeyd edilir ki, insan hüquqlarının müdafiəsinə təminat verən hüquqi mexanizm yaradılmalıdır. Belə mexanizmin vacib həlqələrindən biri qüvvədə olan cinayət qanunlarıdır. Hüquqi dövlət quruculuğu yolu tutmuş müstəqil Azərbaycan Respublikası bu gün dünya birliyində müstəqil sözə malik dövlətlərin sırasında yer almışdır. Bütün sahələrdə olduğu kimi hüquq və qanunvericilik sahəsində də aparılan məqsədyönlü islahatlar insan hüquq və azadlıqlarının təmin olunmasında, ictimai təhlükəli əməllərin qarşısının alınmasında və bununla da insanlarda hüquqi düşüncənin, hüquq mədəniyyətinin artırılmasında mühüm əhəmiyyət kəsb edir. Bir çox ölkələrdə olduğu kimi Azərbaycan Respublikasında da yetkinlik yaşına çatmayanlar tərəfindən törədilən cinayətlər gündən-günə artmaqdadır. Bu cinayətlərin qarşısının alınması üçün həmin cinayətlərin yetkinlik yaşına çatmayanlar tərəfindən hansı səbəbdən törədilməsi araşdırılmalı, onlara cəza təyin edilən zaman bu səbəblər nəzərə alınmalı, onların gələcəkdə yenidən cinayət törətməsinə səbəb olmamalı və onlar cinayət törətmənin hüquqazidd, təqsirli əməl olduğunun şüurlu surətdə dərk etmələrini üçün şərait yaradılmalıdır. “Yetkinlik yaşına çatmayanların cinayət məsuliyyəti problemləri” adı altında təqdim edilən məqalədə yetkinlik yaşına çatmayan hansı yaş həddində olan şəxslərdir,onların cinayət törətmə səbəbləri, onların cinayət məsuliyyəti, tətbiq olunan cəzalar öz əksini tapmışdır.

## Yetkinlik yaşına çatmayan şəxs-anlayışı

Ümumiyyətlə götürsək qanunvericilikdə yetkinlik yaşına çatmaq, qanunla müəyyən olunmuş fəaliyyət qabiliyyətinə malik olmaq nəzərdə tutulur. Hər bir hüquq sahəsinin spesifikliyini nəzərə alsaq bu müxtəlif yaş hədlərində göstərilir. Azərbaycan Respublikası Mülki Məcəlləsində tam fəaliyyət qabiliyyəti kimi 18 yaş göstərilir, 14 yaşdan 18 yaşa qədər müddət məhdud fəaliyyət qabiliyyətli sayılmaqla, 14 yaşına qədər şəxsin isə heç bir fəaliyyət qabiliyyəti yoxdur. Fəaliyyət qabiliyyəti dedikdə isə şəxsin hüquqları əldə edib həyata keçirmək və üzərinə düşən vəzifələri icra etmək qabiliyyətidir. Əmək Məcəlləsində 15 yaşı tamam olmuş şəxs artıq əmək müqaviləsi bağlamaq hüququna malikdir. Cinayət Məcəlləsində artıq 16 yaşı tamam olmuş şəxsi cinayətin subyekti kimi tanıyır, bəzi kateqoriya cinayətlər də isə bu 14 yaş müəyyən edilir. Həmçinin “Yetkinlik yaşına çatmayanların baxımsızlığının və hüquq pozuntularının profilaktikası haqqında” Azərbaycan Respublikasının Qanununun 1.0.1-ci maddəsinə əsasən yetkinlik yaşına çatmayan on səkkiz yaşınadək olan şəxslərdir.

## Yetkinlik yaşına çatmayanların cinayət törətməsinə səbəb olan hallar

Baş vemiş cinayətlərin xeyli qismi yetkinlik yaşına çatmayan şəxslər tərəfindən törədilir. Bu qrup cinayətlərin baş vermə hallarını, xüsusiyyətlərini araşdırarkən, həmin cinayətlərin məhz yetkinlik yaşına çatmayan şəxslər tərəfindən törədilməsini qanunvericilik daha üstün tutaraq bu növ cinayətləri ayırır və cəza məsələsində xüsusilə fərqli mövqedən yanaşır. Cinayət Məcəlləsində xüsusi bölmə kimi nəzərdə tutulan “Yetkinlik yaşına çatmayanların cinayət məsuliyyəti” əvvəllər qüvvədə olan Cinayət Məcəlləsində müstəil

bölmə kimi nəzərdə tutulmamışdır.Yetkin olmayan cinayətkarın hərəkətlərində onun ətarfı qavramaq, mövcud qaydalara əməl etmək , hisslərini cilovlamaq kimi niyyətindən daha çox onun emosiyaları, keçirdiyi hisslər qabarıq təzahür edir. Bir sözlə yetkinlik yaşına çatmayan cinayətkarın hərəkətlərini daha çox onun emosiyaları, ətrafda baş vermiş hadisələrin təsiri idarə edir. Yeniyetmə sosial, psixoloji və ümumilikdə həyati sferada hələ tam formalaşmamış, özünü. Qaşrısına qoyduğu məqsəd və prinsiplərinin dərk etməmiş bir şəxsdir.

Yetkinlik yaşına çatmayan şəxsin cinayət törətməsinin səbəbləri öz spesifikliyi ilə seçilir. Buna müxtəlif amillər aid ola bilər. Yetkinlik yaşına çatmayan şəxsin irsi məxsusluğu ilə bağlı olaraq, ona valideynləri tərəfindən miras keçmiş xasiyyətində önə çıxan hallar, belə ki, yetkinlik yaşına çatmayan şəxsin əxlaqında olan, xislətində gizlədilmiş mənfilikləri idarə etmək, ört-basdır etmək cilovlamaq bacarığı çox aşağı səviyyədədir. Digər amil kimi, yetkinlik yaşına çatmayan şəxsin düşdüyü mühit, onun ətrafında olan şəxslər və cərəyan edən hadisələrin axmını göstərmək olar. Bu hal hələ yetkin yaş dönəminə qədəm qoymamış bir şəxs üçün əsas rolunu oynayır. Özünü belə dərketməyən yeniyetmə ideal bildiyi təsiri ilə, təkidi ilə bəzən törətdiyi əməlin ağğır nəticəyə səbəb olduğunu belə qavramır. Göründüyü kimi, onun düşdüyü mühit əsas ol oynayır. Əgər yeniyetmə yaxınlarında sevi və lazımi diqqət görmürsə, bu münasibəti özündən asılı olmadan başqalarında axtarmağa başlayırsa, təhsilindən kənar qalırsa özünə oxşar bir mühitdə cəmiyyətə təhlükə yaradacaq bir qrupun təsirinə düşməsi bpyük ehtimaldır. Belə qrupda ö özünü tapır, özünə oxşar şəxsləri görür və ehtiyacı olan münasibəti onlardan alır. Artıq həmin qrup daxilində baş vermiş qanunazidd əməllərin törədilməsindən geri qalmır, həmin qrupda olan şəxslərin yanında daha yaxşı yer tutmağa, onların hörmətini qazanmağa və əldə etdiyi isti münasibəti ititməməyə çalışır. Yeniyetmənin böyüdüyü ailədə olan çatışmazlıqlar, tərbiyəsində olan boşluqlar onu cəmiyyətdə aqressiv həmyaşıdlarının arasına salır, bu halda onu cinayətkar birliyə daxil olur. Yeniyetmənin spirtli içiki əqbul etməsi, narkotik vasitə istifadəsi onun cinayət törətməsi üçün münbit şərait yaradır. Həmçinin cinayət törətmiş yetkinlik yaşına çatmayanların şəxsiyyətini xarakterizə hallarına nəzər saldıqda görünür ki, onları bir çoxu pis ailədən, tək valideynli ailədən çıxdığı və ya ümumiyyətlə ailəsinin olmadığı, təhsil almadığı və ya təhsildən yayındığı, maraq və məşğuliyyətinin olmadığı müəyyən olunur.

Cəmiyyətin yetkinlik yaşına çatmayanların cinayətlərini qəbul etməsinin səbəbləri ümumiləşdirilir: ailə dağılması, yoxsulluq, iqtisadi böhran, narkotik və alkoqol. Psixologiyada, bir gənci cinayət törətməyə vadar edən səbəblərin xaricində, ümumi vəziyyəti daha yaxşı müəyyənləşdirən yetkinlik yaşına çatmayanların cinayətkarlığını təsir edən amillər araşdırılır. Bəzi amillər bunlardır:

- Ailənin inteqrasiya indeksi
- Məktəb indeksi
- Narkotik asılılığı indeksi
- İşsizlik nisbəti
- Səlahiyyətli orqanların səmərəsizliyi
- İdmana qarşı impulslar

## Yetkinlik yaşına çatmayanların cinayət məsuliyyəti

Cinayət qanunvericiliyində şəxsiyyət əleyhinə olan cinayətlər beş növə ayrılmışdır:

- Həyat və sağlamlıq əleyhinə olan cinayətlər;
- Şəxsiyyətin azadlığı və ləyaqəti əleyhinə olan cinayətlər;
- Şəxsiyyətin cinsi toxunulmazlığı və cinsi azadlığı əleyhinə olan cinayətlər;
- İnsan və vətəndaşların Konstitusiya hüquq və azadlıqları əleyhinə olan cinayətlər;
- Yetkinlik yaşına çatmayanlar və ailə münasibətləri əleyhinə olan cinayətlər.

Yetkinlik yaşına çatmayanlar və ailə münasibətləri əleyhinə olan cinayətlər 2 yarımqrupa bölünür: a) yetkinlik yaşına çatmayanların cinayətləri (maddə 170-171); b) ailə münasibətləri əleyhinə olan cinayətlər (maddə 172-176).

Yetkinlik yaşına çatmayanların törətdiyi cinayətə görə tətbiq edilən cəza növləri və tərbiyəvi xarakterli məcburi tədbirlər BMT Baş Məclisinin 1985-ci il 29 noyabr tarixdə qəbul etdiyi «Yetkinlik yaşına çatmayanlar barəsində ədalət mühakiməsi-nin həyata keçirilməsi ilə əlaqədar minimum standart qaydalar»a tamamilə uyğundur. Qeyd edilən beynəlxalq akta uyğun olaraq məhkəmə yetkinlik yaşına çatmayanın cinayət işi üzrə qəbul etdiyi qərarın və seçdiyi təsir tədbirinin təkcə işin hallarına və hüquq pozuntusunun ağırlığına uyğunluğu prinsipinə deyil, həm də belə tədbirin yetkinlik yaşına çatmayanın vəziyyətinə və marağına uyğun olmasını da rəhbər tutur. Cinayət Məcəlləsinin 85-ci maddəsi cinayət törədən yetkinlik yaşına çatmayanlar barəsində tətbiq edilən cəza növlərində məhdudiyyət vardır. Cinayət törədən yetkinlik

yaşına çatmayanlar barəsində ancaq dörd növ cəzanın tətbiqinə yol verilir. Yetkinlik yaşına çatmayanlar barəsində ömürlük azadlıqdan məhrum etmə, əmlak müsadirəsi, azadlığın məhdudlaşdırılması, müəyyən vəzifə tutma və ya müəyyən fəaliyyətlə məşğul olma hüququndan məhrum etmə, habelə cinayət törədən hərbi xidmətdə olan şəxslər barəsində tətbiqedilən cəzalar tətbiq edilmir. Yetkinlik yaşına çatmayanlara cərimə, ictimai işlər, islah işləri,azadlığın məhdudlaşdırılması və müəyyən müddətə azadlıqdan məhrumetmə cəzası tətbiq edilə bilər. Cərimə, yalnız müstəqil əmək haqqı və ya bu cəzanın icrasına yönəldilə bilən əmlakı olan yetkinlik yaşına çatmayana təyin edilir. Yetkinlik yaşına çatmayanlara cərimə altı yüz manatadək, ictimai işlər səksən saatdan üç yüz iyirmi saatadək müddətə, islah işləri iki aydan bir ilədək müddətə, azadlığın məhdudlaşdırılması iki aydan iki ilədək müddətə, azadlıqdan məhrum etmə on ildən çox olmayan müddətə təyin edilir. Azadlıqdan məhrum etmə cəzasına məhkum olunmuş, lakin hökm çıxarılanadək on səkkiz yaşı tamam olmamış şəxslər ümumi və ya möhkəm rejimli tərbiyə müəssisələrində yerləşdirilirlər. Məsuliyyət və cəza məsələsinin həllində yetkinlik yaşına çatmayanların tərbiyəsi, onlara yaxın ətrafının,yaşıdlarının və yaşlı şəxslərin təsiri, həyat şəraiti, psixi inkişaf səviyyəsi nəzərə alınır. Psixi inkişaf səviyyəsinə emosional iradi xüsusiyyət, düşüncə tərzinin və idrak fəaliyyətinin vəziyyəti, təsəvvürlər və s. daxildir.Yetkinlik yaşına çatmayanın şəxsiyyəti, onun tərbiyəsi və həyat tərzi ilə əlaqədar məlumatlar tam toplanılmalıdır. Əgər tam toplanmamışdırsa və onları məhkəmə iclasında aradan qaldırmaq mümkün deyildirsə, bu, işin əlavə ibtidai istintaqa qaytarılmasına əsas ola bilər. Yetkinlik yaşına çatmayanlar tərəfindən törədilən böyük ictimai təhlükə törətməyən və ya az ağır cinayət üzrə işə baxılarkən məhkəmə yetkinlik yaşına çatmayanın məcburi tərbiyəvi təsir tədbirlərinin köməyi ilə islah olunacağının mümkünlüyü məsələsini araşdırmalıdır.

Eyni zamanda Yetkinlik yaşına çatmayanların işləri və hüquqlarının müdafiəsi üzrə komissiyada mövcuddur. Həmin komissiyanın məqsədi Komissiyanın əsas məqsədi yetkinlik yaşına çatmayanlara tərbiyəvi təsir göstərməkdən, onların hüquqlarını və qanuni mənafelərini qorumaqdan, davranışına nəzarət etməkdən, qanunazidd əməllərin qarşısını almaqdan, göstərilən məsələlərdə dövlət və yerli özünüidarəetmə orqanlarının, mülkiyyət formasından asılı olmayaraq müəssisələrin, idarələrin və təşkilatların fəaliyyətini əlaqələndirməkdən ibarətdir. Həmin komissiya yetkinlik yaşına çatmayanların hüquqlarının və qanuni mənafelərinin qorunması, həyat şəraitinin yaxşılaşdırılması, sağlamlığının qorunması, tərbiyəsi, təhsil alması, işləməsi və istirahəti, baxımsızlığının və kimsəsizliyinin profilaktikası sahəsində müvafiq proqramların işlənib hazırlanmasında iştirak edir, onların icrasına nəzarət edir, yetkinlik yaşına çatmayanların hüquq pozuntularının profilaktikasını həyata keçirən orqan və müəssisələrin fəaliyyətini əlaqələndirir.

Həmçinin yetkinlik yaşına çatmayanlarla danışarkən, onlara hər hansı stiuasiyanı izah edərkən hər kəs diqqətli olmalıdır. Çünki onlar çox həssas olurlar və azyaşlılar ailədə hər hansı vasitə olmamalıdır . Onlara öz yaşlarına uyğun formada davranış tərzi göstərilməli, müsbət keyfiyyətlər aşılanmalıdır.

**Nəticə**

Azərbaycan Respublikasının təcrübəsində oğurluq edən, narkotik maddələr qəbul edən, boşanma məhkəmələrinin əsas predmetinə çevrilən azyaşlıların efirə çıxarılması, onların şəxsiyyətinin açıqlanması adi hal kimi qəbul edilir. Uşaqlardan bəhs edən xəbərlərdə etik çatışmazlıqlar ortaya çıxır. Mediamız zorlama, xəsarət yetirmə, oğurluq, narkotikdən istifadə, boşanma, intihar, öldürmə və başqa durumlarda zərərçəkmiş, təqsirli və ya başqa qismdə cəlb olunan azyaşlıları topluma necə təqdim etməkdə zaman-zaman axsadıqlarını büruzə verirlər. Adətən, məsələnin ciddiliyi nəzərə alınmadan, etik çərçivələr gözlənilmədən onların kimliyi, görüntüləri efirə verilir. Belə olan halda etik qaydaların çərçivəsində azyaşlılarla görüşən jurnalistlər aşağıdakılara diqqət eməlidir:

- travmatik xəbərlər xəbər mövzusudursa, azyaşlının çəkdiyi acıları artıra biləcək suallardan, şərhlərdən qaçmaq lazımdır;
- azyaşlılara onun yaşam tərzi olmayan, təsadüf üzündən və ya ilk dəfə üzləşdiyi şeylər haqqında suallar vermək, azyaşlını xəbərə mövzu edən olayı yenidən onun gözü önündə canlandırmasına səbəblər vermək yolverilməzdir;
- jurnalist istər azyaşlıya, istərsə də yetkinlik yaşına çatmışlara onlarla hansı səbəbdən görüşdüyünü, onlardan alacağı bilgiləri necə istifadə edəcəyini onların özlərinə bildirməlidir;
- hər hansı görüş, habelə video, foto çəkiliş üçün azyaşlının, eləcə də yetkinlik yaşına çatmış şəxsin icazəsi alınmalıdır;
- jurnalist azyaşlı ilə görüşərkən diqqətli olmalıdır ki, görüş iştirakçılarının sayına sərhəd qoyulmalı, azyaşlının özünü tam sərbəst hiss edəcəyi ortam yaradılmalı və belə bir ortamda olduğu azyaşlıya hiss etdirilməlidir.

Yetkinlik yaşına çatmayanların arasında cinayət hallarının baş verməsinin qarşısını almaq üçün müvafiq qurumların təhsil müəsisələrində, ailə məsləhətləşmələrində və hətta narkotik vasitə istifadə edənlərin müalicə olunğu müəssisələrdə tədbir görməsi vacibdir. Yetkinlik yaşına çatmayanların cinayətləri çox vacib bir sosial problemdir. Gənclər bir ölkənin gələcəyini təmsil edirlər: kiçik yaşlarından cinayətə üz tutarlarsa, onları cəmiyyətə qovuşdurmaq çox çətindir.

## References

1. Criminal Code of the Republic of Azerbaijan. "Law" publishing house. Baku-2020
2. Civil Code of the Republic of Azerbaijan. DIGESTA Publishing House. Baku 2020
3. Commentary to the Criminal Code of the Republic of Azerbaijan. Baku, “Law” publishing house 2016.
4. Samandarov F.Y. Criminal law. General part. Textbook for high schools. Revised reprint. DIGESTA Publishing House. Baku-2013
5. Hasanov E.H. Issues of prevention of crimes committed by minors. Baku, Maarif, 1991.
6. Crime and lawlessness. M., 1997
7. 7.Naumov A.V. Russian criminal law. General part. Lecture course. In Azerbaijani. Baku: “Law” Publishing House, 1998.
8. Criminal law of the Russian Federation. General part. M., 2001.
9. Regulations on the commissions on affairs and protection of the rights of minors

**Rəyçi: prof.Ş.Səmədova**

Göndərilib: 04.04.2021 Qəbul edilib: 05.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/297-300

**Gunel Oktay Huseynova**
Baku State University
master
gunellhuseyn@gmail.com

# AVIATION SECURITY IN EUROPEAN UNION. EUROPEAN AVIATION SAFETY AGENCY

**Summary**

Faced with a massive increase in air traffic resulting from the successful implementation of the single aviation market, the European Union ensures that all European citizens can enjoy the high level of safety in the sky. The European Commission developed a set of basic civil aviation security standards with the Regulation (EC) No 2320/2002, establishing common rules in the field of civil aviation security which was adopted on 16th December 2002 by the European Parliament. In 2008, Regulation (EC) No 300/2008 repealed this Regulation and introduced a series of new measures aimed to improve, streamline and simplify existing procedures. In 2002, the Regulation (EC) No 1592/2002 was the founding document of a new entity, the European Aviation Safety Agency. Areas of activity were Certification and Maintenance of aircraft. On 18 March the new Regulation (EC) No 216/2008, repealing the original Basic Regulation was published and applicable from 08 April on. By virtue of Regulation (EC) No 216/2008, the EU extended the common aviation safety rules and the corresponding responsibilities of EASA to aircraft operations and aircrew licensing and training.

***Key words:*** *aviation, security, European Aviation Safety Agency, Joint Aviation Authorities, Joint Aviation Requirements*

## Introduction

One of the cornerstones of the European Union's functioning is the abolition of borders between all the Member States and the creation of a single internal market within them, guaranteeing the free movement of goods, persons, services and capital (Article 26 TFEU). (3) This principle also applies to the air transport market, which means that any airline registered in any of the Member States can fly anywhere in the EU. The existence of such regulations is very important for applying to common safety and security standards in the EU. This is particularly important in the context of air transport, as the overwhelming majority of air operations are carried out over several national borders. By applying common European standards for the protection of passengers, crews, freight and aircraft, and airport infrastructure, we can be sure that the same high standards will be introduced in all the Member States. This also helps to avoid passenger uncertainty and confusion, which can be generated by the need to comply with many different internal security regulations (e.g. airport security checks). To sum up, the application by the EU Member States of common security and safety standards improved the comfort and safety of air travel, shortened the pre-departure time, and, most importantly, lowered the cost of air travel.

Safety and security are two very different concepts. Aviation security is the set of measures and resources implemented to prevent malicious acts (terrorism) targeting aircraft, their passengers, and crew members. For example, X-ray and explosives trace-detection portal machines in airports contribute to security. Aviation safety relates to protection against all accidents, errors or unintentional defects in the design, construction, maintenance and operation of aircraft. (4)

**Aviation security policy in EU.** After the tragic attacks of 11 September 2001, The European Union understood the importance and the need to adopt a uniform system of Regulations for the prevention of unlawful acts in civil aviation. Before this date, in fact, each Member State was individually responsible for security legislation relating to air transport.

On 10 October 2001, a month after the tragic events of New York and Washington, the Commission, on the initiative of the European Parliament, proposed the adoption of a common Regulation in the field of security. This Proposal resulted in the adoption of Regulation (EC) No 2320/2002 of 16 December 2002, which was implemented at European Union airports from 19 January 2003. This Regulation, no longer in force today, is of fundamental importance since it made, for the first time, the control procedures on passengers and their baggage in airport access areas uniform under common aviation security rules. (2, p 59) In 2005 the Commission proposed a new Regulation to replace Regulation (EC) No 2320/2002, which aimed at strengthening while at the same time simplifying and harmonizing the procedures provided for in the original provision. This was also prompted by the fact that in the over 40 unannounced inspections carried

out in Member States' airports as from February 2004, serious shortcomings in security systems were discovered. Three years after this Proposal was presented, Regulation (EC) No 300/2008 was adopted. This Regulation introduced a series of new measures aimed to improve, streamline and simplify existing procedures. The new Annex to Regulation (EC) No 300/2008 is divided into 12 parts. The provisions are summarized below:

1. Aircraft Security. Regarding aircraft security Annex I to the Regulation provides that all aircraft, before departure, must be subjected to a security check or security search in order to ensure that no prohibited articles are present on board. Moreover, all aircraft will also have to be protected from any unauthorized interference. Further ad hoc measures may be implemented for aircraft in transit.

2. Airport Security. The Regulation provides for compliance with certain requirements in the planning and in the construction of new airports or the alteration of existing ones. The following must be provided at airports: (a) landside; (b) airside; (c) security-restricted areas; (d) critical parts of security-restricted areas. Access to security-restricted areas, critical parts, and airside must be controlled at all times so that no unauthorized persons may enter them. The Regulation also provides for the random screening of persons other than passengers, such as flight crew members, and providers of services, such as cleaning services and others having access to aircraft, and on items carried by them, before being cleared to enter security-restricted areas and critical parts thereof.

3. Air Carrier Mail and Air Carrier Materials. Air carrier mail and air carrier materials mean internal shipments of mail and materials such as, but not limited to: documents, supplies, maintenance spare parts, cleaning and catering supplies and other items to be delivered to the air carrier organization itself or to one of its subcontractor organizations, for limited use to the carrier's operations. These will also have to be subject to security controls and protected until loaded onto the aircraft.

4. Hold Baggage. The Regulation provides for the pre-emptive screening of each item of luggage before being loaded onto aircraft. As in provisions on screening cabin luggage, the Regulation provides for exceptions in this case, too. These include where the luggage remains on board the aircraft, or if it arrives from a Member State (unless according to the Commission or that Member State it cannot be considered as having been screened to the common basic standards), or it arrives from a third country where the security standards applied are recognized as equivalent to the common basic standards. Moreover, the Regulation emphasizes the duty to protect such baggage from unauthorized interference from the point at which it is screened or accepted into the care of the air carrier until the departure of the aircraft on which it is to be carried.

5. Airport Supplies. The obligation to be subject to security control is also required for all supplies intended to be sold in security-restricted areas of airports, including supplies for duty-free shops and restaurants.

6. In-flight Security Measures. Annex I to Regulation (EC) No 300/2008, without prejudice to the applicable aviation safety rules, prohibits unauthorized persons from entering the flight crew compartment during a flight and provides for the implementation of appropriate security measures against potentially disruptive passengers. Moreover, weapons (with the exception of those carried in the hold) cannot be carried on board an aircraft, unless authorization has been given by the states involved and the required security conditions have been fulfilled, in accordance with national laws. This last provision also applies to 'in-flight security officers'.

7. Staff Recruitment and Training. In addition, there are requirements to be complied with in the recruitment and training of staff responsible for implementing the above-mentioned security controls. The Regulation requires in addition to adequate selection and training that there should be, where appropriate, a certificate issued attesting to the level of training achieved and the kind of duties capable of being undertaken. The Regulation thus requires that training be conducted on an initial and recurrent basis by instructors with the necessary qualifications.

8. Demarcated Areas. The Regulation is very clear that, as regards placing or parking of aircraft within demarcated areas of airports, any aircraft to which common air security standards under Article 4(4) do not apply must be kept separate from aircraft to which the common basic standards apply in order to ensure that minimum security standards are not compromised.

9. Passengers and Cabin Baggage. This is one of the most sensitive aspects of rules on air transport security in view of the fact that instances of unlawful interference in the last years were made possible not least because there were gaps or even failings in control systems which allowed the introduction into security restricted areas and in particular airside, of forbidden and dangerous items.

10. In-flight Supplies. The latter will also be subject to all security controls necessary to avoid prohibited articles from being introduced in the supplies and provisions to be taken on board an aircraft.

11. Cargo and Mail. Cargo and mail are also to be subjected to a series of security controls prior to being loaded on an aircraft. An important provision is a prohibition on air carriers accepting cargo to transport unless they have applied such controls themselves, or unless their application 'has been confirmed and accounted for by a regulated agent, a known consignor or an account consignor'. Annex I to Regulation (EC) No 300/2008 thus provides for the possibility of alternative security controls for transfer cargo and mail provided they be detailed in a specific implementing act. There is no exemption from such controls unless transit cargo and mail remain on board the aircraft.

12. Security Equipment Annex I to Regulation (EC) No 300/2008 provides for adequate equipment to be used for security controls. The specifications of said equipment must comply with the defined criteria. (2, p 71)

The European Commission adopted Implementing Regulation (EU) 2015/1998 in November 2015. It establishes comprehensive procedures for implementing these security standards and repealed a previous regulation (Regulation (EU) No 185/2010) that had been revised more than 20 times.

**European Aviation Safety Agency.** European Union has a long tradition in rulemaking cooperation in aviation safety, with the first common standards developed around 1990 within the framework of the currently no longer existing Joint Aviation Authorities (JAA). At that time, the European aviation safety authorities collaborated in the development of the Joint Aviation Requirements (JAR) and related procedures, initially in the field of aircraft manufacturing and design, and later also in respect of flight operations, maintenance and crew licensing.

In 2002, the EU introduced the first set of new generation aviation safety rules based on Regulation (EC) No 1592/2002, which also created the EASA as the backbone of the European aviation safety system. The creation of this agency became necessary because of the significant problems that the JAAs encountered in carrying out their tasks. The immense restrictions under which the JAAs had to work, including because it lacked the power to have its Regulations immediately implemented and had no autonomous certifying power (which was still the preserve of the individual national authorities), demonstrated the need for new authority, at the Community level, endowed with wide regulating and certifying powers. (1)

In September 2000 the Commission proposed the institution of a 'Community Agency' which, having regard to the principle of subsidiarity, was to have all the necessary powers in the field of air safety whenever and wherever collective action was preferable to action at individual State level. This proposal resulted in the enactment of Regulation (EC) No 1592/2002 (currently Regulation (EC) No 216/2008) and in the establishment of the European Aviation Safety Agency. Established on the basis of the Regulation (EC) 1592/2002, EASA builds on the experiences and cooperation of the former group of European aviation regulators, known as the Joint Aviation Authorities, which ceased its activities in July 2009. It is a pan-European body, having a legal personality which, since 28 September 2003, functions as a one-stop-shop for the certification of airworthiness and safety for all aeronautical products. After a further transitional period of 42 months, it took over the functions and assignments of the Member States and the activities of the JAAs, that is to say, it replaced the National Aviation Authorities. As a result of this, from 28 June 2008, all JAR-OPS were substituted by the EU-OPS (with Regulations issued by EASA), and in 2009 the functions of the JAA agency were completely taken over by the European Aviation Safety Agency. (5)

This Regulation, the 'basic Regulation', was subsequently repealed and substituted by Regulation (EC) No 216/2008 which, in many important respects is immensely innovative.

Accordingly, the Union Agency EASA, based in Cologne, was given specific regulatory and executive duties in the matter of air safety. In particular, it gives professional advice to the European Union on the drawing-up of Regulations and on the conclusion of international agreements on air safety; on the other, it carries out operative tasks that were formerly the prerogative of the aeronautical authorities of the Member States, such as issuing type-certifications of aeronautical products and the emission of airworthiness certificates. The Agency's functions have then been further extended by the adoption of Regulation (EC) No 1108/2009, extending them to the field of aerodromes, air traffic management, and air navigation safety services. This regulation was implemented by the adoption of Commission Regulation (EU) No 139/2014 on 12 February 2014, and its provisions became applicable from 6 March 2014. Furthermore, to ensure the uniformity of the application of rules in force in the various Member States, Regulation (EC) No 736/2006 of 16 May 2006 established the working methods of the European Aviation Safety Agency for conducting standardization inspections of Member States' competent authorities according to the general rules under Article 16(1) and Article 45(1) of Regulation (EC) No 1592/2002. In this context, EASA has started a

standardization sample inspection program, carried out by means of a team of experts, with the aim of checking the level of conformity maintained by the Member States; this is both in the organization of State agencies, and aeronautical industries. These inspections are on a 2-year basis and concern the totality of activities regulated by the Agency. The results are then communicated to the Commission and, should there be any irregularities, the latter may decide to initiate infringement proceedings under EU law (Article 258 TFEU).

The Agency's executive director has the power to make decisions that are immediately applicable in the Member States. The 'Implementing rules' (IRs) are to be found in Community Regulations and consist of a number of provisions that establish the scope of the rules, their methods of implementation, the date of their entry into force, and the transition periods with the existing law. (2, p 17)

## References

1. Olga Mironenko Enerstvedt, "Aviation Security, Privacy, Data Protection and Other Human Rights: Technologies and Legal Principles", Springer International Publishing AG 2017
2. Francesco Rossi Dal Pozzo, "EU Legal Framework for Safeguarding Air Passenger Rights", Springer International Publishing Switzerland 2015
3. Official Journal of the European Union, C 326, 26 October 2012, p. 59.
4. https://www.aeronewstv.com/en/lifestyle/in-your-opinion/3000-safety-and-security-whats-the-difference.html
5. https://www.skybrary.aero/index.php/European_Union_Aviation_Safety_Agency_(EASA)

**Rəyçi: h.f.d. N.Fərziyeva**

Göndərilib: 05.04.2021 Qəbul edilib: 06.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/301-304

**Murad Etibar oğlu Sırafilov**
Azərbaycan Respublikası Dövlət Gömrük Komitəsi Akademiyası
magistrant
srafilov.murad@mail.ru

# TİCARƏTİN KOMMERSİYA PROSEDURLARININ SADƏLƏŞDİRMƏ VASİTƏSİ KİMİ BEYNƏLXALQ İNKOTERMS QAYDALARI 2000, 2010 VƏ 2020 FƏRQLƏRİ

***Açar sözlər***: *beynəlxalq ticarət, kommersiya proseduru, İnkoterms, termin, sadələşdirmə*

**International Incoterms Rules as a means of simplifying commercial procedures of trade Differences between 2000, 2010 and 2020**

**Summary**

In a globalized society, the economic integration of states and the expansion of foreign trade relations have led to increased attention and control over agreements in this area. Inappropriate drawing up of contracts will lead to long and costly cases between the parties in any dispute over the provisions. For this reason, in drafting these agreements, States must use standards that do not constitute a heavy responsibility for these parties and that the parties mutually agree on the risk of liability and loss by referring to what they want from these standard rules. These standards are known as incoterms. Also called International Commercial Terms. This study will provide an in-depth look at the differences between previous versions 2000 and 2010 of INCOTERMS 2020 and discuss the general meaning of these terms (International Commers Terms) used to refer to trade agreements with commercial entities.

***Key words***:*international trade, commercial procedure, Incoterms, term, simplification*

İncoterms-in məqsədi ticarət terminlərinin vahid standart təfsirini yaratmaq və beynəlxalq qaydalar toplusunu işləyib hazırlamaqdır. Təfsir barədə vahid standartın olması həmin terminlərin başqa ölkələr arasında fərqli təfsir fərqlərinin olmaması məqsədini güdməkdədir. Belə ki, ticarət subyektlərindən biri bu terminə istinad edərsə digər tərəfin ölkəsində bu terminin hansı cür təfsir edilməsi barədə məlumata sahib olmayacaqdır. Belə olduqda mübahisələr və anlaşılmazlıqlar əmələ gələr, trəəflər üçün vaxt və pul sərfiyyatına gətirib çıxaracaqdır. Nəticədə bu qəbildən olan mübahisələrin qarşısını almaq məqsədilə INCOTERMS (international commercial terms-beynəlxalq ticarət sövdələşməsi) ideyası ilk dəfə 1921-ci ildə Beynəlxalq Ticarət Palatası (BTP) tərəfindən irəli sürülmüşdür. BTP-nin mütəxəssisləri tərəfindən hazırlanan İNCOTERMS-in ilk versiyası 1936-ci ildə dərc olunmuş və təxminən 20 il qüvvədə qalmışdır. 1963, 1967, 1976, 1980, 1990, 2000 və 2010-cu illərdə sənədə bəzi əlavə və dəyişkiliklər edilmişdir. Sənədin ən son versiyası olan "İNCOTERM 2020" 1 yanvar 2020-ci il tarixindən etibarən qüvvəyə minmişdir. (4)

Məhsulların satışı və çatdırılması üzrə imzalanan xarici və yerli müqavilələr çərçivəsində tərəflərin müvafiq öhdəlikləri, o cümlədən xərc və risklərin müəyyənləşdirilməsi ilə əlaqədar qəbul olunmuş beynəlxalq standartlardan ibarətdir. Bu qaydalar məhsulun satıcıdan alıcıya çatdırılması zamanı qeyd olunan məsələlər üzrə tərəflər arasındakı münasibətləri tənzimləyir. BMT-nin Beynəlxalq Ticarət Qanunu üzrə Komissiyası (UNCİTRAL) İNCOTERMS-in qaydalarını qlobal standart kimi tanımışdır. (2, 42)

İncoterms beynəlxalq saziş deyildir. Lakin ticarət zamanı bağlanılan kommersiya əqdlərində bu terminlərə istinad edildiyi təqdirdə istər gömrük orqanları, istər məhkəmə orqanları mütləq şəkildə İncoterms-i nəzərə almalıdır. İNCOTERMS qaydaları müqavilə demək deyil. Bu qaydalardan məhsulların satışı və təyinat məntəqəsində çatdırılması üzrə imzalanan müqavilələrdə istifadə olunur. Bu qaydalar hüquqi baxımdan ölkədaxili müvafiq qanunlardan üstün deyil və mülkiyyət hüququnun ötürülməsi, ödəniləcək məbləğ, valyuta və ya kredit şərtlərini tənzimləmir. Hətta bir neçə ölkənin daxili qanunverciliyi ilə İncoterms hüquqi qüvvəyə malik olmaqla mal alqı-satqısı zamanı mütləq şəkildə imperativ qaydalar olaraq nəzərə alınmalıdır. (5)

«Incoterms»də tərəflərin bir sıra öhdəlikləri, məsələn, satıcının malı birbaşa alıcıya yaxud daşınmaq üçün daşıyıcıya təhvil verməsi, təyinatı üzrə çatdırması şərtləri, bu zaman tərəflərin üzərinə düşən öhdəliklər və qəbul etdiyi risklər, müvafiq öhdəliklərin yerinə yetirilməsinin sübut edilməsi üsulları, malların ixracı və idxalı üzrə gömrük vergi və rüsumlarının, malların qablaşdırılması, sığorta və daşınma xərclərinin hansı tərəfin ödəməsi, lisenziyaların alınmasını hansı tərəfin təmin etməsi, satıcının malı alıcıya təhvil verdiyi

məqam, malların məhvi yaxud xarab olması riskinin satıcıdan alıcıya ötürüldüyü an, satıcının mal göndərişləri üzrə öhdəliklərini nə vaxt tam yerinə yetirdiyi əks olunmuşdur. (6)

«Incoterms»də malların qiyməti və dəyərinin ödənilməsi üsulu, mal üzərində mülkiyyət hüququnun keçməsi, müqavilənin pozulmasının nəticələri tənzimlənmir. Bu məsələlər adətən, alqı-satqı müqaviləsində yaxud bu cür müqaviləyə tətbiq olunan hüquqda əksini tapır. Həmçinin, nəzərə almalıdır ki, müqabil tərəfin ölkəsinin milli qanunları alqı-satqı müqaviləsinin hər hansı müddəasına, o cümlədən seçilmiş «Incoterms» termininə münasibətdə üstünlüyə malik ola bilər.

Alqı-satqı müqavilələrinin yerinə yetirilməsi üçün müstəsna əhəmiyyətə malik olsa da, «Incoterms» bu müqavilələrlə bağlı bir sıra problemləri, məsələn, mülkiyyət və digər hüquqların ötürülməsini, müqavilə şərtlərinin pozulmasının nəticələrini, müxtəlif səbəblər əsasında və bəzi vəziyyətlərdə tərəflərin məsuliyyətdən azad olunmasını əhatə etmir. Bu məsələlər alqı-satqı müqaviləsinin digər şərtləri əsasında və tətbiq olunan qanunvericilikdə həllini tapmalıdır. (1, 5)

## İnkoterms 2000

2000-cu ildən sonrakı düzəlişə görə İncotermslər 4 fərqli kateqoriyada (E, F, C, D) qruplaşdırıldı və 13 fərqli risk paylanmasında (EXW, FCA, FAS, FOB, CPT, CIP, CFR, CIF, DAF, DES, DEQ, DDU, DDP) təsnif edildi. E və F qruplarında satıcının öhdəlikləri minimaldır. İşin əksəriyyətini alıcı edir və riskin çox hissəsini alır. Satıcının C qrupuna keçdikcə öhdəlikləri daha da genişləndikcə alıcının üzərinə düşən risk azalır. D qrupuna keçdiyimiz zaman satıcının öhdəlikləri ən çox təşkil edir və maksimum risk alır. Satıcı üçün ən riskli çatdırılma növləri D qrupundadır. Bu 13 termin iki əsas kateqoriyaya bölünür: "bütün nəqliyyat növlərini əhatə edən" və "yalnız dəniz və daxili su nəqliyyatını əhatə edən"

FAS FOB CFR CIF DES DEQ ancaq dəniz və çay nəqliyyatı ilə daşımalarda istifadə edilən terminlərdir.

E qrupu - Bu qrupa yalnız EXW (Ex Works-Delivery on work) daxil edilmişdir. Bu çatdırılma metodu satıcının ən az məsuliyyət daşıdığı metoddur. Satıcı ümumiyyətlə malları öz iş yerlərində (emalatxanada, anbarda, fabrikdə və s.) çatdırmaq öhdəliyini alıcının sərəncamına verməklə yerinə yetirir. Alıcı, malların bu nöqtədən təyinat məntəqəsinə daşınması ilə bağlı bütün xərclər və risklərə görə məsuliyyət daşıyır. Başqa sözlə, bütün nəqliyyat, yükləmə, boşaltma və sığorta xərcləri çatdırılma tarixindən etibarən alıcıya məxsusdur. Bu çatdırılma üsulu, alıcının və ya onun təyin etdiyi daşıyıcının gömrük rəsmiləşdirmə prosedurlarını həyata keçirə biləcəyi hallarda istifadə edilməlidir.

F qrupu - Bu qrupun çatdırılma üsullarında satıcı malları alıcının müəyyən etdiyi daşıyıcıya çatdırmaq məcburiyyətindədir. Bu qrupda çatdırılma üsulları: FCA, FAS, FOB

C qrupu - Satıcı C qrupu çatdırılma növlərində nəqliyyat müqaviləsi bağlamaq məcburiyyətində olsa da, satıcı nə itki və ziyan riskini, nə də yükləndikdən sonra yarana biləcək əlavə xərcləri öz üzərinə götürür. Bu çatdırılma metodları qrupunda satıcı malların daşınması üçün müqavilə bağladığı daşıyıcıya çatdırılmasından məsuldur. Nəqliyyat xərcləri və əgər varsa sığorta xərcləri satıcı tərəfindən ödənilir.

D qrupu - D qrupu çatdırılma üsulları satıcı üçün ən məsuliyyətli çatdırılma metodudur. Satıcı malların təyinat ölkəsinə daşınması ilə bağlı bütün xərclərdən və risklərdən cavabdehdir. D qrupu çatdırılma formaları E qrupunun əks qütbünü təşkil edir. D qrupunda satıcı sərhəddə və ya idxal olunan ölkə daxilində razılaşdırılmış yerə gələn mallara görə məsuliyyət daşıyır.

Göstərdiyim bu qruplar 13 termini özündə təsnif etməklə İnkoterms 2000 olaraq formalaşmışdır. 2010-cu il yenilənməsinə qədər istifadə olunmaqda idi. 10 il sonra 2010-cu il dəyişikliyi ilə İnkoterms 2010 qüvvəyə minmiş və qruplar eyni olaraq qalsa da terminlər arası müəyyən fərqlər mövcud olmuşdur.

## İncoterms 2010

Yeni redaksiyada qeyd etdiyim kimi 13 termin sayı ixtisar olunmuş 11 termin olaraq müəyyən edilmişdir. İki yeni termin əlavə olunub və 4 termin təcrübədə az istifadə olunduğu üçün ləğv edilmişdir. DAP (Delivered at Point) – "təyinat məntəqəsinə çatdırılma" və DAT (Delivered at Terminal) – "terminala çatdırılma" əlavə edilmişdir. DAF (Delivered at Frontier Arrival ... (named place) – "sərhəddə çatdırılma", DES (Delivered Ex Ship... (named port of destination) – "gəmidə çatdırılma", DEQ (Delivered Ex Quay... (named port of destination) – "körpüdə çatdırılma" DDU (Delivered Duty Unpaid... (named place of destination) – "rüsum ödənilmədən çatdırılma" terminləri ləğv olunmuşdur. (3, 158)

DAT termini DEQ terminini əvəz edir və bu halda, mallar alıcının sərəncamına nəqliyyat vasitəsindən boşaldılmadan verilir. DAP termini əvvəlki DAF, DES və DDU terminlərini əvəz edən ümumi qaydadır. Bu qaydaya əsasən mal alıcının sərəncamına nəqliyyat vasitəsindən boşaldılmaq üçün hazır vəziyyətdə verilir. Bu termindən istifadə olunduqda, təyinat yerinin dəqiq göstərilməsi çox vacibdir. DAT terminə əsasən mal razılaşdmlmış yerdə nəqliyyat vasitəsindən boşaldılmadan alıcının sərəncamına verilir (əvvəlki DEQ

terminində olduğu kimi). DAP termini isə, mal alıcının sərəncamına razılaşdırılmış yerdə, amma boşaldılmağa hazır vəziyyətdə (əvvəlki DAF, DES və DDU terminlərində olduğu kimi) verilir. Göstərilən yeni qaydalann tətbiqi nəticəsində «Incoterms 2000»də olan DES və DEQ termləri ləğv edilmişdir. (1, 6)

FOB (Free on Board... (named port of shipment) - Franko-göyərtə... (yüklənmə limanı göstərilmişdir); CFR (Cost and Freight. Main carriage paid... (named port of destination) - Dəyər və Fraxt. Əsas daşınma xərcləri ödənilmişdir... (göstərilmiş təyinat limanı) və CIF (Cost, Insurance and Freight... (named port of destination - Dəyar, Sığorta və Fraxt... (göstərilmiş təyinat limanı) mal göndərişi şərtlərində xərclər və risklər yeni qaydada müəyyənləşdirilir. «Incoterms-2000»də bu üç şərtdə risk malın gəmi göyərtəsinə çatdırıldıqdan sonra ötürülürdüsə, «Incoterms 2010» da risklərin bir tərəfdən digərinə keçməsi, mal bütövlüklə gəmi göyərtəsinə yükləndikdən sonra baş verir. (7)

Bütün bu fərqlər İncoterms 2010 formatıyla təsdiqlənib və 10 il müddətinə istifadəyə verilmişdir. Sonuncu dəyişiklik İncoterms 2020 1 yanvar 2020-ci ildən qüvvədədir. Müasir tələblərə cavab verən xüsusilə də elektron ticarəti tənzimləyən bu qaydalar əvvəlki redaksiyaların tətbiqi zamanı yaranan problemlərin həlli üçün yeni dəyişikliklər təklif etmişdir.

**İncoterms 2020**

FCA təslim növü ilə əlaqəli dəyişiklik:

- İncoterms 2000-ci il qaydalarına görə terminlər iki cür daşıma növlərində istifadə olunurdu. FCA yalnız quru daşımalarına aid edilirdi. İncoterms 2020-yə görə isə u və ya quru daşımları ilə bağlı olaraq 2 yerə ayrılmışdır.Yəni hər iki daşıma növündə istifadə olunması nəzərdə tutulmuşdur. Əgər su daşımalarında FCA istifadə olunarsa, malın daşınması ilə bağlı risklər satıcıdan alıcıya limanda təhvil verildikdən sonra keçir. Quru daşımalarında isə satıcının öz ölkəsindəki alıcı tərəfindən təyin edilmiş daşıyıcıya təhvil verdikdən risklər alıcıya keçir. Digər yandan konosamentlə bağlı məsələ daşıyıcının məsuliyyətində idi. Yəni əgər daşıyıcı konosamenti tərtib etməz idisə bu zaman daşıyıcıya görə məsuliyyəti artıq satıcı daşımırdı. Lakin yeni qaydalara görə satıcı mütləq şəkildə konosamenti tələb etməlidir. Alıcı isə daşıma riskini özü daşımaqla bərabər, konosamentin daşıyıcı tərəfindən satıcıya təslim edilməsini satıcı ilə müqaviləyə şərt olaraq əlavə edə bilərlər. Yəni alıcı özü də mütləq şəkildə konosamentlə bağlı nəzarəti həyata keçirməlidir. (8)

DAT təslim növü ilə əlaqəli dəyişiklik:

-DAT (Delivered at Terminal) sadecə terminalda təslim yox,limanda istənilən yerdə təslim olaraq dəyişdirilmişdir. DPU (Delivered at Place Unloaded) olaraq yenidən adlandırılmışdır. Yəni malın boşaldılacağı yer təslim yeri olaraq müəyyən edilmişdir. İncoterms 2010-a görə DAT (Delivered at Terminal) - Satıcının maksimum riski üzərinə götürdüyü çatdırılma növlərindən biridir. Satıcı öz ölkəsindəki vəzifələri yerinə yetirir, daşıyıcını seçir və alıcı ilə əvvəlcədən razılaşdırılmış malları (dok, anbar, konteyner həyəti, dəmir yolu, hava yükü və ya yol stansiyası kimi) sınaqdan keçirir. Malların alıcıya çatdırılması üçün tələb olunan göndərmə xərcləri satıcıya aiddir. Satıcı bu müddətdə yarana biləcək zərər və xərclərdən cavabdehdir. İncoterms 2020də isə DAT- DPU (Delivery at Place Unloaded) – "limanda müəyyən edilmiş yerə qədər daşıma" termini ilə əvəz edilmişdir. (9)

***FCA, DAP, DPU, DDP təslim növü ilə əlaqəli dəyişiklik:***

İncoterms 2020-ə qədər olan redaksiyalarda daşıyıcı olaraq 3-cü tərəf müəyyən edilirdi. Belə olduqda daşıyıcının təqsiri səbəbi ilə alıcı və ya satıcı əlavə zərərə uğrayırdı. İndi isə daşıyıcı alıcı və ya satıcının özü ola bilər və daşıma öz nəqliyyat vasitəsilə həyata keçirilə bilər. Belə olduqda yaranan təqsir iki tərəfdən birinə görə olacaq və tərəflərin mübahisədə tərəf müqabili yalnız iki tərəf olacaqdır. Belə olduqda 3-cü tərəfə qarşı yaranacaq iddia icraatı mübahisənin uzanmasına və əlavə xərclərə səbəb olardısa, hal-hazırda belə problemlərin qarşısı alınmışdır. (10)

***CIF ve CIP təslim növü ilə əlaqəli dəyişiklik:***

Bildiyimiz kimi İnkoterms terminlərinin C qrupu tərəflərə sığorta barədə əlavə öhdəliklər verməsi ilə seçilirdi. Yəni tərəflər bu qrupun terminlərindən birinə istinad etməklə malın daşınması ilə bağlı digər xərclərlə müqabil sığorta olunma və xərcləri də öhdəlik olaraq müəyyən edə bilirlər. 2010-da bu təslim növlərində sığorta polisi (Sığorta polisi sığorta şirkəti tərəfindən sığortalıya verilən rəsmi müqavilə sənədidir) (11). Minimum girovla hazırlanırdı. İnkoterms 2020-də isə CIF üçün "Clauses (C) of the LMA/ IUA Institute Cargo Clauses" minimum sığorta haqqı müəyyən olundu. CIP üçün isə "Clauses (A) of the Institute Cargo Clauses" yəni tüm risklər daxil olmaqla sığorta haqqının da verilməsi şərti əlavə olundu. Qısası ilə iki təslim növü üçün sığortanın ağırlıq dərəcəsi fərqləndirildi. (12)

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/346-349

**Elvin İsmayıl oğlu Cəfərov**
Bakı Avrasiya Universiteti
magistrant
elvin.cfrov.97@mail.ru

# AZƏRBAYCANIN TURİZM POTENSİALI VƏ İNKİŞAF İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *turizm, turizm potensialı, turizmin inkişaf istiqamətləri*

## Tourism potential and development directions of Azerbaijan

**Summary**

Tourism accelerates the development of road and hotel infrastructure, has a strong impact on the protection of folk art and national cultures in the regions and villages.

Today, we can proudly say that our state is carrying out a number of important activities to accelerate the development of tourism, to bring the country's domestic tourism potential to the world market, as well as to attract foreign tourists to our beautiful corners. Purposeful state policy implemented in this direction in order to accelerate the development of tourism in our country, the steps taken cause a greater influx of tourists to Azerbaijan from around the world than in previous years.

***Key words:*** *tourism, tourism potential, tourism development directions*

## Giriş

Azərbaycanın təbii sərvətləri, rəngarəng iqlimi, zəngin tarixi-mədəni irsi turizmin inkişafına və ölkəyə daha çox turistin cəlb edilməsinə imkan yaradır. Turizm sahəsi həm regionların inkişafı, həm də ölkənin iqtisadi potensialının möhkəmlənməsi, Azərbaycanın imici, dünyaya inteqrasiyası üçün çox mühüm bir vasitədir.

Turizmlə bağlı ölkənin inkişaf strategiyası ümumilikdə iqtisadiyyatının gücləndirilməsinə böyük töhfə verir. Son illər turizm sahəsində, ilbəil ölkəyə gələn turistlərin sayında dinamika müşahidə edilir. 2019-cu ilin yanvar-sentyabr aylarında Azərbaycana dünyanın 191 ölkəsindən 2.4 milyon xarici qonaq gəlib ki, bu da keçən ilin eyni dövrü ilə müqayisədə 9.6% çoxdur. Bu, göstərir ki, turizm sahəsində stabil və dinamik inkişaf var.

## Təhlillər

Azərbaycanın turizm potensialı ilə tanınan və hər il yüzlərlə, minlərlə insanın istirahətə gəldiyi regionlarından biri Xaçmazdır. Uca dağları, Xəzər dənizi sahili boyunca uzanan geniş meşələri, zəngin təbiəti, özünəməxsus mətbəxi baxımından bu rayon turistlər üçün çox cəlbedicidir.

Rayon əhalisinin başlıca gəlir mənbəyi də əkinçilik və turizmdir. Nabran-Yalama-Xudat yolu boyu ilin hər fəsillərində təzə meyvə-tərəvəzə rast gəlmək mümkündür. Rayonda ev şəraitində hazırlanmış müalicəvi əhəmiyyətli meyvə şirələri və içkiləri məşhurdur. Alman səyyahı Adam Oleari 1636-1638-ci illərdə Azərbaycana səfərindən bəhs edən zaman Xaçmazda içdiyi müxtəlif meyvə şirələrini xüsusilə qeyd etmişdi (2., s.69).

Xaçmaz rayonunun coğrafi mövqeyi onu Azərbaycanın ən məşhur turizm məkanlarından birinə çevirib. Burada daha çox çimərlik turizmi inkişaf edib. Rayon mərkəzindən çox uzaq olmayan Nabranın adını eşidəndə adamın gözləri önünə birinci olaraq dəniz ilə çimərliklər gəlir. 1960-cı illərdən bəri müxtəlif dövlət müəssisələrinin həmkarlar ittifaqları burada işçiləri üçün istirahət evləri tikməyə başlamışdılar. Hal-hazırda isə Nabran kəndi gözəl təbiəti, qonaqpərvərliyi ilə bərabər, yüksək standartlara cavab verən turizm məkanları ilə tanınır.

Nabrandan 6 km aralıda Tel kəndi yerləşir. Bu kəndin ərazisi ov həvəskarları üçün əla tapıntıdır. Kənddən bir qədər kənarda palçıq vulkanı var. Sakinlərin dediyinə görə, vulkanın palçığı müxtəlif xəstəliklərinin dərmanıdır.

Xaçmaz rayonunun Mədəniyyət və turizm şöbəsinin müdiri Nazim Ağayevin dediyinə görə, rayon ərazisində eyni zamanda 1600-dək insanı qəbul etməyə imkan yaradan 40 turist yerləşdirmə obyekti, 1 üçulduzlu, 3 dördulduzlu hotel fəaliyyətdədir. 2019-cu ildə rayona 19 minədək turist gəlib. Onlar əsasən istirahət-əyləncə və müalicə turizminə üstünlük verənlərdir (4).

Qəbələ rayonu Azərbaycanın şimal-qərbində, Şəki-Zaqatala iqtisadi zonasında, Dağıstan və Gürcüstan ilə sərhəddə yerləşir. Rayon qoz, fındıq və şabalıd bağları ilə məşhurdur. Dağ yamaclarında, dəniz səviyyəsindən 1000 metrdən yüksəklikdə yerləşən tanınmış şabalıd meşələrindəki ağacların hər birinin orta

yaşı 500 ildən artıqdır. Bu ağaclardan bəziləri dövlət tərəfindən qorunan təbii abidələr siyahısına daxil edilib. Respublikanın ən uca zirvəsinə - Bazardüzü dağına (dəniz səviyyəsindən 4466 m yüksəklikdə) gedən alpinist marşrutlarından biri bu rayonun ərazisindən keçir.

Rayonun ərazisində çoxlu qədim tarix, mədəniyyət və memarlıq abidələri var. Əmirli kəndindəki Alban məbədi (IV əsr), Nic kəndindəki Hacı Qərib məscidi və Çotari alban kilsəsi, Həzrə kəndindəki Şeyx Bədrəddin və Şeyx Mənsur türbələri (XV əsr), Şəfili kəndindəki məqbərə (XVII əsr), Həmzəlli Şıxbaba piri (XVI əsr) və digər abidələr Qəbələ rayonunda mədəni turizmin inkişafı üçün mühüm zəmin yaradır (7., s.37).

Rayonda turistlərin yerləşdirilməsi üçün beynəlxalq standartlara cavab verən turizm infrastrukturu vardır. Son zamanlarda rayonda yeni turizm kompleksləri, ən yüksək standartlara cavab verən istirahət mərkəzləri inşa edilir. Bu isə həm əcnəbi, həm də yerli turistlərin Qəbələyə marağını daha da artırır. İstirahətini Qəbələdə keçirmək və rayonla daha yaxından tanış olmaq istəyən insanların sayı hər il artır. Turistlər Qəbələnin ekzotik təbiəti ilə təmasda olmaq, yerli mətbəxin ləziz nümunələrindən dadmaq, müxtəlif mədəniyyət nümunələri ilə tanış olmaq məqsədilə bu gözəl məkana gəlirlər.

Naftalan. Xam nefti ilə tanınır və bölgədəki sağlamlıq turizminin aparıcı aktyorlarından biridir. Müəssisəyə gələnlər yağla yuyulur və bəzi xəstəlikləri yaxşılaşdırırlar. Müəssisədə spa kimi digər üsullarla müalicə ala bilərsiniz (1., s.24).

Qobustan. İngiltərədəki Stonehenge-in Azərbaycandakı versiyası olduğunu deyə bilərik. Əldə edilən tapıntılar tarixə qədərki dövr haqqında çox ətraflı məlumat verir. Mağara və qayalara, məzar daşlarına və yaşayış yerlərindəki xarabalıqlara çəkilən rəsmlər arxeoloji suallara cavab verə bilər (1., s.28).

Masallı rayonu relyefinə və təbiətinə görə Azərbaycanın səfalı və füsunkar guşələrindən biridir. Rayonun bir tərəfi qədim Talış dağları və meşələri ilə, bir tərəfi Xəzər dənizi ilə əhatə olunub. Bütün bunlar bölgədə turizmin inkişafı üçün gözəl zəmin yaradır. Hələ yüz illər öncə ətraf bölgələrdən və uzaq diyarlardan gələn insanlar Masallıda yer altından çıxan qaynar sulardan müalicə məqsədilə istifadə ediblər.

Turizm üçün əlverişli təbii şəraitə malik rayonda beynəlxalq standartlara cavab verən istirahət mərkəzləri, turist yerləşdirmə obyektləri var. Masallı rayon Mədəniyyət və turizm şöbəsinin müdiri Lətifə Mövsümova rayon ərazisində 1400 yerləşdirmə yeri olan 26 turist obyektinin fəaliyyət göstərdiyini bildirdi.

2019-cu ildə rayona 10 minədək turist gəlib ki, onların da 4-5 faizini əcnəbilər təşkil edib.

Şirvan Milli Parkı. 2003-cü ildə rəsmi olaraq qorunan Şirvan Milli Parkı, Xəzər dənizinin yaxınlığında yerləşir. Bakının cənubunda 54.000 hektar ərazini əhatə edir. Milli parkda yarı səhra mənzərələrinə rast gəlmək olar. Ceyran, kirpi, qu quşu və flaminqo kimi heyvanları da yaxından görə bilərsiniz. Palçıq vulkanları parkda da yaygındır. Ən məşhuru Bandovan dağıdır. Avantüristlər üçün parkın şimal hissəsində düşərgə sahələri yaradılıb (3.,s.16).

Azərbaycanın turizm üçün əlverişli olan dilbər guşələrindən biri də İsmayıllı rayonudur. Böyük Qafqazın cənub ətəklərində yerləşən İsmayıllı ərazisində tariximizin qədim dövrlərinin izləri qalmaqdadır. Rayonda müxtəlif sənətkarlıq növləri yüksək inkişaf edib ki, bu da İsmayıllını turistlər üçün maraq obyektinə çevirib.

Rayonun dəniz səviyyəsindən 2500 metr yüksəklikdə yerləşən Lahıc kəndi sənətkarları ilə məşhurdur. XIX əsrin ortalarında Lahıcda 200-dək misgərlik emalatxanası fəaliyyət göstərib. Vaxtilə Lahıc ustalarının yüksək sənətkarlıqla düzəltdikləri odlu və soyuq silahlar əl-əl gəzib. XIX əsrin birinci yarısında Rusiyanın İjevsk silah zavodunda Lahıc ustalarının təcrübəsindən istifadə olunmuşdu. O dövrdə Lahıcda 100-dən artıq sənət növü - misgərlik, dabbaqlıq, çəkməçilik, papaqçılıq, sərraclıq, dəmirçilik, həkkaklıq, qalayçılıq, dulusçuluq, dərzilik və sair peşələr inkişaf tapmışdı (6., s.106).

1980-ci ildən muzey-qoruğa çevrilən Lahıcda həmin illərdən yadigar qalan məhəllə məscidləri, Girdiman qalası qorunan tarixi abidələr siyahısındadır. Saf havası, suları can dərmanı olan dağ kəndi Lahıcda turizm mərkəzinin yaradılması zəruridir (3., s.98). Hər il Lahıca 8 minədək qonaq gəlir ki, onların da 80-90%-i əcnəbilərdir. İrandan, Rusiyadan, Yaponiyadan, İtaliyadan və İspaniyadan respublikamıza təşrif buyuran qonaqar Lahıcda dincəlmək istəyirlər.

Şəki. Bakının qərbində yerləşən, Qafqazın ən qədim yaşayış məskənlərindən biridir və 2500 il əvvələ aid olduğu deyilir. Şəki İpək Yolu üzərində olduğundan əvvəllər ipək və tekstil məhsulları ilə məşhur idi. Bu ənənənin davamını bu gün görə bilərsiniz. Süslü tikmə, sənətkarlıq məhsulları turistlərin diqqətini çəkir. Şəki şəhərini təkcə tekstil deyil, həm də memarlıq tikililəri vacib edir. Səki Xan Sarayı, 18-ci əsrə aid qalalar, məscidlər və hamamlar görülməyə dəyər. (2).

Daşkəsən rayonu Kiçik Qafqazın şimal-şərqində yerləşdiyi və səthi şimala doğru alçalan dağlarla əhatə olunduğu üçün olduqca mənzərəli, qışda qismən azalan, yaz-yay, payız mövsümlərində aşıb-daşan dağ çayları ilə zəngindir.

Rayona xüsusi gözəllik verən yol boyunca uzanan qalın meşələrdə əsasən fıstıq, vələs, palıd, cökə, söyüd, göyrüş, qozqara (qaraağac), töləkə və görməşov ağacları bitir.

Rayonda müalicəvi bitkilər də geniş yayılıb. Onlardan kəklikotu, gülxətimi, qəfli, sarıçiçək, çobanyastığı, boymadərən, boyxoş, andız, qaraçiyələk, qaraçörək, yarpız, daşyarpızı, dəvədabanı, solmazçiçəyi, yasəmən, çəmən, yolotu (qırxbuğum), cincilim qantəpər, şehdərən, dağ bənövşəsi, bənövşə, nərgiz, lilpar, unnuca, gicitkən, qaymaqçiçəyi və s. müxtəlif xəstəliklərin müalicəsində istifadə edilir. Rayonun gur çeşməli, şəffaf, müalicəvi əhəmiyyətli bulaqları - Yumurtalı bulaq, Narzan bulağı, Turşsu bulağı, Qiblə bulağı, Qayğı bulağı, Böyrək bulağı, İdris bulağı, Seyid bulağı turistlərin ən çox ziyarət etdiyi məkandır (1., s.64).

Astara. İran sərhədinin tam qarşı tərəfindəki şəhərdir. Meşə və dağlarla əhatə olunmuş Astara Azərbaycanın ən gözəl bölgələrindən biridir. Öz kafesi, restoranı və muzeyi var. Muzey yaxınlıqdakı arxeoloji tapıntılara həsr edilmişdir. 2000-dən çox yaşı olduğu iddia edilən insan fiqurları, heyvan heykəlləri, medalyon və daş işi kimi qalıqları görə bilərsiniz. Astara sərhədləri daxilində köhnə məscidlər, bürclər, hamamlar, ziyarətgahlar, dağ kəndləri kimi yerlər də var.

Qeyd etdiyimiz kimi, əsas marşrutlardan başqa Azərbaycan ərazisində əlavə marşrutlar da var ki, bunlardan da məlum səbəblərdən hələlik istənilən səviyyədə istifadə etmək mümkun deyil. Bu sırada Bakı-Naxçıvan marşrutunu xüsusi qeyd etmək lazımdır. Qədim Azərbaycan torpağı olan Naxçıvan təbii bulaqları və gölləri ilə ekoturizmin inkişafı üçün əlverişli imkanlara malikdir. Batabat gölü bu gün turistlərin ən çox diqqətini çəkən yerlərdəndir. Şahbuz şəhəri ərazisində, Naxçıvan şəhərindən 65 km məsafədə, dəniz səviyyəsindən 2445 m hündürlükdə olan bir yer həm də özünün şəfalı suyu ilə tanınır.

Təbiətin gözəl guşələrindən biri olan Batabat yaylağı gül-çiçəkli çəmənlikləri, təbii gölü, sadə və təmiz dağ havası, meşələri, Zorbulaq, Südlübulaq kimi bulaqları və «Narzan» tipli Batabat mineral suları ilə məşhurdur. Batabat yaylağının iqlimi ciyər, ürək, əsəb və s. xəstəliklərin müalicəsi üçün çox münasibdir. Ərazi dərman bitkiləri ilə zəngin olduğundan, həm də təmiz hava hesabına burada gələcəkdə turist bazası və fizioterapiya mərkəzinin yaranması üçün perspektiv var. Batabat yaylağında aparılan tədqiqatlar nəticəsində Mustye mədəniyyətinə, Tunc, İlk Dəmir dövrünə, orta əsrlərə aid abidələr, yaşayış məskənləri, qalalar, ibadətgahlar, qayaüstü rəsmlər, qoç, daş heykəlləri və s. aşkara çıxarılıb (4., s.97).

Daş kitabələr olan qədim Gəmiqaya rəsmləri Naxçıvanda turistləri cəlb edən başqa bir məkandır.

Naxçıvanın Duz dağı da müalicəvi məkan hesab olunur. Burada müasir tipli beşulduzlu hotel tikilib. Duz dağına MDB məkanından, hətta xarici ölkələrdən müalicə olunmaq üçün astma xəstələri gəlirlər.

Bakı .Azərbaycanın paytaxtı Bakı müasir görünüşü ilə sizi qarşılayacaq. Gecə rənglənən Alov Qüllələri şəhərə fərqli bir atmosfer qatır. Bir sənət bölgəsi olaraq Çağdaş İncəsənət Muzeyini nümunə göstərə bilərik. 900-dən çox əsəri ilə müasir mədəniyyətlə maraqlananlara xidmət göstərir. Teze Pazarı da müxtəlif qidaları tapa biləcəyiniz alış-veriş yerlərindən biridir.

İçərişəhər ."İçərişəhər" və "Qala" kimi də tanınan İçərişəhər UNESCO-nun Dünya İrsi Siyahısına daxil edilmişdir. Qorunan binalar arasında köhnə divarlı şəhərin bir hissəsi olan XII əsr Qız Qalası və XIII əsrdə tikilmiş Şirvanşahlar Sarayı yer alır İçərişəhərə yalnız memarlıq binaları üçün deyil, həm də ənənəvi Azərbaycan milli geyimlərini görmək üçün gələ bilərsiniz. Hədiyyə mağazalarında gözəl parçaları da görəcəksiniz.

Abşeron Milli Parkı .783 hektar ərazini əhatə edən Abşeron Milli Parkı vəhşi həyatı yaxından görmək üçün ən yaxşı yerdir. Ceyran, quş, çaqqal və porsuq kimi heyvanları yaxından görmək imkanınız var. Sentyabr ayından sonra gəlməyinizi tövsiyə edirik. (2., s.39).

## Nəticə

Azərbaycan turizmin qədim tarixi ənənələri ilə zəngin olan bir ölkədir. Bu gün Azərbaycan dünya mədəniyyətinin ən gözəl incilərini, tarixi arxeoloji abidələri, arxitektura nümunələrini, müxtəlif dini dünyagörüşləri, milli adət-ənənələri və mədəniyyətləri özündə birləşdirən unikal bir turizm ölkəsidir. İstər təbiəti, istər abidələri, istər mədəni irsi, istər insanları, istərsə də müasir istirahət və əyləncə kompleksləri ilə ölkəmiz qabaqcıl turizm ölkələrindən heç nə ilə geri qalmır.

Dağ və qış turizm növləri Azərbaycanda perspektivli sahələrdəndir. Belə ki, Azərbaycan Respublikasının dağlıq ərazilərində turizmdən istifadə imkanları mövcuddur. Ölkə ərazisində dağ və qış turizminin inkişafı istiqamətində atılmış məqsədyönlü addımlar nəticəsində dağların yamacları turizm məkanı kimi inkişaf etdirilmişdir. Belə ki, bu gün “Şahdağ” Turizm Mərkəzi QSC və “Tufandağ” Qış-Yay Turizm İstirahət Kompleksi kimi istirahət zonaları məşhur istirahət mərkəzlərinə çevrilib. Həmçinin ölkəmiz zəngin flora və faunası ilə böyük ekoturizm potensialına malikdir. Çünki 11 iqlim tipindən 9-unun müşahidə olunduğu Azərbaycan ərazisi 4100-dən çox müxtəlif bitki çeşidinin vətənidir.

## References

1. Asanova I.M., Trofimova R.V., Semukhina E.V. Factors contributing to the development of domestic and foreign tourism in Russia Scientific-methodical electronic journal "Concept" (2015).
2. The flow of tourists to Azerbaijan "Voice" newspaper.
3. State program on tourism development in the Republic of Azerbaijan in 2014-2018
4. International tourism geography. CIS countries and the Baltic / comp. L.M.Gayduk-vich, S.A.Khomich, Ya.I. Anoshko. Minsk: Aversev, 2012.
5. Chen I.J. and Popovich, K. (2003) 'Understanding customer relationship management (CRM): people, process and technology', Business Process Management Journal, Vol. 9, no. 5, pp. 672-688.
6. Clark and others, (1994) The role of loyalty programs in behavioral and affective loyalty, December 2006 Journal of Consumer Marketing 23 (7): 387-396 DOI: 10.1108 / 07363760610712920, Project: Loyalty programs in retail. A efficacy study.

**Rəyçi: prof.R.Həsənov**

Göndərilib: 17.04.2021 Qəbul edilib: 18.04.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/350-353

**Умаров Фарход Талатович**
Самаркандский государственный институт иностранных языков
магистрант
farxodumarov756@gmail.com

# МЕТАФОРА ЦВЕТООБОЗНАЧЕНИЯ В ПОСЛОВИЦАХ И ПОГОВОРКАХ АНГЛИЙСКОГО ЯЗЫКА

***Ключевые слова:*** *сущность метафоры, пословицы и поговорки, метафора цветообозначения, сходства, отличия, аналоги, перевод*

Последнее время происходит столкновение разных культур и интерес к изучению языка в связи с социально-экономическим развитием стран мира и миграции народов. При этом, цветообозначение, также представляет особый интерес при изучении лексического содержания пословиц и поговорок английского языка. Поэтому целесообразно изучать эту тему с точки зрения лингвистики, с помощью структурно-семантичного анализа фразеологизмов с метафорой цветообозначения.

Исследованием метафоры цветообозначения занимались многие учёные, в том числе и лингвисты многих стран (А.П.Василевич, В.В.Виноградов, А.В.Кунин, В.М.Фрумкина, Б.Берлин, П.Кей и другие), но есть и малоизученные стороны в разных языках мира.

Целью данной статьи является изучение пословиц и поговорок английского языка, имеющих метафору цветообозначения, их сходства, отличия, аналоги и переводы на русский язык.

Для достижения этой цели ставятся следующие задачи:

– изучение сущности метафоры, пословиц и поговорок, имеющих метафору цветообозначения в английском языке;

– определение их сходства, отличия, аналогов или переводов на русский язык.

По мнению И.Р.Гальперина, «Отношение предметно-логического значения и значения контекстуального, основанное на сходстве признаков двух понятий, называется метафорой» (2, с. 125).

Н.Ф.Пелевина отмечает, что «Метафора – это изображение предметов, явлений, ситуаций с помощью слов или словосочетаний, обычно указывающих на другие предметы, явления, ситуации. Основанием для переноса обозначения является внешнее или внутреннее сходство явлений. Действительное, обозначаемое метафоры, называют ее предметом (англ. tenor), языковое воплощение метафоры вместе с её значением называют образом метафоры (vehicle)» (6, с. 58).

Метафора цветообозначения встречается в пословицах и поговорках всех народов, и в том числе, в английском языке.

В.П.Аникин пишет, что «Пословица стала крылатой потому, что в ней есть нечто такое, что позволяет многим признать её своей. И именно этот емкий смысл пословиц делает их трудными для изучения» (1, с. 9).

А.В.Кунин отмечает, что «Пословица всегда является предложением. Она преследует дидактическую цель (поучать, предостерегать и т.п.). В отличие от фразеологических единиц других типов, пословицы часто бывают сложными предложениями. В контексте пословица может выступать в качестве самостоятельного предложения или части сложного предложения» (4, с. 176).

«В английской и американской лингвистической литературе также не проводится четкого разграничения между пословицей и поговоркой. Этим объясняется, почему английские словари пословиц включают также обороты явно не пословичного характера» (4, с. 177).

«К поговоркам относится тот тип устойчивых образований, который принято считать поговорками еще со времен В.И.Даля, т.е. в течение свыше ста лет. Расширенное же толкование этого термина в языкознании малоэффективно. Поговорки, также, как и пословицы, являются предложениями» (4, с. 177).

В.П.Аникин в книге «Русские пословицы, поговорки, загадки и детский фольклор» дает «отличие поговорки от пословицы сам народ видит в том, что поговорка – это украшение речи – цветок, тогда как пословица – суждение полное, завершенное, зрелое – ягодка: Поговорка цветок, пословица ягодка. Это поэтическое сравнение говорит о том, что народ видел близость пословиц и поговорок» (1, с. 15).

Для пословицы и поговорки характерна устойчивость лексемного состава и неизменяемость порядка лексем, связанная с синтаксической обусловленностью и широким использованием выразительных средств.

Самым известным собирателем русских пословиц и поговорок можно считать В.И.Даля. В собрании Даля более 30 тысяч пословиц, он выделил для своих пословиц 179 тематических рубрик.

Известным собирателем английских пословиц был учёный - биолог Джон Рэй. Проблемам изучения английских пословиц и поговорок также посвящены работы английских и американских лингвистов.

Происхождение английских пословиц и поговорок с метафорой цветообозначения:

1.**Пословицы, пришедшие из жизни.** Они основаны на народной мудрости. Это пример устного народного творчества.

Например: True blue will never stain. - (Настоящий голубой цвет никогда не запятнаешь. Благородство всегда остается благородством). Придорожная пыль небо не коптит.

**2.Пословицы, пришедшие из Библии и священного писания.**

Например: The devil is not so black as he is painted. - Не так страшен чёрт, как его малюют

**3.Заимствованные пословицы и поговорки.**

Например, Speech is silver but silence is gold. - Слово – серебро, молчание – золото. Эта пословица заимствована из немецкого языка.

Значение пословицы и поговорки с метафорой цветообозначения может быть как полностью, так и частично переосмысленным. Есть и пословицы с двумя метафорическими компонентами:

например, Speech is silver but silence is gold - С*лово – серебро, молчание – золото*.

Наряду с пословицами с константной зависимостью компонентов существуют, имеющие варианты.

Например, лексические варианты: Every cloud has a silver lining - *Нет худа без добра;*

Как показывают эти примеры, в пословицах возможна замена различных знаменательных слов знаменательными же, относящимися к одной и той же части речи, а также в редких случаях знаменательных незнаменательными.

Лексико-грамматические варианты:

Например: It is a small flock that has not a black sheep (= There is a black sheep in every flock) - В *семье не без урода*.

По мнению А.В.Кунина, «приведенные группы исчерпывают все основные типы вариантов английских пословиц, причем лексические варианты являются наиболее распространенными» (4, с. 182).

Также, английские пословицы имеющие метафоры цветообозначения разнообразны по своему содержанию и охватывают все стороны жизни английского народа. Надо сказать, что тематика пословиц буквально безгранична. Изучая пословицы и поговорки с метафорой цветообозначения мы выбрали более 20 значимых и интересных, и разделили их по значению семи тем для анализа, перевода:

**1.Человек и его нравственные качества**

All are not merry that dance lightly. - (Не всяк весел, кто резво пляшет. Не всяк весел, кто поет). Больше те люди шутят, у которых сердце ноет.

Every bean has its black. – (Нет людей без недостатков; у всего есть оборотная сторона). И на солнце есть пятна.

Speech is silver but silence is gold. – Слово – серебро, молчание – золото.

**2.Человек, его дом и семья**

That's a horse of another colour. – (Это лошадь другой масти). Это совсем другое дело. Вот это уже из другой оперы.

Every dark cloud has a silver lining. – (Всякое темное облако серебром оторочено). Нет худа без добра.

Every white has its black, and every sweet its sour. – (У всякого белого есть свое черное, а у всякого сладкого – своя горечь). Нет сладкого без горького. Нет розы без шипов.

No man loves his fetters, be they made of gold. – (Больной и золотой кровати не рад). Оковы никто не любит, будь они хоть из золота. Золотая клетка соловью не потеха.

**3.Труд и мастерство**

Many hands make light work. – (Когда рук много, работа спорится). Берись дружно, не будет грузно. Дружно – не грузно, а врозь – хоть брось.

To come off with flying colours. - Покинуть (поле боя) победоносно, с честью развевающимися знаменами. (Т.е. Добиться решительной победы или успеха).

**4.Пороки и отрицательные качества**

The darkest hour is that before the dawn. – (Самое темное время суток – перед рассветом). Т.е. Самое плохое подчас оказывается прелюдией к улучшению.

The darkest place is under the candlestick. – (Самое темное место – под свечкой). Умен, умен, а у себя под носом не видит. За семь верст комара искали, а комар на носу.

The devil is not so black as he is painted. - Не так страшен чёрт, как его малюют.

The pot calls the kettle black. – (Горшок называет котелок черным (хотя сам не белее). Горшок над котлом смеется, а оба черны). Не смейся горох, не лучше бобов. Не смейся квас, не лучше нас. Чья бы корова мычала, а твоя бы молчала.

To make (to turn) the air blue. Ругаться на чем свет стоит.

Two blacks do not make a white. - Чужим грехом своего не искупишь. Отплата злом за зло добра не делает. Злом зла не поправишь.

You cannot wash charcoal white. – (Уголь добела не отмоешь. Черного кобеля не отмоешь добела). Дурака учить - в решете воду носить. Черную душу и мылом не отмоешь. Горбатого могила исправит.

**5.Пословица о друзьях и дружбе**

A hedge between keeps friendship green. – (Когда между друзьями изгородь, то и дружба дольше). Соблюдение границ в отношениях способствует продолжительной дружбе.

**6.О богатстве, о деньгах**

A heavy purse makes a light heart. – (От туго набитого кошелька на сердце легко). Есть чем звякнуть, так можно и крякнуть.

A light purse is a heavy curse. – (Легкий кошелек – тяжелое проклятие). Хуже всех бед, когда денег нет.

A light purse makes a heavy heart. – (Когда кошелек легок — на душе тяжело). Хлеба ни куска, так и в горле тоска

To angle with a silver hook. – (Смысл: действовать подкупом. Удить серебряным (золотым) крючком. Золотой молоток и железные ворота прокует). Деньги все двери открывают.

To be born with a silver spoon in one's mouth. – (Родиться с серебряной ложкой во рту). Родиться в рубашке (сорочке).

Таким образом, можно сказать, что в английских пословицах и поговорках с метафорой цветообозначения обобщен, сконцентрирован жизненный опыт народа, система ценностных ориентаций и предпочтений, важные свойства национального характера, менталитета. Они учат бережливости, трудолюбию, многие из них содержат положительную оценку.

Как видно из приведённых английских пословиц многие из них полностью совпадают с русскими. Это говорит о том, что английские пословицы и поговорки метафорой цветообозначения интернациональны. Отличие состоит в том, что в этих странах разные культурно-исторические и бытовые особенности.

Если сравнить перевод английских пословиц и поговорок с метафорой цветообозначения с русскими, мы увидим, что многие из них они совпадают по смыслу и по содержанию. Они такие же краткие по форме и благозвучные, как и русские пословицы.

При переводе английских пословиц и поговорок с метафорой цветообозначения надо, во-первых, учитывать особенности того или иного языка, во-вторых, переводить адекватно, т.е. сохраняя смысл и форму, что есть очень трудно, а иногда невозможно.

В ходе изучения, анализа и перевода мы выяснили, что большинство английских пословиц и поговорок с метафорой цветообозначения имеют русский эквивалент. Смысл не меняется. Таких русских эквивалентов можно подобрать не один, а несколько, где может быть изменено только одно или несколько слов.

Таким образом, при отборе русских соответствий английским пословицам и поговоркам с метафорой цветообозначения обязательным является совпадение одного из главного значений. Важно помнить, что они складывались в разных исторических условиях, и для выражения одной и той же мысли часто использовали разные образы, которые отражают различный социальный уклад и быт двух народов и часто не являются эквивалентами.

В ходе исследования изучая английские пословицы и поговорки с метафорой цветообозначения мы пришли к следующим выводам:

1. Английские пословицы и поговорки с метафорой цветообозначения, как и русские, многозначны. Через конкретные образы подразумеваются различные ситуации.

2. Они не сочинялись кем-то намеренно, а возникали естественным путем, в результате наблюдений за семейной, общественной жизнью, трудом и бытом нации, в целом из жизненного опыта

3. У наших народов одни и те же нравственные ценности. Восхваляются ум, честность, труд, мастерство; осуждаются лень, упрямство, глупость, тупость и другие отрицательные качества человека.

4. Народная мудрость ярко проявляется в пословицах и поговорках, поэтому изучение пословиц и поговорок с метафорой цветообозначения английского языка способствует не только знанию языка, но и лучшему пониманию образа жизни, мысли и характера народа.

5. Пословицы и поговорки разных народов выражают суждения, свойственные всем народам, но у каждого народа они выражаются по-своему, с учетом этнических особенностей, обычаев, и исторического прошлого. Общими для всех народов оказываются идеи добра, роль труда и знаний, уважение к хорошим человеческим качествам: честности, трудолюбию, скромности, осуждение злобы и жадности, глупости и лени.

6. Пословицы и поговорки английского языка с метафорой цветообозначения довольно-таки трудны для перевода на русский язык, поэтому главной задачей остаётся понять содержание пословиц и поговорок, прежде чем подобрать адекватный способ их перевода.

В заключение хотим сказать, в ходе изучение метафоры цветообозначения в английском языке важное место занимает душа английского народа, а также философия, отражающи их жизнь в сквозь английские пословицы и поговорки. Так как, пословицы и поговорки с метафорой цветообозначения украшают нашу речь, делают её яркой и эмоциональной, целесообразно их изучать в разных языках мира.

## References

1. Anikin V.P. Russian proverbs, sayings, riddles and children's folklore. Moscow: Enlightenment Publishing House, 1957.- 240 p.
2. Halperin I.R. Essays on the stylistics of the English language. Moscow: Publishing House of Literature in Foreign Languages, 1958, 460 p.
3. Dal V.I. Proverbs of the Russian people. Collection in two volumes. Moscow: Fiction, 1989.
4. Kunin A.V. Course of phraseology of modern English: Textbook. for universities and foreign language faculties, 2nd updated edition, M, Higher education Dubna, Phoenix Publishing Center, 1996, 381 p.
5. Kunin A.V. English-Russian phraseological dictionary. Moscow: Russian Language Publishing House, 1984, 944 p.
6. Polevina N.F. Stylistic analysis of the artistic text. Textbook. L: Enlightenment, 1980, 272 p.
7. Kuzmin S.S., N.L. Shadrin N.L. Russian-English dictionary of proverbs and sayings. Moscow: Russian Language, 1989.
8. Stefanovich G.A. English in proverbs and sayings. Moscow: Enlightenment, 1987.
9. Stefanovich G.A., Shvydkaya L.I. English in proverbs and sayings. M: Enlightenment, 2008.
10. http://www.lexico.ru/list/english-proverb/

Göndərilib: 17.05.2021 Qəbul edilib: 18.05.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/65/354-357

**Zivər Etibar qızı Aslanlı**
Azərbaycan Turizm və Menecment Universiteti
magistrant
zivaraslanli@gmail.com

# İNTERNET ASILILIĞININ FORMA VƏ NÖVLƏRİ, MEYDANA GƏLMƏ SƏBƏBLƏRİ

***Açar sözlər:*** *internet, internet asılılığı, asılılıq, internet asılılığının səbəbləri, internet asılılığının formaları*

## Forms and types of internet addiction, causes of occurrence

**Summary**

Although the rapid development of technology and the Internet has made our lives easier in many ways, it has brought with it a number of problems. One of them is internet addiction, which is a type of behavioral addiction. This type of addiction, especially among young people, has become so dangerous that it is now considered one of the most pressing problems in the world. Internet addiction is not included in the Diagnostic and Statistical Handbook of Mental Disorders, called DSM-IV, published by the American Psychiatric Association in 1994. It was assessed within the substance dependence. Internet-related behavioral disorders are called Internet addiction, pathological Internet use, and Internet addiction. Researchers consider this dependence to be a pulse-control disease. Problems with Internet use were first highlighted in 1999 by Goldberg as an Internet use disorder. Griffiths described this dependence as a subgroup of behavioral dependencies.

***Key words:*** *internet, internet addiction, addiction, causes of internet addiction, forms of internet addiction*

## Giriş

Texnologiya və internetin sürətli inkişafı həyatımızı bir çox mənada asanlaşdırsa da özü ilə bərabər bir sıra problemlər də gətirdi. Bunlardan biri də davranış asılılığının bir növü olan internet asılılığıdır. Xüsusilə gənclərin əziyyət çəkdiyi bu asılılıq növü o qədər təhlükəli vəziyyətə gəlib çıxıb ki, hazırda dünyanın ən aktual problemlərindən hesab olunur. 1994-cü ildə Amerika Psixiatriya Birliyi tərəfindən nəşr olunan DSM-IV adlandırılan Zehni Pozğunluqların Diaqnostik və Statistik Əl Kitabına internet asılılığı xəstəlik olaraq daxil edilməyib. O, maddə asılılığının daxilində qiymətləndirilib. İnternetlə əlaqəli davranış pozğunluqları internet asılılığı, internetin patoloji istifadəsi və internet alüdəçiliyi adlanır. Tədqiqatçılar bu asılılığı impuls-nəzarət xəstəliyi kimi qəbul edirlər. İnternet istifadəsi ilə əlaqəli problemlər ilk dəfə 1999-cu ildə Goldberq tərəfindən internet istifadəsi pozğunluğu adı altında vurğulandı. Griffiths isə bu asılılığı davranış asılılıqlarının alt qrupu olaraq dəyərləndirdi.

İnternet asılılığı dedikdə internetdən istifadə etmək istəyini dayandıra bilməmək, internet istifadəsi zamanı zaman anlayışını itirmək, real həyatdan uzaqlaşaraq özünə virtual bir dünya yaratmaq, internetdən uzaq olan zaman aqresiya və narahatlıq hiss etmək başa düşülür. Ağıllı telefonlar vasitəsilə internetdən asılılıq "nomofobiya", yəni telefonsuz qalma qorxusuna gətirib çıxarır. Onlar internetə girişi kompyuterlərlə müqayisədə daha rahat və əlçatan edir. İnsanlara harada olmasından asılı olmayaraq internetə çıxış imkanı yaradır. Bu da bir çox insanın yemək yeyərkən, tualetdən istifadə edərkən, hətta vanna qəbul edərkən belə internetdən ayrılmamalarına səbəb olur. Gənclərin internet asılılığına həmyaşıd münasibətləri, sosial, iqtisadi, mədəni və psixoloji amillər təsir göstərə bilir. İnternet asılılığının yaş bölgüsünə diqqətlə baxdıqda aydın görmək olur ki, 2000 və sonrakı illərdə doğulmuş şəxsləri əhatə edir.

İnternet asılılığında ilk internetdən istifadə yaşı, ilk mobil telefonun alındığı yaş, internetdə keçirilən vaxtın müddəti və tezliyi, internetdən istifadənin məqsədləri (təhsil, oyun, məlumat axtarışı, sosial şəbəkə istifadəsi, alış-veriş, film izləmək, musiqi dinləmək, ünsiyyət qurmaq və s.), internet istifadəsinin əhval-ruhiyyəyə təsiri risk faktorlarında vacib məqamlardandır. Ümumiyyətlə, psixoloqlar mobil telefon, kompyuter, hətta televizor da daxil olmaqla gündə 2 saatdan artıq ekran vaxtını tövsiyyə etmirlər. Bir çox insan interneti iş və təhsil həyatının normal bir hissəsi kimi istifadə etdiyindən internetdən artıq istifadəni kompyuter qarşısında keçirilən vaxtla aydınlaşdırmaq çətindir. Çünki bəzi insanların işi internet vasitəsi ilə aparılır, tələbələr təhsillərini xüsusilə pandemiya dövründə internet vasitəsi ilə alır. İnternet insanlara olmaq istədikləri insan olmaq imkanı təqdim etdiyindən insanla həqiqi sosial mühit arasında boşluq yaradır. Bunda çox vaxt valideynlər günahkar olurlar. Onlar erkən yaşlardan uşaqlarının nadinclik etməməsi üçün əllərinə planşet və ya mobil cihazlar verir, uşaqlarda vaxtlarını internetdə keçirmək vərdişi yaradırlar. Bu da gələcəkdə internet asılılığına münbit zəmin yaradır. Ümumiyyətlə, internetdən istifadəni 3 yerə bölmək olar :

- Sağlam formada internetdən istifadə;
- Riskli formada internetdən istifadə ;
- Patoloji internet istifadəsi, yəni internet asılılığı.

İnternetdən sağlam istifadə dedikdə təxminən gündə 2-3 saat internet istifadəsi başa düşülür. Sağlam istifadədə fərdlər internetin göstərdiyi bütün pozitiv xidmətlərdən yararlanır, ondan yalnız həyatını asanlaşdırmaq üçün istifadə edir. Riskli formada internetdən istifadə asılılığa gedən yoldur. Belə insanlar internetdən riskli zaman çərçivəsində istifadə edirlər və virtual dünyaya bağlıdırlar. Lakin hələ də öz üzərlərindəki nəzarətlərini tam itirməyiblər. Lazım gəldikdə internetdən istifadəni dayandırmağı bacarırlar. Patoloji internet istifadəsi isə artıq asılılıq halıdır. Alüdəçi şəxs özünə qarşı nəzarəti tamamilə itirir. Virtual dünyanı real həyatdan daha üstün tutmağa başlayır. İnternetə istifadədə iradəsizlik göstərir.

Xorvatiya, Finlandiya və Polşadakı 1078 gənc arasında keçirilən tədqiqata nəzər salaq. Onlardan 534 oğlan və 525 qız təsadüfi seçmə metodu vasitəsi ilə seçilib. Bu tədqiqatda yeniyetmələr anonim bir anket dolduraraq yaşı, cinsi, ölkəsi və internetdən istifadə səbəbi barədə suallara cavab verdi. Toplanan məlumatlar tədqiqatçılar tərəfindən analiz edildi. Nəticəyə əsasən respondentlərin 905 nəfəri, yəni 84 faizi internetdən əyləncə məqsədilə istifadə edir. Oğlanlara nisbətdə qızlar daha çox interneti müsbət sferada, yeni iş və ya dərs üçün istifadə edir. İş və dərs üçün internetdən ən çox Polşa gəncləri (296 nəfərdən 71-i), daha sonra Xorvatiya gənləri (486 nəfərdən 78-i), ən sonda isə Finlandiya gəncləri (296 nəfərdən 24-ü) istifadə edir. Bu araşdırmaya görə ən çox internet asılılığı riski 15-16 yaş arasında, ən az asılılıq riski isə 11-12 yaş aralığında olanlardadır. 17 yaşından yuxarı gənclər (237 nəfərdən 91-i) isə interneti daha çox dərs və iş üçün istifadə edirlər. Burdan o nəticəyə gəlirik ki, internet asılılığı ilə yaş qrupu arasında müsbət əlaqə mövcuddur. (2)

Səhiyyə İnstituna görə internet asılılığının ən böyük səbəbi beynin mükafatlandırıcı təbiətidir. Bəs beynin mükafat mərkəzi nədir ? Necə olur ki, ən sevdiyimiz yeməyi doyduqdan sonra belə yemək istəyirik ? Necə olur ki, internetdən istifadəni və ya digər asılılıqları dayandırmaq istəsək belə özümüzə nəzarət edə bilmirik ? Çünki beynimizin mükafat mexanizmi qeyri-iradi formada fəaliyyət göstərir. Asılılıqdan xilas olmaq üçün beynimizin bu mexanizminin necə işlədiyini anlamaq vacibdir. Bu mərkəz zövq və motivasiya sisteminin əsası hesab olunur. Beynimizdəki mükafat mərkəzi mozalimbik yolun bir hissəsidir. Ona dopamin yolu da deyilir. Dopamin dedikdə insan bədənində təbii yollarla meydana gələn və bədəndəki siqnalları beyinə ötürən maddə nəzərdə tutulur. O, hormon tənzimlənməsində mühim rol oynayır. Dopamin vasitəsi ilə ötürülən siqnallar insanların yaşamaq, yemək, çoxalmaq kimi fəaliyyətlərində zövq almasını təmin edir. Bu yol beynin yaddaş davranışlarını idarə edən bölgə ilə sıx bağlıdır ki, bu da sizə zövq verən fəaliyyətləri unutmamağınız və təkrarlamağınız üçün şərait yaradır. Normal zamanlarda beyin sabit səviyyədə dopamin istehsal edir və dopamin reseptorlarının sadecə bir qismi fəaliyyətdə olur. Asılılıq yaradan maddələr və davranışlar dopamin istehsalını artırır, lakin bu hal uzun müddət davam etdikdə neyronlar zədələnir və dopamin istehsalı azalmağa başlayır. Bu da alüdəçi şəxsləri nəinki yaxşı, hətta normal hiss etmək üçün belə asılı olduqları hərəkətləri artırmağa məcbur edir. Həyat üçün çox vacib olan bu proses həm də asılılıqların yaranmasının ən böyük səbəbkarıdır. İnsanların yanlış olduğunu bilə-bilə bir hərəkəti davamlı olaraq təkrarlamasının səbəbi bu zövq hissi qarşısındakı iradəsizlik və nəzarətsizlikdir. Xüsusilə depresiya, sosial problemlər, maddi çətinliklər və başqa neqativ hisslər zamanı müalicə olunmuş asılılıqlar belə təkrarlana bilir, çünki beyin özünü yaşamağa motivasiya etmək üçün çıxış yolunu bu cür tapır. Hər hansısa bir insan internetdən normal dərəcədə istifadə edə bilər, lakin sonradan narahatlıq, depressiya, məmnunsuzluq kimi xoşagəlməz hisslər onda asılılıq yaranmasına səbəb ola bilər.

Asılılıq bir beyin xəstəliyi kimi qəbul edilir, çünki maddələr və davranışlar beyinin quruluşunu və işini dəyişdirir. Məhz bu dəyişikliklərin uzunmüddətli olması asılılığa gətirib çıxaran əsas amildir. Beyinin mükafata olan ehtiyacı davranışlara, davranışlar da yenidən beyinə təsir göstərir. Araşdırmalar maddə asılılıqları kimi davranış asılılıqlarının da beynin mükafat mərkəzinə təsirini sübüt edib. Asılılıq yaradan davranışlar beyindəki dopamin ifrazı ilə birbaşa əlaqəlidir. (3)

Tədqiqatçılar virtual həyata bu dərəcədə asılılığın səbəbini real həyatın neqativ tərəflərində görürlər. Bu səbəbdən internet asılılığını anlamaq üçün asılılığın yaranmasına səbəb olan amilləri anlamaq vacibdir. Məsələn, real tanışları ilə problem yaşayan insanlar internetdən yeni insanlar tanımaq məqsədi ilə istifadə edirlər. Gündəlik fəaliyyəti maraqsız və cansıxıcı olan insanlar online oyunlar vasitəsi ilə həyatlarına maraq qatmağa çalışır. Fiziki görünüşünü bəyənməyən şəxslər başqa birinin görünüşündən istifadə edərək virtual həyatda mövcud ola bilir. Tənhalıqdan əziyyət çəkən və ya sosiallaşmağa vaxt tapmayan şəxslər üçün internet ən ideal ünsiyyət vasitəsidir. Real həyatda məhdud azadlığa sahib olan şəxslər internetdə tam azad ola bilirlər. Əgər tez-tez internetdən istifadə edirsinizsə, Youtubedə videolara baxmağı, sosial şəbəkələrdə paylaşım etməyi sevirsinizsə, ənənəvi alış-veriş yerinə online alış-verişə üstünlük verirsinizsə bu hələ internetdən asılı olduğunuz mənasına gəlmir. Sözsüz ki, internetin avantajlarından faydalanmaq müasir

cəmiyyətdə hər bir fərd üçün normal hesab olunur. İnternetdən asılı olma halı internetdən istifadədə nəzarəti itirmək və dayandırmaq istədi.kdə belə istifadənin qarşısını ala bilməməkdir.

Əslində internetin özü asılılıq yaratmır, lakin təklif etdiyi xidmətlər asılılıq yaradacaq qədər cazibədardır. Fikrimcə virtual qumar asılılığı və online alış-veriş asılılığı davranış asılılıqlarının digər növlərinin internet üzərindən həyata keçirilməsidir. Ümumilikdə internet asılılığını isə üç əsas növə bölmək olar:

1. Sosial şəbəkələrə qarşı yaranan asılılıq;
2. Online oyunlara qarşı yaranan asılılıq;
3. Məlumat və məzmun asılılığı

Sosial şəbəkələrdən bu gün ən populyar ünsiyyət vasitəsi kimi istifadə olunur. İnsanlar gündəlik həyatlarında eyni mühitdə ola bilmədikləri insanlarla sosial media mühitində birlikdə ola bilirlər. Araşdırmalar göstərir ki, gənclərin internetdə ən çox istifadə etdiyi xidmətlərdən biri məhz sosial şəbəkələrdir. Onlar yalnız internet vasitəsi ilə işləyən tətbiqlər olduqlarından internetdən müstəqil var ola bilməzlər. Sosial şəbəkələr haqqında bir çox ədəbiyyatlarda müxtəlif təriflər mövcuddur. Onları ümumiləşdirsək deyə bilərik ki, sosial şəbəkələr insanlar arasında qarşılıqlı əlaqələr yaradan, hər kəsə öz şəxsi profilini və ünsiyyət qurmaq istədiyi dostlarının siyahısını yaratmağa imkan verən, maraq göstərdiyin məzmunların qarşına çıxmasını dəstəkləyən alqoritmlər toplusudur. O, həm də başqalarının fəaliyyətini müşahidə etməyə və şərh bildirməyə şərait yaradır.

Online oyun asılılığı gənclərin internet asılılığının ən geniş yayılmış növlərindəndir. Bu gün hara baxsaq ətrafda başını mobil telefondan qaldıra bilməyən insanlarla rastlaşırıq. Texnologiyanın inkişafının həyatımızda dəyişdirdiyi şeylərdən biri də oyun oynamaq vərdişlərimizdir. Amerika Tibb Assosiasiyasının hesablamalarına görə gənclərin 90 faizi internetdə rəqəmsal oyun oynayır və onlardan 15 faizi bu oyunlara alüdədir. Bu gün dünyada oyun bazarının böyüklüyünün 110 milyard dollar olduğu təxmin edilir. Online oyun asılılığı dedikdə kompyuter, oyun konsunlları, mobil cihazlar kimi texnologiyalarla internet vasitəsilə oynanılan oyunlara həddindən artıq vaxt sərf etmək və oynamaq istəyini dayandıra bilməmək başa düşülür. Kompyuter oyunlarının ortaya çıxması 1950-ci illərdə kompyuterlərin ilkin istifadəsi ilə bağlıdır. Daha sonra oyun konsulları vasitəsi ilə populyarlaşan bu oyunlar internetin yaranması və sürətlə yayılması ilə geniş vüsət aldı. Bu asılılıq hər yaşdan insanlar arasında mövcud olsa da xüsusilə gənclərin bütün həyatını işğal etməyə başlayıb. Rəqəmsal oyunların gənclərə təklif etdiyi cazibədar mühit, yaradılan təxəyyül məhsulu əyləncəli dünya, real həyatda edə bilmədiyi hərəkətləri etmə və seçə bilmədiyi hər şeyi seçmə imkanı onlara oyunların möcüzəli dünyasına alüdə olmaqları üçün təkan verir. Əslində, sağlam həyata sahib olan gənclərin bu tip oyunları oynamasının müsbət məqamları mövcuddur. Çünki bu tip oyunlar onların emosional cəhətdən rahatlamalarını təmin edir və zehni bacarıqlarını inkişaf etdirir. Lakin sosial bacarıqları, iradəsi və psixologiyası zəif olan gənclərdə bu rəqəmsal dünyaya asılılıq yaranır, onu real dünyadan üstün tutma halları müşahidə olunur.

İnternet asılılığının növlərindən biri də məzmun asılılığıdır. Bu asılılığa məlumat asılılığı da demək olar. Belə şəxslər yeni məlumat əldə etməyə qarşı qarşısını ala bilmədikləri bir ehtiyac hiss edirlər. Bütün günlərini internetdə müxtəlif saytlarda gəzərək keçirir və həddindən artıq məlumat yüklənməsinə məruz qalırlar. Bu da beynin məhsuldarlığını itirməsinə səbəb olur. Əgər saatlarla Youtube-də videolar izləyirsinizsə, sosial şəbəkələrdə kim, harada, nə edib bilmək istəyirsinizsə, hər an gündəmdə nəyisə qaçirmaqdan qorxursunuzsa deməli, sizdə məzmun asılılığı ya var, ya da olma riski yüksəkdir. İnternet elə bir məcradır ki, daim məzmun istehsal edir və heç kim ondan kənarda qalmaq istəmir. Nəticədə biz də hər gün onlarla, bəlkə də yüzlərlə məzmun istehlak edirik. Bu istehlakı dayandırdığımız zaman telefonumuza gələn bildirişlər bizi yenidən internetə bağlanmağa vadar edir. Özümüzü həddindən artıq lazımlı, lazımsız hər cür məlumatla yükləməyimiz diqqətimizi doydurur, enerjimizi və vaxtımızı xərcləyir. Bu da real həyatda verimli fəaliyyət göstərməyimiz qarçısındakı ən böyük maneədir. Məzmun alüdəçiliyi internet asılılığının elə bir növüdür ki, alüdə olan insanlar həyat axarkən sadecə izləməklə kifayətlənirlər.

Gənclərdə internet asılılığının yaranmasında ailə münasibətləri və həmyaşıd münasibətləri mühim əhəmiyyət kəsb edir. İnsanlar sosial varlıqlar olduqları üçün ətraflarındakı insanlarla, xüsusilə də ailə və həmyaşıdları ilə daim qarşılıqlı əlaqədə olurlar. Həssas demoqrafik qrup hesab olunan gənclərin bu münasibətlərdən daha çox təsirləndiyini demək olar. Ailə münasibətləri onların sosial həyatlarını təmin etməkdə aparıcı rol oynayır. Valideynlərin övladlarına münasibəti onların cəmiyyətə uyğunlaşma qabiliyyətini müəyyənləşdirir. Ailədəki çatışmazlıq, gərginliyin olması, ailənin intizam metodları, boşanma hallarının baş verməsi, sosial və mənəvi dəstəyin olmaması, valideynlərin tərbiyə tərzi və davranış nümunələri, ailədaxili şiddətin varlığı, ailə fərdləri arsındakı soyuqluq və sevgisizlik hər növ asılılıq üçün ideal bir mühit yaradan faktordur. Ailə münasibətləri möhkəm olmaması gənclərin özünə inamına və həyata qarşı münasibətinə kəskin mənfi təsir göstərir.

Valideyn nəzarəti də asılılıq mövzusunda önəmli mövqedədir. Mənsub olduqları həssas demoqrafik qrup səbəbiylə gənclər valideyn nəzarəti olmadıqda deviant davranışlara meyilli ola bilirlər. Lakin bu nəzarət qayğı, sevgi və anlayışla əhatə olunmalıdır. Əks təqdirdə bu nəzarət effektivliyini itirər və münaqişələrə səbəb olaraq vəziyyəti daha da pisləşdirə bilər. Gənclik həyatın ən vacib dönüş nöqtələrindən biridir. İnternet belə gənclərə reallıqda bacarmadıqları ünsiyyət fəaliyyətini həyata keçirmək üçün geniş imkan və əlverişli zəmin yaradır. Onlara öz arzu etdikləri formada mövcud olmaq şansı verir. Özü haqda verdiyi məlumatın doğruluğunu qarşısındakının yoxlaya bilməməsi bu asılılıqda daha da təkanverici rol oynayır. Real həyatda düşüncələrini dilə gətirməkdən çəkinən, utancaq xarakterə sahib, özünə inamı aşağı olan və cəmiyyətin qınağından qorxan gənclər özlərini ifadə etmək üçün internetin möcüzəli, azad və rahat dünyasına üstünlük verirlər.

## Nəticə

Qeyd edildiyi kimi sosial bacarıqları zəif formalaşmış gənclər virtual dünyaya və internet asılılığına daha çox meyilli olurlar. Belə gənclər dostlarını da öz xüsusiyyətlərinə bənzər keyfiyyətlərə görə seçdikləri üçün hətta dostluqları belə virtual dünyada qurmağa üstünlük verirlər. Digər internet alüdəçilərində özlərinə bir oxşarlıq və doğmalıq tapırlar. Bu oxşarlıq zərərli nəticələrə, həmin gənclərin virtual dünyaya daha çox bağlanmasına və özlərini real dünyadan tamamilə təcrid etməsinə səbəb olur.

Bütün bunları birləşdirsək deyə bilərik ki, gənclərin internet asılılığının əsas səbəbi ailə, həmyaşıd münasibətləri, sosial bacarıqsızlıq və başqa faktorlar nəticəsində real həyatdan soyumaq və buradakı problemlərindən qaçmaq məqsədi ilə virtual dünyaya sığınmaqdır. İnternetin möcüzəli dünyası gəncləri real həyatdan daha çox xoşbəxt edirsə internet asılılığının yaranması qaçınılmazdır.

## References

1. Aliguluyev R.M., Mahmudov R.Sh., Problems of information dependence and ways to combat them, Express-information, Information Society series, Baku "Information Technologies" publishing house, 2009
2. Silvana Karacic, Journal of Public Health, Cesta domovincke zahvalnosti 1, Arbanija 21224
3. https://www.addictioncenter.com/addiction/how-addiction-affects-the-family/
4.https://books.google.az/books?hl=en&lr=&id=CD5FBAAAQBAJ&oi=fnd&pg=PP1&dq=internet+addiction+facts&ots=SKFh0GMImx&sig=UxPhd7GsaYzG1tAAHPdtks
5. https://www.webology.org/abstract.php?id=277
6. https://www.ingentaconnect.com/content/ben/cpd/2014/00000020/00000025/art00006

**Rəyçi : prof.M.İlyasov**

Göndərilib: 17.04.2021 Qəbul edilib: 18.04.2021

